
İMAM HƏSƏN (Ə) VƏ İMAM
HÜSEYNİN (Ə) BAŞINA NƏLƏR
GƏLDİ
SEYYİD MƏHƏMMƏDHƏSƏN
MUSƏVİ KAŞANİ

# İMAM HƏSƏN (Ə) VƏ İMAM HÜSEYNİN (Ə) BAŞINA NƏLƏR GƏLDİ

:Müəllif

SEYYİD MƏHƏMMƏDHƏSƏN MUSƏVİ KAŞANİ

:Çap nəşriyyat

Şəhriyar

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

# İMAM HƏSƏN (Ə) VƏ İMAM HÜSEYNİN (Ə) BAŞINA NƏLƏR GƏLDİ

## KİTAB HAQQINDA


Kitabın adı:İMAM HƏSƏN (Ə) VƏ İMAM HÜSEYNİN (Ə) BAŞINA NƏLƏR GƏLDİ

Müəllif: SEYYİD MƏHƏMMƏDHƏSƏN MUSƏVİ KAŞANİ

:Naşir

:Çap tarixi

Səhifələrin sayı:۲۶۱

Çap növbəsi:Birinci

Tirajı:۳۰۰۰


səh:۱

## GİRİŞ

İslam dünyasının bugünkü acınacaqlı vəziyyəti həmişə bizi narahat etmişdir. Hər bir müsəlmanın ürəyini ağrıdan, müsəlmanların bu böhranlı vəziyyətə düşməsinin amillərini tapmaq bizi vadar edir ki, onların həqiqi səbəblərini araşdıraq. Müsəlmanlar üçün bu vəziyyətin meydana gəlməsinin uzun tarixi kökləri vardır. Uzun və genişmiqyaslı tədqiqatlar bu vəziyyətin araşdırılmasında bizə kömək edə, müsəlmanların daha parlaq və gözəl gələcəyə doğru irəliləyişləri üçün yol göstərə bilər. Bu səbəblərin araşdırılmasından aydın olur ki, müsəlmanlar rəhbərlik məsələsi barəsində inhirafa yuvarlandıqları vaxtdan etibarən belə bir təəssüfləndirici, böhranlı vəziyyətə düçar olmuşlar. Biz sözügedən məsələni şiə nöqteyi-nəzərindən təhlil edirik. İslam tarixindən məlum olur ki, rəhbərlik məsələsində ilk inhiraf Həzrət Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in vəfatından sonra yaranmışdır. Biz bu məsələni Əli (əleyhis-salam)-ın başına nələr gəldi kitabında araşdırmışıq. İndi isə İslam tarixinin o Həzrətin şəhadətə çatmasından sonra, yəni İmam Həsən və İmam Hüseyn (əleyhiməs-salam)-ın həyatı dövrünə təsadüf edən ۴۰-۶۰-cı hicri illər dövründə araşdırırıq. İndi isə əziz oxuculara müqdə verə bilərik ki, böyük Allahın köməyi ilə bu araşdırma və təhqiqat İmam Həsən Əsgəri (əleyhis-salam)-ın dövranına qədər, sonra iisə İmam Zaman (əleyhis-salam)-ın qeybət zamanından müasir dövrə qədər davam .edəcəkdir

QUM, SEYYİD MƏHƏMMƏDHƏSƏN MUSƏVİ KAŞANİ

## Cİ HİSSƏ–۱

### İMAMLARIN DƏRƏCƏ VƏ MƏQAMLARI

Məsum imamların həyat tarixlərini araşdırarkən, hər şeydən əvvəl, onların yüksək məqamlarına diqqət yetirmək, Allah yanındakı dərəcələrini dərk etmək lazımdır. Bu tanışlıq olmadan onların yaşayışı barədə axtarış aparmaq mümkün deyil. Buna görə də, biz əvvəlcə İslam məktəbində məsum imamların (əleyhimus-salam) məqam və dərəcələrini, imamətin malik olduğu yüksək mövqeyi barəsində bir sıra məsələləri araşdırırıq. Ümidvarıq ki, bu iş bizim Allahın seçilmiş bəndələri barəsində olan .məlumatımız və mərifətimiz gün-gündən çoxaltsın

### MƏSUMLARIN İSLAMI

Allah-Taala Öz peyğəmbəri Həzrət Mühəmməd (səlləllahu əleyhi və alihi və səlləm)-in dininin kamil və tamam olmasını xəbər verdiyi, imamət və rəhbərlik məsələsinin o Həzrətin vasitəsi ilə Qədir Xumda elan olunduğu zaman(١) Həzrət Əliyyibni



---

١- [١]Maidə surəsinin ٣-cü və ٦٧-ci ayələrinə müraciət edə bilərsiniz.

Əbitalib (əleyhis-salam) möminlərin əmiri və o həzrətin canişini kimi təqdim edildi. Yəni Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in ٢٣ ildə çəkdiyi bütün zəhmətlər, habelə bu müddətdə Quranın bütünlüklə nazil olması Əliyyibni Əbitalib (əleyhis-salam)-ın imamətinin elan olunması ilə öz məxsus mənasını tapdı. Əgər bir şəxs kamil İslam dininin arxasınca getmək istəsə, onda gərək Peyğəmbəri Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm)-in risaləti müddətində gətirdiyi Quran və başqa risalət məsələlərini qəbul etməklə yanaşı, Həzrət Əliyyibni Əbitalib (əleyhis-salam)-ın müqəddəs vücudunu Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm)-in vəsi və canişini kimi tanısın; bilsin ki, Həzrətin vilayəti İslam dininin ayrılmaz bir hissəsidir. Yəni Həzrət Mühəmməd (səlləllahu əleyhi və alihi və səlləm)-in peyğəmbərliyini qəbul etdiyi kimi, şəksiz Əliyyibni Əbitalib (əleyhis-salam)-ın vilayətini də qəbul etsin. Əgər bir şəxs onun vilayət və rəhbərliyini qəbul etməsə, İslamı və Peyğəmbəri qəbul etdiyini necə iddia edə bilər? Hansı ki, bu din Əmirəl-mömininin vilayəti ilə kamil olmuşdur. Onda .gərək deyək ki, bu şəxs həqiqi İslamının yalnız bir qismini qəbul etmişdir

Qeyd edək ki, Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm) özünün son :vəsiyyətində buyurmuşdur

Mən iki ağır şeyi sizin içinizdə əmanət qoyuram: ١-Allahın Kitabını (Quran); ٢-Əhli (.beytimi (Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam) və onun övladları

Həzrətin məqsədi budur ki, bu iki əmanət heç vaxt bir-birindən ayrılmazlar; hərgah Quranı bəhanə edib

sinələrinə vuranları görsəniz, (Ömər dedi: həsbuna kitabullah–Allahın kitabı bizə bəsdir və Əhli-beytə ehtiyacımız yoxdur), bilin ki, yalançıdırlar və xalqı aldatmaq üçün Quranı bəhanə ediblər.

Beləliklə onlar Əhli-beyti işlərdən kənar edib, haqlarını tapdaladılar və onları ev dustağı etdilər. Onlar yalan deyirlər. Məsələn, Siffeyn döyüşündə Müaviyə Quran tərəfdarı olduğunu iddia edir, amma onu nizələrin başına taxır. Məhz bu yerdə Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam) buyurur: Bu Quranları oxlayın, Quranın natiqi (həqiqətlərini bəyan edən) mənəm, mən Quranın təcəssümüyəm.

## PEYĞƏMBƏR (səlləllahu əleyhi və alihi və sələm)–İN VƏFATINDAN SONRA XALQIN VƏZİYYƏTİ

Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in vəfatından sonra tarixə nəzər salın. Görəsən ümmət bu vəsiyyətə əməl etdimi? Əsla! Əhli-beyt (əleyhimüs-salam) Həzrət Əliyyibni Əbitalib (əleyhis-salam)-dan, Həzrət Höccət İmam Zamanın (əleyhis-salam)-ın müqəddəs vücuduna kimi ictimai səhnədən kənarda idilər.

## MƏSUM İMAMLAR QURAN QANUNLARINI İCRA EDƏNLƏRDİR

Peyğəmbəri Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm) Allah tərəfindən ilahi qanunları xalq üçün

.gətirdi, Əhli-beyt (əleyhimüssalam) Quran qanunlarını icra edənlər idi

Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam) və ۱۱ övladı Allah tərəfindən İmam kimi bir-bir tanıtdırıldılar. Bu gün onun axırıncı övladı Həzrət Vəliyyi Əsr İmam Zaman .(əleyhis-salam)-dır

Əgər camaat ilahi-Quran qanunlarının icra olunmasını istəsəydilər, onda bu qanunları Allah tərəfindən müəyyən olunan şəxslər icra etməli idilər. Çünki Quran ilahi kitab olduğundan, onu icra edənlər də ilahi şəxsiyyətlər olmalıdır. Əlbəttə, bu sözü qəbul etmək ağırdır. Necə ki, min dörd yüz il bundan qabaq o zamanın camaatına çətin idi, məhz bu səbəbə görə də qəbul olunmadı. Amma biz tarixə baxıb camaatın onlara qarşı .necə rəftar etdiklərini, başlarına nə gəldiklərini görə bilərik

Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm)-in vəfatından sonra hiylələr başlandı. Onun sağlığında, müxaliftə qüdrətləri, cürətləri olmayan qəddar və kinli düşmənlər həzrətin vəfatından sonra qılınclarını siyirib İslamın təzəcə açılmış güllərinə hücum çəkdilər. Nələr etmədilər? Gəlib biz İslamı istəmirik dedilərmi? Əsla! Din pərdəsi altında dinin kökünü kəsməyə başladılar. Dedilər ki, biz yalnız Quranı istəyirik, .vəssalam! Həsbuna kitabullah. Bizim Əli övladları ilə heç bir işimiz yoxdur

Həzrət Əlini özlərinə layiqli rəhbər kimi görməyə gözləri olmayan bədbəxt camaat .sükut edərək Həzrəti ۲۵ il ev dustağı etdilər

Birinci, ikinci və üçüncü xəlifənin hakimiyyəti dövründə bacardıqları qədər səhvə, xətaya yol verdilər. Xəta xətanın üstündən, səhv səhvin üstündən. Nəhayət İslam cəmiyyətini elə bir çıxılmaz vəziyyətə saldılar ki, yollarını azmış rəhbərlər onun

.həllində aciz qaldılar. Buna görə gəlib Əli (əleyhis-salam)-ın qapısını döydülər

Peyğəmbərin vəfatından ۲۵ il keçmişdi. Bu müddət ərzində Quranın başına nələr gəlməmişdi? Quran qanunları bir-birinin ardınca qəsdən təkzib edilmiş, İran və Roma imperiyalarının geniş əraziləri fəth olunmuşdu. Bu iki imperatorluqların və fəth olunmuş başqa ərazilərin müsəlman əhalisi, görəsən, hansı İslamı qəbul etmişdilər? Peyğəmbərin, (Quran və Əhli-beytin) İslamını, yoxsa Əbu Bəkrin, Ömərin, yaxud ?Osmanın İslamını

Axırda Həzrət Əliyyibni Əbitalib (əleyhis-salam)-ın qapısına gəlmələrinin səbəbi onun məqam, mövqe, əndişə və ideyalarına görə deyildi. Buna görə gəlmişdilər ki, Osman, xüsusilə ömrünün son illərində artıq İslam ümmətinə əsla əhəmiyyət vermir, beytül-malın hamısını özü üçün toplayırdı. İndi Həzrət Əliyyibni Əbitalib (əleyhis-salam)-dan istəyirdilər ki, onların beytül-mala olan tamahlarını təmin etsin. Halbuki, ictimai ədaləti icra etmək üçün onlarca başqa əsaslı işlər də icra olunmalı idi. Həzrət Əli (əleyhis-salam) İslam və Peyğəmbər sünnətindəki inhirafları görmüşdü. Buna görə də o, xalqın beyət üçün dəvətindən imtina edir, istəklərini qəbul etmir və buyururdu ki, məndən əl çəkib, başqasını xilafət üçün seçin. Əgər mənə beyət etsəniz, bir sıra işlər görəcəyəm ki, sizin üçün müxtəlif müşgüllər, çətinliklər yaradacaq. Ürəkləriniz ona dözüb əqllər onu qəbul edə bilməyəcək. Üfüqləri və siyasətləri qara buludlar örtmüş, işıqlı yol əvəz (olunmuşdur.(۱



---

.Nəhcül-bəlağənin şərhi, (Feyzül İslam) ۹۱-ci xütbə səh.۲۱۷[۲] -۱

Xalqın Həzrət Əmirəl-möminin (əleyhis-salam)-la beyət etməsindən sonra, bu xalqla çətinlikləri başlandı. Elə bir xalq ki, vilayət məqamı ilə ümumiyyətlə tanışlıqları olmayıb həqiqi İslamdan xəbərsiz idilər. Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm)-in .besətinin əsas məqsədini unutmuşdular

Digər tərəfdən küfr, dinsizlik və nifaq başçıları, qəbilə başçıları, dinlərini dünyaya satan alimlər tərəfləri qızıl, güc və hiylə olan üçbucaqda bir yerə yığışıb haqqın nurunu .söndürmək istədilər

Mövla Əli (əleyhis-salam)-ın kifayət qədər vəfalı dostları olmadığı halda nakisin, qasitin və mariqinlərin müqabilində dayandı. Bəli... beş il nur və zülmət arasındakı çarpışmadan sonra zülmətə adət etmiş, nurdan qorxub qaçan və onu qəbul etməyə taqəti olmayan xalq işi o yerə çatdırdı ki Həzrət Allahdan onu xalqın arasından aparmasını istədi ki, bu cür insanları görməsin. Xalq isə zülməti sevirdi. Bu nur ۴۰-cı hicri qəməri il, ramazan ayının ۱۹-cu gecəsi Əşqəl-əşqiya(۱) İbni Mülcəm Muradi .tərəfindən söndürüldü

Həzrətin şəhadətindən sonra onun əziz oğlu İmam Həsən (əleyhis-salam)-la zahirdə beyət etdilər, qəlbləri isə Müaviyəyə tərəf can atırdı. Bir neçə aydan sonra bu həqiqət üzə çıxdı–Müaviyəyə, Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in canişini (?) kimi beyət edib cani-dildən ona bağlandılar. Bu minvalla o, ۶۰-cı hicri ilinə qədər qüdrət kürsüsündə oturdu. Müaviyədən sonra isə



---

Bədbəxtlər bədbəxti[۳] -۱

Yezidə, (?) Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in canişini kimi beyət .etdilər

Biz əhli-beyt (əleyhimüs-salam)-ın davamçıları hər hansı vəchlə olursa olsun, onların haqqını qəsb edənləri müdafiə etməməli, ideoloqi məktəbimizin prinsiplərini dərindən dərk etməliyik. Yəni ideoloqi məktəbimizi məsum imamlarımızın yaşadığı ٢٥٠ illik .dövrdə xilafət barəsindəki nəzərlərini araşdırmalıyıq

Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-dan İmam Zaman (əleyhis-salam)-a kimi məsum imamlardan heç biri dövrünün xəlifəsini təsdiq etməmiş, o xəlifənin məqsədlərinin tərəfdarı olmamışdır. Əgər məsum imamlarımız bütün qəsbkar xəlifələri və rəhbərləri rədd edərək onları, öz haqlarını qəsb edənlər kimi tanıtdırırlarsa, onda biz nahaq, qeyri-qanuni xəlifələri haqq tərəfdarları kimi necə ?qəbul edə bilərik

## PEYĞƏMBƏR (səlləllahu əleyhi və alihi və səlləm) VƏ MƏSUM İMAMLARIN PROQRAMLARI ZAHİRƏ ƏSASLANIRDI

Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm) və məsum imamların (rəhbərlik məsələsində) xalqla rəftarı zahirə əsaslanırdı. Belə ki, əgər bir şəxs batində Allahı və Onun Rəsulunu qəbul etməyib inkar edirsə də, amma zahirdə özünü imanlı göstərib dildə şəhadəteyni desəydi, müsəlman hesab olunurdu. Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm) onunla zahiri əlamətlərə görə rəftar etməyə məmur olunmuşdu. Həmçinin Əmirəl-möminin Əliyyibni

Əbitalib (əleyhis-salam)-dan İmam Həsən Əsgəri (əleyhis-salam)-a kimi bütün .məsum imamlar xalqla, onların zahirlərinə əsasən rəftar etmişlər

Bizim məsum imamlar (əleyhis-salam) haqqında əksər suallarımız bu məsələni bilmədiyimizdən irəli gəlir. Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam), İmam Həsən, İmam Hüseyn (əleyhiməs-salam) və digər imamların İslam ictimaiyyətindəki rəftarları məhz bu əsasdadır ki, onu gələcəkdəki hadisələrdə .müşahidə edəcəyik

Əlbəttə, Həzrət Sahibəz-zəman (əleyhis-salam)-ın barəsində bu məsələ istisna olunur. Belə ki, o həzrət Allahın izni ilə zühur edəndə, rəftarı insanların batini əqidələri əsasında olacaq, heç kəsdən şahid, dəlil-sübut istənilməyəcək. O Həzrətin hökmləri və əmrləri qeydsiz-şərtsiz, son dərəcə kəskinliklə icra olunacaq. Müxaliflərlə son dərəcədə sərt rəftar olunacaqdır. Bu rəftar Əhli-beyt (əleyhimüs-salam)-ın bütün müxalifləri və düşmənlərinin məhv olub, bəşəriyyətin mənəvi təkamülünə mane olmadıqları, dünya hökumətinin Həzrət Bəqiyyətullah (əleyhis-salam)-ın əlində olduğu :vaxta qədər bu minvalla davam edəcəkdir. Bu barədə bir neçə rəvayətə işarə edirik

Həsən Haruna deyir: İmam Sadiq (əleyhis-salam)-ın hüzurunda oturmuşdum. Məli .۱ ibni Xüneys o Həzrətdən soruşdu: İmam Qaim (ə) qiyam edəndə onun rəftarı Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-ın rəftarından fərqlənəcəkmi? İmam Sadiq (əleyhis-salam) buyurdu: Bəli! Buna görə ki, İmam Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam) öz müxalifləri ilə mülayim rəftar, minnət və güzəşt əsasında rəftar edirdi. O Həzrət bilirdi ki, özündən sonra şiələri düşmənlərin qarşısında (zəif olacaqdır. Lakin İmam Qaim (əleyhis-salam

zühur edəndə onlara (onun qarşısında müqavimət göstərənlərə) qarşı rəftarı qılınc və əsarət əsasında olacaq. Çünki o həzrət bilir ki, özündən sonra şiələr heç vaxt düşmən .qarşısında məğlub olmyacaqlar

۲. Məhəmməd ibni Müslüm deyir: İmam Baqir (əleyhis-salam) buyurdu: Əgər xalq İmam Qaim (əleyhis-salam)-ın qiyamından sonra camaatla rəftarının necə olacağını bilsəydilər, çoxları o Həzrəti görməməyi arzu edərdilər. Müxalifləri həddindən artıq öldürəcəkdir. Əvvəlcə Qüreyşdən başlayacaq, onlar üçün qılıncdan başqa heç nə almayacaq, qılıncdan başqa onlara bir şey verməyəcəkdir. İş o yerə çatacaqdır ki, çoxları bu adam Ali-Mühəmməddən deyil. Əgər Ali-Mühəmmədən olsaydı, ürəyi rəhmə gələrdi-deyəcəklər

## XALQIN VƏZİFƏSİ İMAMLARIN DÖVRƏSİNDƏ YIĞIŞMAQ İDİ

Ümdə məsələ və müşkül xalqın imamların hər birini düzgün şəkildə tanımamasıdır. Bütün imamlar bu nöqteyi-nəzərdən məzlum olmuşlar. Xalq onları bəşəriyyətin yeganə nicat verənləri kimi tanımırdılar. Həqiqətdə isə onlar Allah tərəfindən xalqa imam, rəhbər seçilmişdilər ki, Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm)-in vəfatından sonra ümmətin rəhbərliyini əllərinə alsınlar. İslam ümmətinin vəzifəsi pərvanə kimi imamların dövrəsinə fırlanaraq münafiqlərin hiyləgərlik planları, fəaliyyət və əməllərinin qarşısını almaq, nəticədə

.zalımları, küfr rəhbərlərini tarix tullantılarının içinə atmaq idi

İmam (əleyhis-salam)-ın xalqa rəhbərliyi və onlarla rabitəsi hökm edən və hökm olunan kimi olmalı idi. Üstəlik Allah imamlar (əleyhis-salam)-ın xalqı hansı yolla olursa olsun, qılınc gücünə özlərinə tabe etdirmələrini deyil, xalqın özlərini imamların əmrinə .tabe olmasını istəmişdi

Allah hökm etmişdi ki, imamlar xalqın dalınca getməsinlər, əksinə, bu vəzifəni xalqın öhdəsinə qoymuşdu ki, hidayət edən imamların ardınca gedərək onları özlərinə rəhbər .seçsinlər

Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm) Həzrət Əli (əleyhis-salam)-a :buyurdu

.Sən Kəbə Evi kimi ol; qoy xalq sənə tərəf gəlsin, sən isə heç kəsə tərəf getməyəsən

Buna görə də, Həzrət Əli (əleyhis-salam)-ın beş illik hakimiyyəti dövrü bizim mövzumuzun əyani şahididir. Belə ki, Həzrətin rəhbərliyinin əvvəlindən hökumətinin sonuna kimi camaat onun sözünə qulaq asmırdı. Lakin o Həzrət təkcə nəsihətlərlə kifayətlənir, camaata aid olan hökmlərində əsla zorakılığa əl atmırdı. Çünki bu .qanunlara əməl etmək, xalqın şəri vəzifəsi idi

Həzrət Əli (əleyhis-salam)-dan sonra İmam Həsən (əleyhis-salam)-a beyət etdilər, o da qəbul etdi. O Həzrət xalqın Müaviyə ilə müharibəyə meylli olmadıqlarını, ürəklərinin .Müaviyəyə tərəf yönəldiklərini görəndə naçar qalıb sülhü qəbul etdi

İmam Hüseyn (əleyhis-salam)-ın dövründə isə, Kufə camaatı onu dəvət edib dedilər: Ey Allah Rəsulunun oğlu! Biz sənin rəhbərliyini qəbul etməyə hazırıq və beyət xəbərini sənə göndəririk. Bağlarımız

yaşıllaşıb, meyvələrimiz yetişibdir. Müaviyə dünyadan gedib, münasib şərait yaranmışdır. Əgər bizim dəvətimizi qəbul etməsən, onda biz sənə hüccəti tamam .etmiş oluruq

Buna görə də, Həzrət onların dəvətini qəbul etdi və Kufəyə yola düşdü. Lakin Kufə camaatı əhd-peymanlarına vəfa etmədilər, Yezidə beyət edib imamla müharibəyə .başladılar. Nəhayət, məzlum imamı, onun tərəfdarları ilə birlikdə şəhadətə yetirdilər

Bütün bunlar camaatın vəfasızlıqlarını göstərirdi. Özü də bir dəfə deyil, dəfələrlə təkrar olunmuş, bu dəfə isə ən faciəli şəkildə sona çatmışdı. Aşura faciəsindən sonra imamlar bir daha xalqın zahirdə atəşin, batində isə puç, yalançı şüarlarına əhəmiyyət (vermədilər.(۱

## FƏTHLƏR CAMAATIN İMAMLARDAN UZAQLAŞMASINA SƏBƏB OLDU

İslam tarixinin ۱-۲-ci əsrinin, habelə imamlar (əleyhis-salam)-ın həyat tarixini araşdırarkən, diqqət yetirilməli mühüm məsələ budur ki, o dövrdə müsəlmanların Roma və İran imperatorluqlarındakı genişmiqyaslı fəth və nüfuzları ilə əlaqədar fikir və düşüncələr ictimaiyyətə hakim idi. Onlar sərhədləri genişləndirmək, dünya malını çoxaltmaq, qənimət əldə etmək istəyirdilər. Amma bu fəthlərin axır aqibəti onları əsla .maraqlandırmırdı



---

Biharül-ənvar, ۵۲-ci cild, səh.۳۷۲[۴] -۱

## TƏHQİQATÇILARIN İDEYALARININ ƏSAS BÜNÖVRƏSİ

Hər bir mövzunun, xüsusilə də tarixi məsələlərin təhqiqində təhqiqatçının baxışı təhqiqatı hansı nəzərdən etməsi müəyyən olmalıdır. Bəzən bir çox məsələlərdə müşahidə olunur ki, şəxs müəyyən bir məsələni araşdırır, bir neçə səhifədən sonra, yaxud başqa bir məsələdə əvvəldə yazdığı ilə müqayisədə təzadlı şeylər irəli sürür.

Məsələn, bizim iki yüz illik İslam tarixindəki baxışımız Əhli-beyt (əleyhis-salam) məktəbinin, əhli-sünnətin, yaxud da qərb təhqiqatçılarının baxışları kimi və ya başqa əsasda olduğunu araşdırmalıyıq.

Bəzən elə olur ki, yazıçı özünü bir tərəfdən Əhli-beyt (əleyhis-salam) məktəbinin tərəfdarı kimi qələmə verir, digər tərəfdən isə İslam tarixinin ٢-٣-cü əsrlərindəki bütün zalım xəlifələrin əməllərini İslam qanunu və İslamın təcəssümü kimi qiymətləndirir; zülmkar xəlifələrin siyasətlərini İslam siyasəti, onların mədəniyyətini İslam mədəniyyəti kimi qeyd edir və geniş fəthləri İslamın inkişafı kimi qələmə verir. Bu sayaq təhlillər Əhli-beyt (əleyhimüs-salam) məktəbinin davamçılarını şiə məktəbinin əsil məsələləri ilə tanış edə bilməz.

### ٢–Cİ HİSSƏ

### İMAM HƏSƏN (əleyhis–salam) HANSI CAMAATLA MÜASİR İDİ?

İmam Həsən (əleyhis-salam) bir xalqa imamət edirdi ki, onların imamlarla birgə hərəkət etməyə əsla

hazırlıqları yox idi. İmam Həsən Əmirəl-möminin Əli (əleyhis-salam)-ın oğludur. Bu ümmət İslam Peyğəmbərinin vəfatından sonra mövla Əlini tək-tənha qoyaraq dünya malı, eyş-işrət arxasınca getdilər, nəticədə özlərinin seçdikləri rəhbərlərin zülm və sitəminə düçar oldular. İş o yerə çatdı ki, üçüncü xəlifə Osmanın hakimiyyəti zamanında gördülər ki, artıq onların dünyalarından bir şey qalmayıb. Az qalır ki, zalımlar və qarətçilər İslam adı ilə, onların var-yoxlarını talasınlar. Qəflət yuxusundan oyandılar. Öz dünya işlərini sahmana salmaq üçün Əmirəl-möminin Əli (əleyhis-salam)-ın dalınca gəldilər. Burada Həzrətin onların beyətini qəbul etməməsinin səbəbini görürük. O, bu xalqın hansı məqsədlərlə onun evinin qapısına yığışdıqlarını, İslam və Quranı dirçəldib icra etmək yolunda onunla bir məramda olmadıqlarını bilirdi. Onlar məxsus bir hədəflə Əli (əleyhis-salam)-ın evinin ətrafına yığışmışdılar. Onların fikirləri Həzrətin məqsəd və fikirləri ilə heç də uyğun gəlmirdi. Biz bu məsələni Həzrətin xilafəti dövründə müşahidə etdik.(۱)

Həzrət Əli (əleyhis-salam) bu məsələni dəfələrlə xatırladaraq buyururdu: Mən sizi Allaha görə istəyirəm. Siz isə məni öz dünyanıza görə istəyirsiniz. Mən sizi islah edən, inhiraflarınızı, əyriliklərinizi düzəldə bilən şeylərə (yollara) agaham. Amma siz məni fəsada çəkməklə islah olunmaq istəyirsiniz. Doğrudan da, mən sizi düz yola çəkə bilən şeyin nə olduğunu daha yaxşı bilirəm: o, qılıncdır. Mən də sizi islah edərək özümü fəsada çəkməyə razı deyiləm.



---

۱- [۵] Əmirəl-möminin Əli (əleyhissalam)-ın başına nələr gəldi kitabına müraciət edin.

Həzrət başqa yerdə buyurur: And olsun çərdəyi yaran (cücərdən), insana can verən Kəsə, sizə vədə verilən şeyin vaxtı çataraq öz işinə məşğul oldu. Mən sizi Quran moizələri ilə nəsihət etdim, lakin siz mənim nəsihətlərimdən istifadə etmədiniz. Sizi əl ağacı ilə vurdum fayda vermədi; ilahi cəza qanunlarını icra edən qamçı ilə cəzalandırdım, amma tutduğunuz yoldan əl çəkmədiniz. Məlum oldu ki, sizi ədəbləndirə bilən yeganə şey qılıncdır, vəssalam! Mən sizin işlərinizi islah etmək üçün .özümü fəsada atmağa razı olmadım

Bəli, əvvəlcə Mövla Həzrət Əli (əleyhis-salam)-ın, sonra isə ümmətin ruhiyyə və məqsədlərindən agah olduqdan sonra baş verən tarixi hadisələr barəsində mühakimə yürütmək lazımdır. Həzrətin bu sözlərinə diqqət yetirin: Dünən hökmdar və əmr verən idim, bu gün isə əmr icra edən və itaət edənəm; dünən nəhy (qadağan) edən idim, bu gün isə məni nəhy edirlər. Mən sizi xoşlamadığınız şeyə vadar etmək istəmirəm.(١)

Bəli xalqın ruhiyəsi bu sayaq idi və Həzrətin ürəyini ağrıdırdı. Belə ki, dəfələrlə buyururdu: Sizin köməyinizə ehtiyac duymadığım, sözlərinizi təsdiq etmədiyim halda sübh etdim. Allah məni sizdən alıb sizdən yaxşılarını mənə nəsib, məndən pisini də sizə hakim etsin. Sizin imamınız bir şəxsdir ki, Allaha itaət edir. Siz isə gözlənildiyinin əksinə olaraq ona itaət etmirsiniz. Şamlıların rəhbəri (Müaviyə-müt.) Allahın əmrlərindən boyun qaçırdığı halda xalq ona itaət edir. Allaha and olsun, nə çox istərdim ki, Müaviyə öz tabeçilərini mənim tabeçilərimlə, dinarın



---

.Nəhcül-bəlağənin şərhi (Feyzül İslam), ١٩٩-cu xütbə[۶] -١

qızıl pul) dirhəmlə (gümüş pul) dəyişdirildiyi kimi dəyişdirsin. Yəni sizdən on nəfəri) .məndən alıb müqabilində bir nəfər verərdi

And olsun Allaha, istərdim ki, sizi tanımayam, siz də məni tanımayasınız. Ona görə ki, bu cür tanışlıq peşmançılıq gətirər. Siz mənim qəlbimi dərd ilə doldurdunuz, işimi xarlığa (zəlilliyə) sürüklədiniz. İş o yerə çatdı ki, Qureyş tayfası: Əli qəhrəman bir kişidir. Lakin müharibədən başı çıxmır dedilər. Sizi an verirəm Allaha, görün heç bu iddia düzdür? Heç onların arasında bu qədər döyüş təcrübəsi olan və çətinlik çəkən bir kəs tapılarmı? Mən hələ iyirmi yaşıma çatmadığım vaxtlarda döyüş meydanına qədəm qoydum. İndi də, yaşım altmışı ötdüyü vaxt, əvvəldəki kimi döyüş əməliyyatını tam ?dəqiqliklə bilirəm. Lakin sözlərinə qulaq asan olmayan bir kəs kimə əmr versin

And olsun Allaha çox istəyirəm ki, Allah məni sizin aranızdan aparıb behişt bağlarına, Öz razılıq məqamına çatdırsın. Həqiqətən ölüm addımbaaddım məni təqib edir. Hansı bir hadisə, bu ümmətin ən bədbəxtinin mənim saqqalımı başımın qanına boyamasının qarşısını ala bilər? Bu söz Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm)-in verdiyi .vədə idi ki, mənə öz aqibətimdən xəbər verdi

Həzrət başqa bir yerdə öz zamanının camaatının ruhiyəsini Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in dövrünün camaatının ruhiyyəsi ilə müqayisə edərək :buyurur

Biz Allahın Rəsulu (səlləllahu əleyhi və alihi və səlləm) ilə birgə olanda, (möminlər) İslam dini naminə öz ataları, uşaqları və qardaşları ilə döyüşürdü. And olsun öz canıma, əgər bizim dinə kömək etməkdəki rəftarımız sizin rəftarınız kimi

(olsaydı, dinin bünövrəsi möhkəmlənməz, İslam ağacının şaxələri yaşıllaşmazdı.(١)

Həzrət Əli (əleyhis-salam)-ın hakimiyyətinin son günlərində olan bu bəyanatı onun .ürək ağrısının nə qədər çox olduğunu göstərir

**?MƏSUM İMAMLARIN (əleyhis–salam) HÖKUMƏTİ NECƏ İDİ**

Siz mülahizə edin: əgər xalqın həzərəti Əli (əleyhis-salam) ilə rəftarı bu cür ?olmuşdursa, onda İmam Həsən (əleyhis-salam) ilə necə olacağını gözləyirsiniz

Buna görə də görürük ki, İmam Həsən (əleyhis-salam)-ın rəftarı ilk əvvəldə dəqiq surətdə hesab-kitabla, məxsus proqram üzrə irəliləyir. Çünki onun dövranı təkcə İslam tarixinin deyil, həm də dünya tarixinin ən həssas və böhranlı dövrüdür ki, kiçik .bir hadisə baş verdikdə böyük bir faciəinin üz verməsi gözlənilirdi

Əgər biz şiə mədəniyyəti və imamət ideyaları ilə tanış olsaq görərik ki, zülm, sitəm, məkr, hiylə, aldatma, yalan, hoqqabazlıq, saxtakarlıq və siyasi oyunlar ilə birgə olan qeyri-qanuni hökumət hər hansı adla olsa belə, imamət məktəbi nəzərindən rədd olunaraq məhvə məhkum olunmuşdur. Məsum imamın imaməti elə bir hökumətdir ki, bütün əyriliklərdən, eybəcərliklərdən uzaq olmalı; o hökumətdəki xalq isə siyasət oyunları və hoqqabazlıq



---

.Əmirəl-möminin Əli (əleyhissalam)-ın başına nələr gəldi kitabına müraciət edin[٧] -١

prinsiplərinə ehtiyac duyulmamalıdır. Xalq məsum imamın hökumətində öz imamlarının ilahi əmrlərini qəbul etməyə hazırlıqlı olmalı və canla-başla onların əmrlərinə qulaq asıb itaət etməlidir. Amma İmam Həsən (əleyhis-salam), haqqı istəməyən, ilahi məqsəd və məramların arxasınca getməyən, doğruluq, sədaqətlilik yerinə yalanı daha çox bəyənən bir xalqla üzbəüz idi. Müaviyənin hökuməti başdan-başa saxtakarlıq əsasında idi. İslam və insaniyyətin ziddinə olan hər yoldan istifadə .edirdi ki, xalqı hökumətinin himayəçiləri kimi siyasi səhnədə saxlaya bilsin

## KUFƏNİN COĞRAFİ VƏZİYYƏTİ

İmam Həsən (əleyhis-salam)-ın yaşadığı dövrü araşdırarkən o zamanın coğrafi mühitini də bəyan etmək lazımdır. Əgər Kufə şəhərinin ictimai vəziyyəti və mövqeyi təhlil olunarsa, Həzrət Əli, İmam Həsən, İmam Hüseyn (əleyhimüs-salam)-ın dövranlarında və hətta sonrakı dövranlarda baş vermiş çoxlu hadisələrin .aydınlaşmasına səbəb olar, çoxlu müəmmalı hadisələri aşkar edə bilər

Kufə şəhərinin əsası ١٧-ci hicri ilində, Ömərin xilafəti zamanında qoyulmuşdur. O, ١٥-ci ildə İranın Qadisiyyə və sonrakı ildə Cəlula döyüşündə fəth olunmasından sonra qüvvələrin baş komandanı olan Səd ibni Əbi Vəqqasa əmr etdi ki, orada qalsın. Ömərin bu işdən məqsədi öz qüdrət dairəsini fəth olunmuş ərazilərdə (İran sərhədlərinə tərəf) genişləndirmək üçün münasib şərait yaranana qədər möhkəmlətmək idi. Bu səbəbdən Səd ibni Əbi Vəqqas ərəb qüvvələrini Sasani padşahlarının

paytaxtı olan Mədaində yerləşdirdi. Amma tezliklə məlum oldu ki, bu yer iqlimin rütubətli və qoyun, inək və at sürülərinin otarılması üçün şəraitin çətin olduğuna, açıq səhra mühitinin azlığına görə ərəblər üçün qənaətbəxş deyildir. Buna görə də Ömər məktubda Sədə yazdı ki, qoşunu Mədaindən elə bir yerə aparsın ki, ərəblərin həyat tərzlərinə uyğun gəlsin, onların ehtiyaclarını təmin edə bilsin. Səd Salman Farsi və Hüzeyfət ibni Yəmanin köməyi ilə Fəratın qərb sahilində qədim Fars və Hiyrə şəhərinə yaxın olan vadini seçdi. Bundan sonra Səd öz qüvvələrinə əmr etdi ki, çadır qurub oranı özləri üçün yaşayış məntəqəsi seçsinlər. Bu, Kufə şəhərinin salınmasının başlanğıcı idi. Çoxlu adamın bu şəhərə gəlməsi ilə müxtəlif çətinliklər qarşıya çıxdı. Bu çətinliklərin əksəriyyəti İslam və Quran əsasında həll olunmurdu. Səd bu çətinlikləri araşdırdıqdan sonra Ömərlə məsləhətləşərək Kufənin cəmiyyətini yeddi təzə dəstəyə bölüb nizama saldı. Bu bölgü qohumluq əsasında olmaqla ərəb soy-kökünü tanıyan iki mütəxəssisin köməyi ilə yerinə yetirildi. Bu cür bölgü ərəblərin İslamdan qabaqkı dövranlara məxsus olan bölgülərinə, qəbiləvi bölgü prinsipinə daha çox oxşayırdı. (Belə ki, o qəbilələrdə siyasi birliklər zəif ittifaqa əsaslanıb əsas etibarı ilə məqsədsiz şəkildə qurulurdu.) .Maddi, siyasi və mədəni imkanlar da məhz bu bölgülər əsasında bölüşdürülürdü

Bu bölgü ۱۹ il davam etdi və Həzrət Əli (əleyhis-salam)-ın ۳۶-cı ildə Kufəyə gəldiyi zaman o Həzrətin vasitəsi ilə ləğv edildi. Bu iş də öz növbəsində qəbilə başçılarının .etirazlarına səbəb oldu və müxalifətlər başlandı

Diqqət mərkəzindən yayınmayan və hökmən qeyd olunmalı məsələlərdən biri də iranlıların Kufə şəhərində olmasıdır. Kufənin əhalinin say baxımından formalaşmasının ikinci əsas səbəbi iranlıların orada olması idi. Mədainin fəth olunmasında, Qadisiyyə müharibələrində və nəhayət böyük Nəhavənd müharibəsində İran qoşunlarının böyük əksəriyyəti ərəblərə əsir düşərək qul kimi Kufəyə gətirildilər. Əsir olunanların çoxu İslam dinini qəbul edərək öz sahiblərinin əlindən xilas oldular. Amma əvvəlki kimi .ağalarının həmpeymanı olub onların hesabına dolanırdılar

İranlıların Kufədə olmasının digər səbəbi bu şəhərin coğrafi cəhətdən İran şəhərlərinə yaxın olması idi. Kufə şəhəri iranlıların köç etməsi üçün daha əlverişli, münasib idi və onlar üçün yeni-yeni imkanlar yaratdı. Beləliklə Sasani imperiyasının süqutundan sonra kəndlilərin çox hissəsi öz torpaqlarının qeyri-münbit olduğunu görüb təzə iş .tapmaq üçün inkişaf etməkdə olan şəhərlərə yola düşürdülər

Kufə onlar üçün daha çox cəzbedici idi. Bundan əlavə, orada çoxlu qadın var idi ki, ərəb fatehlərinə nəsib olmuşdu. Bu qadınlar onları əsir edənlərlə ailə qurmuş, onlar üçün uşaq dünyaya gətirmişdilər. Bunun nəticəsində ٢٠ ildən az bir müddətdə, bu şəhərdə cavan nəsil yaranmışdı ki, ana tərəfdən iranlı idilər. Diqqəti cəlb edən məsələlərdən biri də bu idi ki, Kufə iranlıları şəhərin ictimai mühitində öz ərəb həmyerliləri ilə bərabər .deyildilər. Onlara məvali, yəni gəlmələr və ya azad edlmiş qul deyirdilər

İctimai baxımdan aşağı təbəqədə olmalarını göstərən bu terminə görə iranlılar yerli əhalinin nəzərində ikinci təbəqə sayılırdılar. Şəhər sakinlərinin cahiliyyət dövrünə məxsus olan qəbilə bölgüsü əsasında bölünməsinin zəif nöqtəsi bu idi ki, onların iddiaları qədim varlılıq, qüdrətlilik və rəhbərlik etdikləri qəbilələrə məxsus olan üslub əsasında idi. İslami qanun və meyarlar ümumiyyətlə nəzərə alınmırdı. Bu səbəbdən Kufədə qüdrət qəbilə başçılarının əlində idi. Onların əksəriyyəti Ömər və Osmanın hökumət üsulunun davam etdirilməsini istəyən qəbilə başçıları olub Həzrət Əli (əleyhis-salam)-ın hakimiyyəti dövründə daha çox ruhi əzabda idilər və Müaviyə ilə məxfi şəkildə təmas saxlayırdılar. Xüsusilə də həkəmiyyətdən (münsiflər məhkəməsindən) sonra Müaviyə çalışırdı ki, onlara imtiyaz, pul və sərvət verməklə qələbə çalsın. Onlar da gücləri çatan qədər öz məqsədlərinə kömək etmək üçün fikirləşirdilər. Bilirdilər ki, Həzrət Əli (əleyhis-salam)-ın Kufəni qərargah seçməsi ilə mənafeylərinə ciddi zərbə dəyəcəkdir. Buna görə də o Həzrətə qarşı laqeyd, Müaviyəyə isə rəğbətli idilər. Öz imtiyazlı mövqelərini, saysız-hesabsız mənfəətlərini .ona meyl etməkdə görürdülər

Həzrət Əli (əleyhis-salam)-ın şəhadəti və İmam Həsən (əleyhis-salam)-ın iş üstünə gəlməsindən sonra bu dəstələr yaranmış fürsətdən istifadə erərək Müaviyə ilə əl-ələ verdilər ki, əhli-beyt (əleyhis-salam)-ın vilayətinin kökünü kəssinlər. Buna görə Müaviyə xaricdən, bu daxili düşmənlər isə daxildən hücuma başlayıb işi gələcəkdə .oxuyacağınız həddə çatdırdılar

## HƏZRƏT ƏLİ (əleyhis–salam)–IN MƏQSƏDİ İRANLILARI HİMAYƏ ETMƏK İDİ

Həzrət Əli (əleyhis-salam)-ın öz hakimiyyəti dövründəki siyasətlərindən biri–iranlıları və cəmiyyətin aşağı sinfini himayə etmək idi. O Həzrətin iranlıları himayə etməsi onların sadəcə iranlı olmasına görə deyil, keçmiş xəlifələrin dövründə çoxlu həqarətlər gördüklərinə, aşağı təbəqə saylırdıqlarına görə idi. İranlılar Ömərin qoşunu hücum edərkən, habelə əvvəllər də eşitmişdilər ki, İslam azadlıq, qardaşlıq, bərabərlik və ədalət dinidir. Həmçinin müsəlmanların nümayəndəsi İran padşahı Yezdəgirdin məclisində Allah bizi göndərdi ki, istədiyimiz şəxsləri, bəndələrə pərəstiş, ibadət etməkdən ayırıb Allaha pərəstiş etməyə tərəf yol göstərək, onları dünyanın məhdud yaşayışından geniş mənəviyyət dünyasına; batil din və reqimlərdən ədalətli İslam dininə tərəf yol göstərək deyəndə, bu xəbəri eşitdilər və İslam qoşununun müqabilində öz qüdrətlərini əldən verib təslim oldular. Bu, İslam dininin millətlərin qəlbində nüfuz etməsinin sirlərindən biri idi. Belə ki, müsəlmanlar bir ölkəyə hücum edib oranı fəth etməzdən öncə İslam o xalqın qəlbini fəth etmişdi. Məhz buna görə .Qeysər və Kəsra şahları İslamın qaşısında müqavimət göstərə bilmədilər

Lakin Ömər və osman İranı fəth etdikdən sonra iranlıları rəsmi olaraq ikinci dərəcəli vətəndaş hesab edərək cahiliyyət adət-ənənələrini, qayda-qanunlarını cəmiyyətdə yenidən dirçəltdilər. Buna görə də Həzrət Əli (əleyhis-salam) bu cahiliyyət qanunlarını əsassız sayıb rədd edərək hamını qanun qarşısında bərabər hesab edir, beytül-malı bölərkən hamıya bərabər

maaş verirdi. Nəticədə Ömərin yaratdığı cahiliyyət reqiminin mühüm tərəfdarlarından biri kimi Əşəs ibni Qeys Həzrət Əli (əleyhis-salam)-a etiraz edərək dedi:–Ya Əmirəl-möminin, niyə bu iranlıları ərəblərdən irəli keçirirsən? Və nə üçün bu ayaqyalınlara yer ?və məqam verirsən

Həzrət Əli (əleyhis-salam) bu sözü eşidəndə qəzəbləndi, ayağını minbərdə möhkəm vurdu və buyurdu:–Kim mənim canımı bu qarnı iylənmiş faydasız adamlardan (Əşəs və sairlər kimi) qurtara bilər? Onların özləri yumşaq, rahat yataqlarda istirahət edir, uzunqulaq və sair dördayaq heyvanlar kimi o tərəfə bu tərəf mayallaq aşır öz bağırsaqlarını xumarlandırırlar. Amma camaat qızmar günəş altında Allaha görə fəaliyyət göstərirlər və o (Əşəs), mənə fərman verir ki, onları (iranlıları) öz yanımdan qovum, uzaqlaşdırım və zülümkarlardan olum!!! And olsun çərdəyi yarıb bitkini cücərdən və insanı xəlq edən Allaha! Mən özüm Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm)-dən eşitdim ki, buyurdu: And olsun Allaha, əvvəlcə siz iranlılarla İslama dəvət etmək üçün qılınc çəkib müharibə edəcəyiniz kimi, sonradan iranlılar sizi İslamın (yeniləşməsi və dini qorumaq naminə vuracaq, axırda sizinlə müharibə edəcəklər.(١)



---

Nəhcül-bəlağənin şərhi, (İbni Əbil Hədid) ١٩-cu cild, səh.١٢٤; Əl-ğarat, ٢-ci cild,[٨] -١ .səh.۴٩٨; Ğəribül-hədis ٣-cü cild, səh.۴٧۴

## İMAM HƏSƏN (əleyhis–salam)–IN DÖVRÜNDƏ CƏMİYYƏTƏ HAKİM OLAN TƏFƏKKÜR TƏRZİ

cı illərdəki camaatın fikri və etiqadı vəziyyəti çox qəribə idi. Xalqın əksəriyyəti-۳۸-۴۰ Müaviyənin iyrənc adam olduğuna inanmırdılar. Müaviyə və onun nəslinin ən çirkin və murdar insanlar olduğuna, Peyğəmbər övladı İmam Hüseyn (əleyhis-salam)-ı, onun bütün dostları və ailəsi birlikdə, hər insanın ürəyini ağrıdan faciəli surətdə qətlə yetirməyə can atdıqlarına inanmırdılar. Özünü Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in canişini kimi qələmə verən Yezid o Həzrətin övladlarını qanına qəltan etdi. Müaviyə Yezidlə bir toxumdan olmaqla, ondan da çirkin adam idi. Əgər İmam Həsən (əleyhis-salam) müsəlmanların qanının tökülməsinin qarşısını almasaydı, çox az qüvvə ilə Müaviyənin qarşısında durmasaydı, o, saysız-hesabsız insanların qanın nahaq yerə axıdacaq, İmamın ruhən zəif döyüşçülərini öldürməkdən əsla çəkinməyəcəkdi. Məgər Müaviyə, Əmirəl-möminin Əli (əleyhis-salam)-ın zamanında Siffeyn müharibəsinin baş !?verməsinə səbəb olmamışdı və bu müharibədə on minlərlə adam öldürülməmişdi

Əgər İmam Həsən (əleyhis-salam)-ın Müaviyənin qoşununu tar-mar edə biləcək güclü döyüşçüləri olsaydı, iş bu yerlərə gəlib çıxmazdı. Amma əfsuslar olsun ki, nə imamın güclü qoşunu vardı, nə də onların Müaviyə ilə vuruşmaq ruhiyyələri. Hətta Müaviyə ilə döyüş adı gələndə bədənləri qorxudan əsirdi. Qəribə vəziyyət yaranmışdı: bir tərəfdən İmam Həsən (əleyhis-salam)-ın döyüşçüləri Müaviyə ilə vuruşmağı vacib bilmirdilər. Çünki qəlbləri şək və

şübhə ilə dolu idi. Fikirləşirdilər ki, məgər Müaviyə ilə vuruşmaq mümkündürmü? Məgər Müaviyə müsəlman deyilmi, bəs nəyə görə onunla vuruşmalıyıq? və bunun kimi şeytani fikirlər Həzrətin ordusuna hökm sürürdü. Digər tərəfdən də Müaviyənin döyüşçüləri tam hərislik və kinlə İmam Həsən (əleyhis-salam)-ın ordusu ilə vuruşmağa hazır idilər. Onlar bütün varlıqları ilə inanmışdılar ki, İmam Həsən (əleyhis-salam)-ın döyüşçüləri kafirdirlər və hamısını öldürmək vacibdir. Hətta o həzrətin özünə .qarşı da bədbin idilər. Onun ali məqamı ilə tanışlıqları, mərifətləri yox idi

## KUFƏLİLƏRİN İMAM HƏSƏN (əleyhis–salam)–IN ZAMANINDAKI İCTİMAİ VƏZİYYƏTİ

Kufəlilərin az bir hissəsi istisna olmaqla, əksəriyyəti ikiüzlü, riyakar idi. Elə İmam Həsən (əleyhis-salam)-ın tərəfdarlarının əksəriyyəti bunlardan ibarət idilər. Belə ki, müharibənin ən şiddətli çağlarında qaçıb, səngərləri boş qoyurdular. Kufədə bir neçə böyük, adlı-sanlı şəxslər də var idi. Lakin onlar yalnız hansı tərəfin qələbəyə daha yaxın olduğunu gördükdən sonra o cəbhəyə qoşulmaq istəyirdilər. Bu kimi şəxslərin ixtiyarında çoxlu sayda adam var idi. O dövrdə yaşayış qəbilə surətində idi və hər kəs öz qəbilə başçısına itaət edirdi. Qəbilə başçılarından və tanınmış şəxsiyyətlərdən bəzilərinin adlarını qeyd edirik: Əşəs ibni Qeys, Əmr ibni Həris, Müaviyət ibni binti Xədicə, Şeys Rəbi, Əmmarət ibnil Vəlid, Ömər ibni Səd, Yəzid ibni Ümeyr, Ürvət ibni Qeys, İshaq ibni Xaricə, Şimr ibni Zilcoşən və s.. Bunlar dövlətə və siyasətə xidmət etməyin intizarını

çəkirdilər. Hansı tərəf qələbə çalsaydı, o tərəf ilə birləşəcəkdilər. Onların əksəriyyəti Kərbəla hadisəsində Hüseyn (əleyhis-salam)-ın qatillərindən və İbni Ziyad ordusunun .sərkərdələrindən idilər

Bu nüfuzlu kufəlilər yalnız dünya malı, məqam, mənsəb, mal, qızıl və qüdrət istəyirdilər. Fürsət axtarırdılar ki, baş verən hadisələrin istiqamətini (öz mənafelərini) .tapıb öz mövqelərini aşkar etsinlər

## CÜ HİSSƏ-٣

### HƏZRƏT ƏLİ (əleyhis-salam)-IN ŞƏHADƏTİNDƏN SONRA

Həzrət Əli (əleyhis-salam) Şama yola düşmək istəyərkən, ٤٠-cı hicri ilin ramazan ayının ١٩-da zərbətləndi və elə həmin ayın ٢١-də şəhadətə çatdı. Tarixçilərin yazdıqları kimi, o dövrdə Həzrət böyük bir ordu hazırlamışdı. Kufənin ətrafındakı ordugahda ٤٠ min hərbçi döyüş hazırlığı vəziyyətində gözləyirdilər ki, Həzrət Əli (əleyhis-salam)-la birləşib Müaviyə ilə döyüşə getsinlər. Amma o Həzrətin şəhadəti ilə tarixi hadisələrin .inkişaf istiqaməti tam əksinə dəyişdi

cı ilin ramazan ayının ٢١-i Həzrət Əli (əleyhis-salam)-ın şəhadətinin birinci günüdür.-٤٠ O Həzrətin şəhadətindən sonra, İmam Həsən (əleyhis-salam) məscidə gəldi. Hər yer .adamla dolu idi. Hətta məscidin ətrafı da dolmuşdu. Həmin ordu da orada idi

## İMAM HƏSƏN (əleyhis–salam)–IN İLK XÜTBƏSİ

Bu zaman İmam (əleyhis-salam) minbərin üstündə əyləşdi. Sözə başlamaq istəyəndə gözlərindən yaş axmağa başladı, qəhər boğazını tutdu. Bir anlığa dayandı, sonra :buyurdu

Hər hadisə barəsində–istər bizim üçün xoşa gələn, istərsə də ürək ağrıdan olsun–bir olan Allaha həmd olsun. And olsun yeganə olan Allaha və and olsun Öz bəndəsinə Quranı göndərən Xaliqə! Keçən gecə elə bir insan dünyadan getdi ki, ondan qabaqkılar imanında ondan qabağa keçə bilmədi və ondan sonrakılar da onunla ayaqlaşa bilməzlər. O, Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in gözləri önündə .vuruşur, onun canını qorumağı öz canından üstün tuturdu

Allahın Rəsulu (səlləllahu əleyhi və alihi və səlləm) onu öz bayraqdarı seçirdi. Cəbrail sağ, Mikail sol tərəfdən onu qoruyurdu. Allah onun köməyi ilə İslam Ordusunu qələbəyə çatdırmayınca, meydandan qayıtmazdı. Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam) elə bir gecə dünyadan getdi ki, həmin gecədə Həzrət İsa .asimana çəkilmiş, Həzrət Musanın canişini Yuşe ibni Nun dünyadan getmişdi

Həzrət elə bir halda dünya ilə vidalaşdı ki, özündən sonra ٧٠٠ yüz dirhəmdən başqa heç bir mal-dövlət qoymamışdır. Bu pulu da öz maaşından saxlamışdı ki, ailəsinə xidmətçi alsın. (Elə bu vaxt qəhər Həzrətin boğazını tutdu və ağlamağa başladı. Sonra özünü təqdim etməyə başlayıb buyurdu:) Mən elə bir ailədənəm ki, Allah hər növ pisliyi, çirkinliyi onlardan uzaqlaşdırmış və onları yaxşı-yaxşı pakizə

etmişdir. Mən elə bir ailədənəm ki, Allah onları sevməyi Öz kitabında (müsəlmanlara) vacib buyurmuşdur:

De (ey Peyğəmbər): sizin hidayətiniz üçün çəkdiyim əziyyətlərin qarşısında, mənim yaxın adamlarımı sevməkdən başqa heç bir muzd istəmirəm Hər kəs yaxşı işlər görsə, Biz onların hədiyyələrini (savablarını) artırırıq.(١) Bizi sevmək Allahın işarə etdiyi həmin həsənədir.(٢)

Sonra İmam Həsən (əleyhis-salam) minbərdən enib oturdu.

## XALQIN İMAM (əleyhis–salam)–A BEYƏTİ

Elə bu vaxt Əbdüllah ibni Abbas o həzərətin qarşısında durub dedi: Ey camaat! Bu Həzrət, sizin Peyğəmbərinizin övladı, imamınızın canişinidir. Ona beyət edin! Bu vaxt Həzrət Əli (əleyhis-salam)-ın vəfalı dostlarından və ordusunun etimadlı sərkərdələrindən olan Qeys ibni Səd ibni Übadə Ənsari Həzrətə beyət edən birinci şəxs oldu. Sair şəxslər də səmimi qəlbdən bunu qəbul edərək dedilər: Biz onu nə qədər sevirik! Onun haqqı bizə vacibdir!

Beləliklə oradakı müsəlmanlar, habelə ۴٠ minlik ordu İmam Həsən (əleyhis-salam)-a beyət etdilər.

Sonra ucsuz-bucaqsız ölkənin başdan-başındaa icra hakimlərinin vasitəsi ilə Həzrət üçün beyət



---

١- [٩] Şura surəsi, ٢٣.

٢- [١٠] İrşad (Şeyx Müfid), səh.٣۴٨; Əl-müstətrəf.

aldılar. Şamda həkəmiyyət dövründən etibarən özünü xəlifə adlandıran Müaviyə İmam Həsən (əleyhis-salam)-a beyət etməkdən imtina etdi. Öz sözlərində və məktublarında inadkarlığını və o həzrəti rəsmi olaraq tanımadığını bəyan edən ciddi .müxalifətçilik qərarını elan edirdi

Əbül Fərəc İsfahani yazır: Beyətdən sonra İmam Həsən (əleyhis-salam) minbərdən enib hökumət işlərini sahmana saldı, yerli icra hakimləri üçün lazımi əmr və göstərişlər verib İslam ölkəsinə nəzarətə başladı. Əbdullah ibni Abbası Bəsrənin valisi təyin etdi, döyüşçülərin maaşını ikiqat artırdı. (Bu üsuldan Həzrət Əmirəl-möminin Əliyyibni (.Əbitalib (əleyhis-salam) Cəməl döyüşündə istifadə etmişdi

## İMAM HƏSƏN (əleyhis–salam) XALQI ÖZ VƏZİFƏLƏRİ İLƏ TANIŞ EDİR

İmam Həsən (əleyhis-salam) beyətdən sonra birinci xütbədə Peyğəmbər sülaləsinin uca məqam və mərtəbəsini, onların sair insanlardan üstünlüyünü aydınlaşdırdı, öz proqramını bəyan etdi və xalqı özlərinin vəzifələri ilə tanış edərək buyurdu: Biz Allahın hizbindən və nicat yolu tapanlardanıq. Biz Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm)-in yaxın adamlarından, itrətindən olub, onun pak-pakizə Əhli-beytiyik. Təthir ayəsi bizim haqqımızda nazil olubdur. Biz səqəleyndən (iki ağır əmanətdən) biriyik ki, Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) onu öz canişini kimi təqdim etmişdir. Biz Allahın kitabını (lazımınca) tanıyırıq; hər şeyin şərhi onda vardır və batil ona nə arxadan, nə də öndən–heç bir cəhətdən yol tapa bilməz. Biz (Quranın) təvil və

təfsirində heç vaxt xəta etmərik və Quranın həqiqətlərinə yəqinimiz vardır. Ey camaat, bizə tabe olun; bizə tabe olmaq sizin üçün vacibi-eynidir–əgər Allahın, Onun Rəsulun və ulul-əmrin itaətində olsanız. Vəliyyi-əmr bizik ki, bizə itaət etmək Allahın və Onun Rəsulunun (səlləllahu əleyhi və alihi və səlləm) itaəti ilə birgədir. Allah buyurumuşdur ki, əgər hər hansı bir işdə ixtilafınız olsa, Allaha, Onun Rəsuluna və ulul-əmrə müraciət edin; çünki, onların elmlərinin mənbəyi Haqq elmindəndir.(١) Sizin ən böyük düşməniniz olan şeytani təlqinlərdən çəkinin. Şeytanın yalanlarına aldanan və peşman olduqları zaman artıq peşmançılıqlarının heç bir faydası olmayan, şeytan isə onları .azdırdıqdan sonra uzaqlaşıb və uçurma atdığı kəslərdən olmayın

## İMAM HƏSƏN (əleyhis–salam)–IN MƏKTUBU

İmam Həsən (əleyhis-salam) Müaviyənin bəlkə düz yola hidayət olunub islah olmasını, ağlını başına yığmasını, ona qarşı itaətsizlikdən əl çəkməsini ehtimal verərək, habelə höccəti tamamlasın deyə bir neçə məktub yazdı. Müaviyə də bu məktublara cavab göndərirdi. Həzrətin ona yazdığı ilk məktuba işarə edirik (onu Cündəb Əbdullah Əzüdi :ilə göndərdi). Məktubun mətni belə idi

.Bismillahir-rəhmanir-rəhim

Allahın bəndəsi Həsən ibni Əlidən Müaviyətibni Əbi Süfyana. Salam olsun sənə. Mən sənin haqqında



---

.Nisa surəsinin ٥٨-ci ayəsinə işarə edilmişdir[١١] -١

yeganə Allahın dərgahına həmd edirəm. Böyük Allah, Həzrət Müəhəmməd (səlləllahu əleyhi və alihi və səlləm)-i peyğəmbərliyə seçdi. O, bütün aləmlər üçün rəhmət idi və ilahi risaləti təbliğ etdi. Allah onu bu dünyadan aparanda risalət işində heç bir süstlük, səhlənkarlıq etməmişdi. Nəhayət Allah onun vasitəsilə haqqı aşkar, şirki isə məhv etdi, bütün ərəblərə, xüsusilə Qureyşə izzət, böyük əzəmət bağışladı. Allah Quranda (buyurur: (١)

Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm) bu dünyaya göz yumandan sonra ərəblər qüdrət və hakimiyyət uğrunda bir-biri ilə çəkişməyə başladılar. Qüreyş biz Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm)-in tayfasından və ailəsindənik deyə iddia edirdi. Camaat da bu sözü bəyənib haqq saydılar. Sonradan biz Qureyşlə ehticac(٢) etdik, necə ki, onlar ərəblərə ehticac etmişdilər. Amma Qureyş bizim haqqımızda insafsızlıq etdi. Çünki biz Peyğəmbərin Əhli-beyti Qüreyşlə ehticaca başlayıb onlardan insaflı olmalarını istəyəndə bizi hakimiyyətdən uzaqlaşdırıb bizə qarşı zülm, düşmənçilik və müharibə etməyə başladılar. Əlbəttə biz onlarla çəkişmədik. Ona görə ki, Allah dininə zərər dəyəcəyindən qorxur, münafiqlərin və .əhzabların(٣) intiqam almaq üçün fürsət tapacaqlarından ehtiyat edirdik



---

Zuxruf surəsi, ۴٣[١٢] -١

Haqqı isbat etmək üçün dəlil-sübut, şahid gətirilməsi[١٣] -٢

Əhzab İslamın əvvəllərində başda Müaviyənin atası Əbusüfyan olmaqla bütün[١۴] -٣ münafiq və yəhudilərin əlbir olub islamı məhv etmək üçün Mədinəyə gəldikləri və Əhzab yaxud Xəndək müharibəsini yaradanlara deyilir. Bu müaribə Həzrət Əlinin qüdrətli əlləri ilə Əmr ibni Əbdəvidin–ən güclü ərəb cəngavər pəhləvanının qətlə .yetirilməsi ilə demək olar ki, sona çatdı

Lakin bu gün sənin iddia etdiyin işə təəccüb edirəm! Bu iş üçün azacıq da olsa, haqqın yoxdur. Sən nə dindarlıq nəzərindən fəzilətli adam kimi tanınmısan, nə də İslamda təqdirəlayiq keçmişin var. Sən əhzabdan və Allahın Rəsuluna (səlləllahu əleyhi və alihi və səlləm) qarşı ən qatı, kinli düşmən olan Qüreyş başçılarından birinin (Əbusüfyanın-müt.) oğlusan. Tezliklə o dünyaya qayıdandan sonra biləcəksən ki, axirət aləmi kimin xeyrinədir. Həzrət Əli (əleyhis-salam) canını Yaradana təslim edəndən sonra müsəlmanlar məni özlərinə başçı seçdilər. Bil ki, bu məktubu yazmaqda məqsədim .sənə höccəti tamam etməkdir ki, bununla da Allah qarşısında təqsirli olmayam

İndi əgər haqqa tabe olsan yaxşı, xeyirli bəhrə apararsan. Müsəlmanların da məsləhəti elə bundadır. Batildə israr etməkdən əl çək və sair şəxslər kimi mənə beyət et! Sən bilirsən ki, mən bu işə (xilafətə) Allah yanında və Allahdan qorxan hər kəsdən daha layiqəm. Belə isə zülmdən əl çək və müsəlmanların qanlarının axıdılmasının qarşısını al! Amma bil ki, əgər öz azğınlığını davam etdirsən, mən müsəlmanları tezliklə sənə tərəf göndərəcək, səni mübarizəyə çağıracağam. Qoy Allah bizim aramızda (hökm etsin; çünki O, ən yaxşı hökm edəndir.(١)



---

(Məqatilit-talibin (Əbul Fərəc İsfahani[١٥] -١

## MÜAVİYƏNİN İMAM HƏSƏN (əleyhis–salam)–A CAVABI

:Müaviyə bu məktubun cavabında belə yazdı

Allahın bəndəsi, möminlərin əmiri–Müaviyədən Həsən ibni Əliyə. Salam olsun sənə! Mən bir olan Allahın dərgahına sənin haqqında şükr edirim. Amma bəd; məktubunu aldım. Allahın Rəsulu və onun fəzilətləri haqqında bəyan etdiyini başa düşdüm və bilirəm ki, o, əvvəldən axıra insanların içində ən layiqlisidir. Məktubda yazmısan ki, müsəlmanlar Allahın Rəsulundan sonra canişinlik məsələsində bir-biri ilə çəkişdilər. Mən görürəm ki, sən aşkar şəkildə Əbu Bəkr Siddiqə, Ömər Faruqə, Əbu Übeydə Əminə və Allahın Rəsulunun dostlarına, ənsar və mühacirdən olan yaxşı insanlara töhmət vurursan. Sənin bu sözlərin mənim üçün heç xoşagələn olmadı. Sən bizim və xalqın nəzərində paxıllıq və töhmətlə tanınmamısan. Mən istərdim ki, sən həmişə .layiqli sözlər deyəsən ki, hamı səni yaxşılıqla yad etsin

Bu ümmət Peyğəmbərin canişini haqqında ixtilafa düşəndən sonra heç vaxt sizin fəzilətinizi, parlaq, gözəl keçmişinizi və Rəsulullahla yaxınlığınızı unutmadılar, İslamdakı məqam və mənzilətinizi inkar etmədilər. İslam ümmətinin əqidəsi bu idi ki, hakimiyyət Qüreyşin ixtiyarında olmalıdır. Qureyşin də arasında Allahın əmrlərini icra etməkdə qabaqcıl, bacarıqlı olan bir nəfər bu işi öhdəsinə almalıdır. Buna görə də onlar Əbu Bəkri seçdilər. Amma bu seçki sizin qəlblərinizdə kin yaratdı. Əgər müsəlmanlar sizin aranızda Əbu Bəkrin yerinə layiqli bir nəfər tapsaydılar heç vaxt ondan üz .döndərməzdilər

səh:٣٣

Sən öz məktubunda məni sazişə çağırmışsan. Lakin indi mənimlə sizin aranızdakı münasibət Peyğəmbərdən sonra sizinlə Əbu Bəkrin arasında yaranan vəziyyət kimidir. Əgər mən sənin xalqın işlərini nizama salmaqda, əmvalı (dövlət vergilərini) toplamaqda və düşmənlərin qaşısında dayanmaqda daha bacarıqlı və işbilən olduğunu bilsəydim, hökmən sənə müsbət cavab verərdim. Amma bilirəm ki, mən hökumət işlərini idarə etməkdə səndən təcrübəliyəm; yaşım sənin yaşından çox, siyasi agahlığım səndən artıqdır. Buna görə də mənim fərmanıma itaət et və bil ki, hakimiyyət məndən sonra sənə həvalə olunacaq. Hal-hazırda İraqın beytül-malını sənin ixtiyarında qoyacaq, hansı məntəqəsini istəsən, sənə tapşıracağam ki, sənin tərəfindən əmanətdar bir şəxs hər il onları yığıb yanına gətirsin. Eləcə də heç bir iş sənin nəzər və məşvərətin olmadan görülmüyəcək və Allahın fərmanını yerinə yetirdiyin hər işdə sənin əmrlərinə itaət olunacaq.(۱)

Mədaini yazır: Müaviyə məktubun sonunda İmam Həsən Müctəbaya (əleyhis-salam) xitabən yazdı:

Sənin atan Osmanın hökumətinin devrilməsində çox çalışdı. Nəhayət Osman məzlumcasına öldürüldü və Allahdan, onun qisasını almasını istədi. Hər kəsin intiqamını Allah alsa, heç nə itirməz. Sonra sənin atan hakimiyyəti zorla ələ keçirib müsəlmanların vəhdətini pozdu. Buna görə də cihad və islamda onun kimi qabaqcıl olan şəxslər onunla saziş etmədilər. Lakin atan iddia etdi ki, onlar əhd-peymanlarını pozublar. Buna görə də onlarla müharibəyə başladı, qanlarını axıtdı və Rəsulullahın hərəminə qarşı



---

۱- [۱۶] Əbul Fərrəc İsfahani (Məqatilit-talibin).

hörmətsizlik etdi. Bu müharibədən sonra bizdən beyət istəmədən yanımıza gəldi. Biz onunla müharibə etdik. Axırda iş o yerə çatdı ki, hər bizimiz bir hakim seçdik ki, xalqın məsləhəti və mənafeyinə olan, İslam ümmətinin vəhdətinə, aralarında ülfət yaranmasına səbəb olan əsasda hökm etsinlər. Biz o iki nəfərlə, sənin atanla möhkəm əhd bağladıq ki, o iki hakimin dediklərini sözsüz qəbul edək. Sən də hakimlərin necə hökm etdiklərini, Əlini xilafətdən saldıqlarını yaxşı bilirsən. Amma Allaha and olsun ki, o, bu hökmə etina etmədi və Allahın fərmanı üçün az da olsa gözləmədi. İndi isə məni atanın meyar bildiyi bir hökmə necə dəvət edirsən? Hansı ki, o özü bu hökmdən xaric .olmuşdur. İndi yaxşı fikirləş və dinini tap! Vəssalam

Qeyd etmək lazımdır ki, bu məktublar İslam ölkəsinin hər yerinə yayılır, zəif adamlar .bunun mənfi təsiri altına düşürdü

## MÜAVİYƏNİN FƏALİYYƏTİ

Müaviyə Həzrət Əli (əleyhis-salam)-ın şəhadət xəbərini eşidəndən sonda iki əsaslı :tədbirə əl atdı

Bütün qüvvələrini səfərbər edib İmam Həsən (əleyhis-salam)-ın hakimiyyətinin-۱ əsasları möhkəmlənməzdən öncə onu aradan götürməyə, hakimiyyətinin təməllərini ;sarsıtmağa çalışırdı

Xaricdən hərbi hücum etməklə yanaşı öz casusluq şəbəkələrini o həzrətin-۲ qoşununun daxilində kəskin surətdə çoxaltdı. O, bu iki işi İraq üzərində qələbənin son .anlarına kimi davam etdirdi

Müaviyə İmam Həsən (əleyhis-salam)-ın köməkçiləri arasında Əmr ibni Həris, Əşəs ibni Rəbi

səh:۳۵

və s. kimi ürəklərində Əhli-beyt (əleyhis-salam)-a qarşı kin-küdurət və düşmənçilik bəsləyən, zərbə vurmaq üçün münasib fürsət gözləyən münafiqlərin və xaricilərin yanına casuslar göndərdi. Müaviyə onların hər birinə yazdı ki, əgər Həsəni qətlə yetirsən ٢٠٠ min dirhəm verəcək, öz qızlarımdan birini sənə ərə verəcək və Şam .qoşunlarından birini sənə tabe edəcəyəm

Onların hamısı məxfi olaraq Müaviyəyə müsbət cavab verib fərmanını icra .edəcəklərini əmin etdilər

### MÜAVİYƏNİN ÖZ ƏLALTILARINA ELANLARI

Müaviyə Həzrət Əli (əleyhis-salam)-ın şəhadətindən sonra öz əlaltılarına belə bir :xəbər göndərdi

Şükür olsun ki Allah, Rəsulullahın canişininin qatili və düşmənlərinin məkr və hiylələri qarşısında sizə kömək etdi. Bir olan Allah, Öz mehr-məhəbbəti və yaxşılığı ilə bəndələri içindən Əliyyibni Əbu Talibi qətlə yetirmək üçün bir kişi seçdi. O kişi qarışıqlıq yaradaraq Əlini öldürdü. Nəticədə onun dostları və köməkçiləri pərakəndə vəziyyətə düşüb dağılışdılar. Bu gün onların böyük şəxsiyyətlərinin və rəhbərlərinin məktubları əlimizə çatıbdır ki, özləri və qəbilələri üçün aman istəyirlər. Bu məktublar sizə çatan kimi var-gücünüzlə, bacarığınızla və bütün təchizatınızla hərəkət edin. Şükr olsun Allaha, Osmanın intiqamını alacaq, öz arzunuza çatacaqsınız. Allah zalımları və kin .toxumu səpənləri məhv edəcək. Vəssalam

## CASUSLARIN GÖNDƏRİLMƏSİ

Casusların göndərilməsi və iğtişaş yaradılması məsələsinə gəldikdə isə, qeyd etməliyik ki, Müaviyə məxfi olaraq Himyər qəbiləsindən bir nəfəri Kufəyə, Bəni Qeyn qəbiləsindən bir nəfəri isə Bəsrəyə göndərdi ki, bu şəhərlərin vəziyyəti barədə xəbər versinlər və İmam Həsən (əleyhis-salam)-ın tərəfdarları arasında iğtişaş yaratsınlar. Amma Həzrət bu iki casusun göndərilməsindən xəbər tutdu və əmr etdi ki, qəssabxananın yaxınlığında sakin olan himyərli kişini tutsunlar. Tutulduqdan sonra dərhal hökm verdi ki, boynunu vursunlar. Sonra Bəsrəyə bir məktub yazaraq əmr etdi (ki, Müaviyənin casususu tutub dərhal boynunu vursunlar.(١

## QƏTL HİYLƏSİ

Müaviyə İmam Həsən (əleyhis-salam)-ı qətlə yetirmək üçün ۴ nəfəri: Əmr ibni Həris, Əşəs ibni Qeys, Həccar ibni Əbcər və Şeys ibni Rəbini seçdi. Onların hər birinə nəzarət etmək üçün əlavə bir nəfər casus da təyin etdi ki, həvalə edilən işdən boyun qaçırmasınlar. O, İmam Həsən (əleyhis-salam)-ı qətlə



---

.(İrşad (Şeyx Müfid[١٧] -١

yetirmək üçün ١٠٠ min dirhəm pul, Şam qoşunlarından birinin sərkərdəliyi və qızlarından birini mükafat kimi təyin etmişdi. Bu xəbər İmam Həsən (əleyhis-salam)-a çatanda zirehli paltar geyindi. Çox ehtiyatla hərəkət etməyə başladı; əgər zirehli paltar .geyinməsəydi, namaza getməzdi

## MÜAVİYƏNİN ORDUSU

Müaviyənin bütün arzusu Osmanın ölümündən sonra xilafətə çatmaq idi. Bu məqama çatmaq yolunda əlindən gələni əsirgəmirdi. Heç vaxt fürsəti əldən vermir, heç bir cinayətdən çəkinmirdi. Həzrət Əli (əleyhis-salam)-ın xilfəti dövründə fitnə salmaq, təxribatçılıq və iğtişaş salmaqdan əl çəkmədi. Müxtəlif hiylələrə əl atdı ki, öz məqsədinə çatsın. Nəhayət Həzrət Əli (əleyhis-salam) şəhadətə çatdı. İmam Həsən (əleyhis-salam)-ın xilafətə seçilməsi xəbəri Müaviyəyə çatdıqda onunla beyət etməkdən imtina edərək onun xilafətini rəsmən qəbul etməmək barəsində son .qərarını elan etdi

Müaviyənin öz məqsədinə çatmaq üçün öz casuslarından bir neçəsini camaatı İmam Həsən (əleyhis-salam)-ın əleyhinə qiyama təhrik etmək üçün İraqa göndərdi. Əlbəttə bu cür casuslar Həzrət Əli (əleyhis-salam)-ın zamanında da Yəmən, Fars və Hicazın bir çox məntəqələrində, hətta İraqın mərkəzi sayılan Kufədə də ümumi halda fəaliyyət göstərirdilər. Lakin İmam Həsən (əleyhis-salam)-ın zamanında bu fəaliyyət .şiddətləndi və onun dairəsi fövqəladə surətdə genişləndi

## MÜAVİYƏNİN HƏRBİ TƏCAVÜZÜNÜN BAŞLANMASI

Nəhayət Müaviyə müharibə üçün hazırlıq görməyə başlayaraq Şam, İordaniya və .Fələstində olan sərkərdələrini onunla birləşməyə çağırdı

## İMAM HƏSƏN (əleyhis–salam)–IN GÖSTƏRİŞİ İLƏ MÜHARİBƏYƏ HAZIRLIQ

Müaviyənin fəaliyyətə başlaması xəbəri İmam Həsən (əleyhis-salam)-a çatanda, Hücr ibni Ədiyə əmr etdi ki, sərkərdələrə və camaata xəbər versin ki, Müaviyə ilə .müharibəyə hazırlaşsınlar

Carçı camaatı namaza çağırdı. Hamı həyəcanlanıb sürətlə məscidə yığıldı. İmam Həsən (əleyhis-salam) göstəriş vermişdi ki, hamı yığılanda mənə xəbər verərsiniz. Az müddətdən sonda Səid ibni Qeys Həmdani Həzrətin hüzuruna gələrək xalqın yığışdığını xəbər verdi və onun məscidə getməsini istədi. Həzrət məscidə gəlib :minbərə qalxdı və buyurdu

Bir olan Allah, Öz bəndələrinə cihadı vacib etmiş, onu (camaat üçün) xoşagəlməz bir .şey adlandırmışdır

Camaat! Əgər xoşagəlməz hadisələr müqabilində səbr etməsəniz, heç vaxt istədiyinizə çata bilməzsiniz. Mənə xəbər çatıb ki, Müaviyə bizim ona qarşı müharibəyə hazırlaşdığımız və Şama tərəf hərəkət etməyimiz barədə xəbər eşidib. Buna görə də öz

ordusu ilə Kufəyə tərəf hərəkət edib. İndi onun sizin torpaqlarınıza soxulmasının .qabağını almaq üçün Nüxəyləyə(١) tərəf hərəkət edin

## İMAM HƏSƏN (əleyhis–salam)–IN TƏRƏFDARLARININ SÜSTLÜYÜ AŞKARA ÇIXIR

Əvvəldə qeyd etdiyimiz kimi, Müaviyənin müxtəsər bir işarəsi ilə döyüşçülər kütləvi şəkildə və qısa müddətdə müharibəyə hazırlaşdılar. Amma İmam Həsən (əleyhis-salam)-a itaət etməyin vacib olmasına, kufəlilərin öz meylləri ilə o Həzrətə beyət etmələrinə baxmayaraq, tarixçilərin yazdıqları kimi, xütbəni qurtarandan sonra orada .olanlardan səs çıxmadı. Ölümsaçan sükut məscidin fəzasını bürümüşdü

Teyy qəbiləsinin rəisi, təcrübəli sərkərdə Ədi ibni Hatəm Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm) və Həzrət Əli (əleyhis-salam)-ın dövründə parlaq keçmişə malik olduğundan müsəlmanlar ona böyük şəxsiyyət kimi baxırdılar. O, bu vəziyyəti müşahidə etdikdə qəzəbindən bədəni lərzəyə düşdü. Minbərin aşağısında durub camaata xitabən dedi: Mən Hatəmi Tainin oğlu Ədiyəm. Sübhanəllah! Sizin bu vəziyyətiniz nə qədər pis və rüsvayçıdır! Siz öz rəhbərinizə–Peyğəmbərinizin oğluna cavab vermirsiniz? Şəhərin məşhur natiqləri hara gediblər? Rahatlıq və əmin-amanlıq çağları dilləri iti qılınc



---

Nüxəylə Kufə yxınlığında, Şam yolunda qüvvələrin müharibə vaxtında yığışan[١٨] -١ .yerin adıdır

kimi idi, indi isə, iş ciddi olanda, tülkü kimi yuvalarına giriblər! (Sonra İmam Həsən (əleyhis-salam)-a xitab edərək dedi:) Ey imam! Allah sənin əlinlə hidayət yollarını açsın, səni pis, xoşagəlməz hadisələrdən amanda saxlasın, yaxşı şeylərə müvəffəq etsin. Biz sənin sözlərini eşidirik, sənin fərmanına vəfalıyıq. Sözlərini canla-başla nuş etdik. Sənin nəzərində olan və əmr etdiyin şeyə itaət edirik. Mən də indi ordugaha tərəf getməyə .hazıram. Hər kəs istəsə mənimlə yoldaş ola bilər

Bu sözlərdən sonrda məsciddən çıxıb Nüxəyləyə tərəf getdi. On min nəfərdən ibarət döyüşçü dostlarına əmr etdi ki, ona qoşulsunlar. Beləliklə İmam Həsən (əleyhis-salam)-ın ordusundan müharibəyə hazır olan ilk şəxs Ədi ibni Hatəm oldu. Ondan sonra Qeys ibni Səd ibni Übadə Ənsari, Məqəl ibni Qeys Riyahi və Ziyad ibni Səsə Təymi növbə ilə ayağa qalxıb camaatı danlayaraq onları cihad meydanına getməyə təşviq etdi. İmamın çağırışına ləbbeyk deməklə Ədi ibni Hatəmin sözlərinə oxşar .sözlər danışdılar

Bu vaxt İmam Həsən (əleyhis-salam) onlara buyurdu: Siz düz deyirsiniz. Mən sizi çoxdandır ki, pak niyyətli, mərd-mərdanə, dəvəti qəbul edən və sədaqətli dost kimi .tanıyıram. Allah sizə gözəl mükafat (əcr) versin! Sonra minbərdən endi

## BİRİNCİ DƏSTƏNİN CƏBHƏ BÖLGƏSİNƏ GÖNDƏRİLMƏSİ

Sonra İmam Həsən (əleyhis-salam) Übeydullah ibni Abbası çağırıb dedi:–Əmoğlu mən, səninlə

birlikdə ۱۲ min süvarini və Quran qarilərini göndərirəm ki, hər biri təklikdə bir dəstəyə bərabərdir. Bu dəstə ilə hərəkət et, onlarla yaxşı rəftar et, üzügülər, təvazökar ol və öz yerini onlarla yaxın et. Bil ki, bunlar Əmirəl-möminin Əli (əleyhis-salam)-ın vəfalı dostlarından qalanlardır. Onları Fəratın kənarı ilə apar. Məskin məntəqəsindən keçəndə Müaviyə ilə qarşılaşacaqsan. Əgər onunla görüşsən hərəkətdən saxlayarsan ki, biz tez sənə çataq. Gərək hər gün müharibə xəbərlərini mənə çatdırasan. Mən Qeys ibni Səd və Səid ibni Qeysi sənə müşavir seçirəm. Bil ki, əgər Müaviyə ilə çarpışsanız, müharibəni ondan qabaq başlama; qoy birinci o müharibəni başlasın. Yalnız belə olan halda onunla vuruşarsan. Əgər sənə bir hadisə üz versə Qeys ordunun sərkərdəsi .olacaq; ona da bir hadisə üz versə Səid ibni Qeys onun canişini olacaq

Übeydullah ibni Abbas hərəkət edərək Şinur və Şahi məntəqələrindən keçdi, Fəratın .sahilindəki kəndləri arxada qoyaraq Məskin məntəqəsinə çatdı

#### İMAM HƏSƏN (əleyhis–salam) MÜHARİBƏ MEYDANINA HƏRƏKƏT EDİR

Bu zaman İmam Həsən (əleyhis-salam) cəbhə bölgəsinə yola düşdü. Camaat da onun ardınca hərəkət etdilər. Həzrət öz əmisi oğlu Müğeyrət ibni Nofəli yerinə qoyub əmr etdi ki, camaatı İslam ordusuna birləşməyə təşviq etsin. Bu hadisəni yaxından müşahidə edənlərdən biri də Haris Həmdanidir. O deyir: İmam Həsən (əleyhis-salam) Nüxəyləyə hərəkət edən zaman döyüşə meyli olanlar

çölə çıxdı, amma camaatın əksər hissəsi şəhərdə qaldı. Bununla belə İmam Həsən on .iki min nəfərlə Mədain ordugahına tərəf yola düşdü

## DÖYÜŞ MEYDANINDAN QAÇMAQ İMAM HƏSƏN (əleyhis–salam)–IN DÖYÜŞÇÜLƏRİNİN ADƏTİ İDİ

İmam Həsən (əleyhis-salam) Kində qəbiləsinin böyüklərindən bir nəfəri dörd min nəfərlə döyüşə göndərdi. O, Ənbar şəhərinə çatdıqda Müaviyə ona əlli min dirhəm göndərib Şam və Ərəbistan yarımadasının bəzi məntəqələrinin hakimliyini ona vədə verdi. Bu sərkərdə dərhal öz yaxın yoldaşlarından iki yüz nəfərlə birlikdə Müaviyənin tərəfinə keçdi. İmam Həsən (əleyhis-salam) bu xəbəri eşidən kimi, Murad qəbiləsindən olan bir nəfəri onun yerinə təyin edərək onunla vəfadarlıq peymanı bağladı ki, əgər dağlar yerindən tərpənəsələr də o tərpənməsin və özündən qabaqdakı sərkərdə kimi süstlük etməsin. Amma o da aldananlara qoşuldu və (Müaviyənin tərəfinə keçdi.(۱

## ?SƏBƏB NƏ İDİ

Bəli, bu vəfasız dostlardan başqa şey də gözləmək olmazdı. Tarixdə oxuyuruq ki, İmam Həsən (əleyhis-salam) cəbhəyə hərəkət edən zaman onunla aşağıdakı qruplar :hərəkət edirdi

;Həzrətin atasının davamçılarının bəziləri-۱



---

.(Xəraic (Rəvəndi[۱۹] -۱

;O Həzrətin özünün davamçılarının bəziləri-۲

Xəvaricdən bir qrupu; Onlar, hər kəsin başçılığı və hər hansı hiylə ilə mümkün olursa-۳ .olsun, Müaviyə ilə müharibəyə üstünlük verirdilər

;Fitnə salanlardan və qənimət axtaranlardan bəziləri-۴

Qəlblərində şəkk olan süst ünsürlərdən bəziləri. Onlar fəqət öz qəbilə başçılarının-۵ (ardınca hərəkət edirdilər və azacıq da olsa, dini əqidələri yox idi.(۱)

Buna görə də qəbilə başçılarından bir neçəsi məxfi məktublarda Müaviyəyə, onun fərmanlarına tabe olacaqlarını elan və onu, özlərinə tərəf hərəkət etməyə təşviq edir, vədə verirdilər ki, onun ordusu yaxınlaşan kimi onun tərəfinə keçəcəklər. İmam Həsən .(əleyhis-salam) bu məktubların məzmunundan xəbərdar oldu

Müaviyə də İmam Həsən (əleyhis-salam)-a yazdığı məktublarda onu sülhə çağırdı. Məktubla bir yerdə Həzrətin dostlarının onu öldürmək və ona qarşı iui-qəsd .hazırlamaq barədə yazdıqları sözləri göndərdi

## ÜBEYDULLAH MÜAVİYƏYƏ QOŞULUR

İmam Həsən (əleyhis-salam) Mədaində bu müşküllərlə qarşılaşan zaman, Müaviyə və Übeydullah–hər ikisi öz orduları ilə, (İmam Həsən (əleyhis-salam)-ın Mədaində çatdığı .gündə) Məskinə çatdılar

Onun sabahı, sübh namazından sonra Müaviyə və Übeydullah arasında qısamüddətli .çarpışmalar oldu



---

.(İrşad (Şeyx Müfid[۲۰] -۱

Axşam Müaviyə ona belə bir xəbər göndərdi:–Həsən sülh haqqında öz qəti qərarını mənə çatdırmış, xilafəti mənə həvalə etmişdir. Əgər yubanmadan mənim tabeçiliyimə keçsən səninlə bir rəhbər kimi rəftar edəcəyəm. Əks halda sizin qüvvələrinizin içinə nüfuz edərək səni özümə müti edəcəyəm. Əgər indi mənə qoşulsan, sənə bir milyon (dirhəm verəcəyəm; yarısını indi, yarısını da Kufəyə girəndən sonra.(۱

Übeydullah gecə ikən qılıncını götürüb yoldaşları və yaxın adamları ilə Müaviyəyə tərəf .yollandı

## QEYS ORDUNU NƏZARƏT ALTINA ALIR

Sübh çağı ordu namaz qılmaq istəyəndə imam-camaatı görmədilər. Məlum oldu ki, o Müaviyənin ordusuna getmişdir. Qəflətən əsgərlərin qəlbi lərzəyə düşdü və az qaldı ki, dağılışsınlar. Amma cəsur pəhləvan Qeys ibni Səd ayağa durub namazı qıldı və sözə başladı. O, öz nitqində süstləşmiş qəlblərə əhval-ruhiyyə verdi və ordu yüksək əhval-.ruhiyyə ilə döyüşə hazırlaşdı

Übeydullahın qaçmasından bir gün sonra Müaviyənin sirdaşlarından və sərkərdələrindən biri olan Büsr ibni Ərtat iyirmi min nəfərlik qoşunla irəli çıxıb bağırdı: Sizin sərkərdəniz (Übeydullah) indi (Müaviyəyə) beyət etmişdir. Həsən də sülhə ?razılaşmışdır. Siz daha niyə özünüzü ölümə verirsiniz

Vəziyyəti belə görən Qeys öz yoldaşlarına dedi:–Qarşınızda iki yol var: ya sərkərdəsiz .vuruşmaq, ya da zillət və xarlıqla beyət etmək



---

.Məqatilit-talibin, səh.۶۴-dən sonra[۲۱]-۱

Onlar döyüşməyi üstün hesab etdilər və Şam əhli ilə döyüşə girişərək onları tar-mar .etdilər

Müaviyə Qeysə məktub yazıb onu sazişə çağırdı. Amma Qeys onun cavabında yazdı: Allaha and olsun, bunu görməyəcəksən! Aramızda yalnız qılınc və nizə hakimlik edəcək. Lakin artıq bu zaman qoşun dəstə-dəstə Müaviyəyə tərəf qaçmağa başlamışdı. Qeys bundan xəbərdar olan kimi vəziyyət haqqında İmam Həsən (əleyhis-.salam)-a bir məktub yazdı

İmam Həsən (əleyhis-salam) məktubu alandan sonra camaatı ümumi yığıncağa çağırdı və narahatlıqla dedi:–Ey camaat, axı sizinlə necə rəftar edim? Bu məktub Qeys ibn Səddəndir. Yazır ki, hətta sizin böyükləriniz də Müaviyənin tərəfinə keçiblər. Allaha and olsun, bu çox pis və dəhşətli əməldir! Siz həmən adamlarsınız ki, atamı Siffeyndə həkəmiyyəti qəbul etməyə məcbur etdiz. O, (sizin istəyinizə görə) bu həkəmiyyəti qəbul etdikdən sonra yenidən onun əleyhinə qalxdınız. O, sizi ikinci dəfə Müaviyə ilə döyüşə dəvət edən zaman, bir daha özünüzdən zəifik və süstlük göstərdiniz. Atamın şəhadətindən sonra elə siz yanıma gəlib razılıq, rəğbət üzündən mənə beyət etdiniz. Mən sizin beyətinizi qəbul etdim və Müaviyənin əleyhinə çıxdım. Təkcə Allah bilir ki, mən nəzərdə tutduğum məqsədə nə qədər ciddiyyətlə əməl etmək istəyirəm. (Yəni Müaviyə ilə müharibədə nə qədər ciddi idim!) İndi atamla etdiyiniz (pis) rəftarı mənə .qarşı da rəva görürüsünüz

## MÜAVİYƏNİN HİYLƏSİ

İmam Həsən (əleyhis-salam) qoşun ilə ordugahda olan zaman Müaviyənin sülh .müzakirəsi üçün göndərdiyi heyətin gəlməsi xəbəri ona çatdırıldı

Yəqubi öz tarixində yazır: Müaviyə Müğeyrət ibni Şöbə, Əbdullah ibni Əmr və Əbürrəhman ibni Ümm ibni Həkəmi vasitəçi kimi İmam Həsən (əleyhis-salam)-ın yanına göndərdi. Onlar İraq böyüklərinin və qəbilə başçılarının İmam Həsən (əleyhis-salam)-ı tutmaq və ya qətlə yetirmək haqqında Müaviyəyə məxfi yazdıqları məktubları da özləri ilə gətirmişdilər. Onlar ordugaha daxil olub İmam Həsən (əleyhis-salam)-ın hüzuruna çatdılar. Amma ordugahdan çıxanda artıq nifaq toxumlarını səpmişdilər. Onlar İmam Həsən (əleyhis-salam)-ın çadırından çıxanda döyüşçülər istər-istəməz onlara baxırdılar. Onlar da başlarını aşağı salıb pıçıldaşmağa başladılar. Biri uca səslə dedi: Yaxşı oldu ki, Allah, Peyğəmbərin oğlunun əli ilə qan axıdılmasının qarşısını aldı, fitnəni yatırtdı və sülh arzusunu yerinə yetirdi. Bunlar bu işlərlə imansız İraq ordusunu .parçalayıb getdilər

## İMAM HƏSƏN (əleyhis–salam)–IN XÜTBƏSİ VƏ İĞTİŞAŞÇILARIN FİTNƏSİ

Bundan sonra İmam Həsən (əleyhis-salam) minbərə çıxdı və bir xütbə oxuyaraq onların hiylələrindən xəbərdar olduğunu anlatdı və buyurdu ki, təfriqə yaratmaqdan əl çəksinlər ki, hiyləgər düşmənlə mübarizə apara bilsinlər. Xütbənin axırında Müaviyənin təklif etdiyi sülh haqqında danışdı və buyurdu: Müaviyə bizi elə bir işə dəvət edir ki, .onda nə izzət, nə mürüvvət; nə ədalət, nə də insaf vardır

Əgər fədakarlığa, ölümə hazırsınızsa onun bu təklifini rədd edək, onu iti qılıncla mühakimə olunmaq üçün Allahın yanına göndərək; yox əgər dünyada qalmağı .istəyirsinizsə sizinlə razılaşaq

Həzrətin bu sözlərindən sonra döyüşçüləri onun əleyhinə təhrik etmək üçün münasib fürsət gözləyən iğtişaşçılar bu nəsihətlərini şəxsi qərəzçiliyə yozaraq bir-birinə dedilər: Görəsən bu sözlərdən onun məqsədi nədir? Onların arasında xəvaricdən bir neçəsi dedi: And olsun Allaha, bu kişi kafir oldu! Bu zaman Müaviyənin məxfi məmurlarından biri uca səslə dedi: Məskin cəbhəsindəki İraq ordusu məğlub olmuş, Qeys ibni Səd öldürülmüşdür. İndi də Şam ordusu yola düşmüşdür. Tezliklə bizə çatacaqdır. Xəvaricin təkfir səsləri ilə eyni zamanda olan bu əsassız şayiələrin ardınca imansız və vicdansız adamlar vəhşəcəsinə İmam Həsən (əleyhis-salam)-ın çadırına həmlə edib var-yoxunu qarət etdilər. Hətta o Həzrətin səccadəsini belə ayaqlarının altından çəkib .apardılar

## XƏVARİCLƏRİN İMAM HƏSƏN (ƏLEYHİS–SALAM)–A QARŞI SUİ–QƏSDİ

İmam Həsən (əleyhis-salam) öz döyüşçülərindən bu əməli gördükdən sonra məyus, qəlbi sınmış halda orduda qalmağın qeyri-mümkün olduğunu gördüyündən, ata minib dostlarının və mömin davamçılarının tərəfindən mühafizə olunan halda Mədainin ağ sarayına tərəf yola düşdü. Saraya daxil olmamışdan bir az əvvəl xəvaricin tərs adamlardan biri kimi tanınan Cərrah ibni Sinan Əsədi Həzrətə

həmlə edərək xəncərlə onu yaraladı. O həmlə edəndə sən də əvvəllər müşrik olan .atan kimi müşrik olmusan! deyə bağırırdı

Həzrətin dostları Cərrahı tutub cəhənnəmə vasil etdilər. Həzrət çoxlu qan itirdiyindən onu Mədainin ağ sarayına apardılar. Orada Səd ibni Məsud Səqəfi ona keşik çəkirdi. Müaviyənin casusları tərəfindən həzrətə sui-qəsd edilməsi xəbəri tez bir zamanda hər yerə yayıldı. Bu iş İmam Həsən (əleyhis-salam)-ın halsız və məyus döyüşçülərini daha .da süstləşdirdi və onların dəstə-dəstə ordudan qaçmaqlarına səbəb oldu

## KUFƏLİLƏRİN HİYLƏLƏRİNİN İFŞA OLUNMASI

Müaviyə İmam Həsən (əleyhis-salam)-a bir məktub göndərdi. Bu məktublarla yanaşı, münafiqlərin, İraq və Kufənin qəbilə başçılarının (Müaviyəyə) vəfalı qalacaqlarından, ona itaət edəcəklərindən söz açan məktublarını da göndərdi. Bu məktubda yazmışdı ki, sənin səhabələrin atanla yola getmədikləri kimi, səninlə də yola getməyəcəklər. .İndi onların yazdıqları məktubları sənə göndərirəm

Əllamə Məclisi yazır: Bu məktub İmam Həsən (əleyhis-salam)-a çatandan sonra Müaviyənin və münafiq səhabələrin yazdıqları məktubları oxudu. Übeydullahın qaçmasından, onun qoşununun süstlüyündən və aralarındakı ixtilaf və nifaqdan xəbər tutdu. Höccət tamam olsun deyə, yenidən öz döyüşçülərinə xitabən buyurdu: Mən bilirəm ki, siz mənə qarşı məkr işlədirsiniz. Lakin indi höccətimi

sizin üçün tamam edirəm. Sabah bir yerə yığışın və beyətinizi pozmayın. Allahın !qəzəbindən qorxun

Sonra Həzrət dediyi yerdə on gün dayandıqdan sonra cəmisi dörd min nəfər oraya yığışdı. İmam Həsən (əleyhis-salam) minbərə çıxıb buyurdu: Təəccüb edirəm həyası və dini olmayan kəslərdən! Vay olsun sizə! And olsun Allaha, Müaviyə, məni öldürməyiniz müqabilində sizə zamin olduğu şeylərə heç vaxt vəfa etməyəcək. Mən haqq dini sizin üçün bərqərar etmək istəyirdim, amma siz mənə kömək etmədiniz. Mən Allaha təklikdə də ibadət edə bilərəm. Lakin Allaha and olsun ki, əgər hökuməti Müaviyəyə həvalə etsəm, siz Bəni-üməyyə dövlətində heç vaxt asudəlik, rahatlıq və şadlıq görməyəcəksiniz. Onlar sizə cürbəcür əzab verəcəklər. İndidən görürəm ki, necə sizin övladlarınız onların övladlarının evlərinin qapısında durub su və yemək .istəyirlər, onlar da vermirlər

Allaha and olsun, əgər köməkçim olsaydı, heç vaxt işi Müaviyəyə həvalə etməzdim. (Çünki Allaha və Onun Rəsuluna and içirəm ki, xilafət Bəni-üməyyəyə haramdır.(١)

## İMAM HƏSƏN (ƏLEYHİS-SALAM)-IN VASİTƏSİLƏ HİYLƏLƏRİN İFŞA EDİLMƏSİ

İmam Həsən (əleyhis-salam) Kufə böyüklərinin Müaviyəyə göndərdikləri məktublardan xəbər tutduqdan sonra öz tərəfdarları üçün bu xütbəni söylədi: Ey camaat! Vay olsun sizə, elə güman



---

.(Cəlaül-üyun (Məclisi[٢٢] -١

edirsiniz ki, məni öldürsəniz, yaxud qolu bağlı Müaviyəyə təhvil versəniz cəmiyyətdə rütbə və məqam kəsb edəcək, kamal və fəzilətə çatacaqsınız? Allaha and olsun, Müaviyə sizə vədə verdiklərinin heç birinə əməl etməyəcəkdir. Görürəm ki, əgər ona beyət edib və sülh bağlasam, sizi qızılla satın alınmış qul kimi iş başına qoyacaq və çörək, su üçün dilənçilik əllərinizi uzadacaq, əsir olunmuş heyvanlar kimi yalnız ən az maaşınızı alacaqsınız. Mən belə görürəm ki, sizlər Bəni-üməyyənin əsirləri olacaq, onlardan su və çörək istəyəcəksiniz, onlar isə sizi doyuzdurmayacaq, su verməyəcəklər. Bu cəhalətin üzü qara olsun, xain əllər kəsilsin! Allaha and olsun, çox .keçməz zalım və məzlumun hansının qələbə çalacağı məlum olar

Bu xütbədən sonra xainlərin xəyanətinin İmam (əleyhis-salam)-a çatması məlum oldu. Onlar üzr istəməyə, tövbə etməyə başladılar. Lakin İmam Həsən (əleyhis-salam) bildirdi ki, kufəlilər hiylə, məkr, saxtakarlıq və xəyanət əhlidir, onların sözlərinə .inanmaq, etimad etmək olmaz

### İMAM HƏSƏN (ƏLEYHİS-SALAM)-IN QARŞISINDA İKİ YOL

Kufəlilərin Müaviyə ilə döyüşə hazır olmadığı bir həqiqət kimi üzə çıxdığı və onlara hüccət tamam olduğu zaman İmam Həsən (əleyhis-salam)-ın qarşısında yalnız iki yol qalmışdı: ya həmin azsayı qoşun ilə döyüşü davam etdirsin, ya da Müaviyə ilə sülh edib .xilafətdən kənara çəkilsin

Birincinin nəticəsi gün kimi aydın idi. Çünki, bir tərəfdən həqiqi dostların azlığı, digər tərəfdən isə

münafiqlərin, iğtişaşçıların hiylələri ilə belə, müharibə hökmən ağır məğlubiyyətlə nəticələnəcəkdi. Çünki İmam Həsən (əleyhis-salam) bir ümmətin rəhbəri kimi döyüşə girdiyi üçün bəziləri onunla bir olacaqdı. Amma onlar ətrafda pərakəndə halda olan xalis şiələr idi. Hətta əgər onlar bir yerə yığışsaydılar belə, İmam Həsən (əleyhis-salam) iki cəbhədə vuruşmalı olacaqdı. Birinci cəbhə Müaviyə və onun döyüşçülərindən ibarət olan xarici dəstə, ikinci cəbhə isə daxildəki münafiqlər, yəni Müaviyənin tərəfini saxlayan, müsəlmançılıq əqidələri olmayan və Əhli-beyt (əleyhimüs-salam) ilə düşmən olan, ya da heç olmasa Əhli-beyt və İmam Həsən (əleyhis-salam)-ı tanımayan zahiri müsəlmanlar idi. Buna görə də Həzrət bu cür vəziyyətdə ikinci yolu–sülhü seçərək xilafətdən əl çəkdi ki, heç olmazsa, müsəlmanların qanlarının axıdılmasının, daxili müharibənin genişlənməsinin qarşısını .alsın

## BEŞİNCİ HİSSƏ

### İMAM HƏSƏN (əleyhis–salam)–IN MÜAVİYƏYƏ SÜLH HAQQINDAKI MƏKTUBU

:İmam Həsən (əleyhis-salam) bir məktubda Müaviyəyə belə yazdı

Mənim xeyrim haqqı dirçəltmək, batili məhv etməkdədir. Lakin mən bu camaatdan məyus olmuşam. Sən isə öz istəyinə çatırsan. Mən xilafətdən əl çəkərək bu hökuməti sənə tapşırıram. Sonradan

qeyd edəcəklərim şərtlərə əməl etməyini səndən istəyirəm və Allahı ona şahid .tuturam. Qiyamət günü Allah bu sülhün şərtləri barəsində bizim aramızda hakimdir

Müaviyə də Əbdüllah ibni Haris ibni Nofəl ilə (onun anası Müaviyənin bacısı idi) təkcə axırını imzalayıb möhürlədiyi ağ məktubu İmam Həsən (əleyhis-salam)-a göndərdi. Dedi ki, ürəyin nə istəyirsə, hansı şərtlər nəzərinə gəlirsə onu da yaz, mən hamısını .qəbul edərəm

.Əbdüllah bu ağ məktubu gətirdi və Həzrət sülhün maddələrini və şərtlərini yazdı

## SÜLHÜN MADDƏLƏRİ

.Bismillahir-rəhmanir-rəhim

Bu, Həsən ibni Əliyyibni Əbitaliblə Müaviyətibni Əbi Süfyan arasında bağlanan sülhün şərtləridir. Onlar razılaşırlar ki, o müsəlmanların vilayəti (rəhbərliyi) Müaviyəyə həvalə edilsin. Bu şərtlə ki, o, (Müaviyə-müt.) Allahın kitabı, Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in sünnətinə əməl etsin; həmçinin onun özündən sonra xəlifə, vəliəhd seçməyə haqqı yoxdur: Həsən onun canişini olacaqdır. Əgər Həsənə bir hadisə üz versə rəhbərlik işi onun qardaşı Hüseynə çatacaqdır. Camaatın (şiələr) hər yerdə (Şamda, İraqda, Hicazda və Yəməndə) gərək canları, malları, namusları, övladları toxunulmaz olsun. Müaviyə Əmirəl-möminin Əliyyibni Əbitalibi söyməyi, onun barəsində nalayiq sözlər tərk etməli, onu yaxşılıqla yad etməlidir. Cəməl və Siffeyn müharibələrində Əmirəl-mömininin tərəfində vuruşanların övladlarının hüquqları

maaşları) beyltül-maldan ödənilməlidir. Müaviyə özünü möminlərin əmiri) adlandırmamalıdır. O, Allahla, habelə Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in nəvəsi Həsən ibni Əli ilə peyman bağlayır ki, bu şərtlərə əməl etsin. Həsən ibni Əli və onun qardaşı Hüseyn ibni Əliyə, Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) sülaləsindən olanların heç birinə əzab-əziyyət və zülm etmək fikrində olmasın; istər aşkar, istərsə də məxfi şəkildə onların barəsində pis fikrdə olmasın və bir kəsi qorxutmasın. Bu şərtlər hər kəsin barəsində, hər yerdə olursa olsun, riayət (olunmalıdır.(١)

.Bu sülhnamə ۴١-ci hicri ili, rəbiül-əvvəlin ٢۵-də imzalandı

## MÜAVİYƏ KUFƏYƏ GƏLİR

Sülh bağlandıqdan sonra Müaviyə Kufəyə tərəf hərəkət etdi. Cümə günü Kufənin .yaxınlığındakı Nüxəyləyə çatdı

İki ordunun Nüxəylədə olduğu vaxt Müaviyənin əlinə manevr etmək üçün münasib fürsət düşmüşdü. Buna görə də camaatı başına yığıb sözə başladı, dedi: Bir ümmət öz peyğəmbərindən sonra ikitirəliliyə, ixtilafa məruz qalmışsa, hökmən haqq əhli batilə qalib gəlmişdir (Bu sözün öz əleyhinə tamam olduğunu anladıqda, dərhal dedi:) Əlbəttə, İslam ümməti bu qaydadan istisnadır. Elə bilirsiniz ki, mən namaz, zəkat, həcc və s. bu kimi məsələlərə görə sizinlə müharibə etdim? Əsla! Mənim sizinlə



---

Təbərini tarixi, ۴-cü cild, səh.١٢٢; Təzkirətül-əimmə, səh.١١١; Mənaqib (İbni[٢٣] -١ .Şəhraşub), ٢-ci cild, səh.١۶٧

müharibəm yalnız ona görə idi ki, sizə hökumət edəm, sizi öz hökmranlığım altında saxlayam. Allah da onu sizin istəmədiyinizə baxmayaraq, mənə qismət etdi. Bilin ki, Həsən ibni Əliyə sülh müqaviləsində bəzi vədlər verdim və söz verdim ki, onlara əməl edim. Bilin ki, mən elə bu andan etibarən müqavilənin bütün şərtlərini tapdalayıram. (Onların heç birinə əməl etməyəcəyəm.(١)

Beləliklə, Kufə camaatından beyət aldı. Camaat da ona beyət etdi. Sonra minbərə çıxıb sözə başladı. Axırda Həzrət Əli (əleyhis-salam)-a nalayiq sözlər deməyə başladı. İmam Hüseyn (əleyhis-salam) dözmədi, ayağa qalxdı ki, o məlunun cavabını versin. Lakin İmam Həsən (əleyhis-salam) onun əlindən tutub əyləşdirdi və özü ayağa qalxıb buyurdu: Ey Müaviyə dilin qurusun, Əlinin adına nalayiq sözlər deyirsən?! Mən Həsənəm, atam Əmirəl-möminin Əliyyibni Əbitalibdir. Sənin atan Səxrdir; mənim anam Fatimə, sənin anan isə Hinddir;(٢) mənim babam Allahın Rəsulu, sənin baban isə .Hərbdir; mənim nənəm Xədicə, sənin nənən isə Füteylədir

Ey Müaviyə! Hər kəsin əsil-nəsəbi itib-batmış, nəsli alçaq, qədimdən şərr, küfr və !nifaqı çoxdursa, Allahın lənəti ona olsun



---

.İrşad (Şeyx Mufid), Məqatilit-talibin Əbulfərəc İsfahani[٢۴] -١

Həzrət Fatimə iffət, namus əzəmətin təcəssümü və İslam qadını üçün lazım olan[٢۵] -٢ bütün ali-insani xüsusiyyətlərə malik idi. Həzrət Peyğəmbərin vəfatından sonra Cəbrəil ona nazil olurdu.Hind isə cahiliyyət dövdündə məşhur zinakarlardan sayılırdı ki, qəbul günləri evlərinin qarşısına bayraq sancırdılar. (Məhz buna görə də Peyğəmbər təzə müsəlman olan qadınlarla əhd bağlayırdı ki, bir daha zina etməsinlər.) Ühüd (döyüşündə də Həzrət Həmzənin ciyərini çeynəmişdi. (Mütərcimdən

Məclisdə oturanların hamısı amin dedilər. Burada Müaviyə mat-məəttəl, heyrət bürümüş və peşman olmuş halda məclisi tərk etdi.(1)

### İMAM HƏSƏN (əleyhissalam)–IN XÜTBƏSİ

Müaviyə Kufəyə daxil olduqdan bir neçə gün sonra məscidə gəldi. İmam Həsən (əleyhis-salam) da oraya gəldi. O, İmam Həsən (əleyhis-salam)-a dedi ki, minbərə çıxıb camaata desin ki, xilafət mənim haqqımdır. Həzrət minbərə çıxdı, Allaha həmd-səna etdikdən sonra buyurdu:

Camaat! Bilin ki, ən yaxşı qoçaqlıq–təqva və pərhizkarlıq; ən böyük ağılsızlıq və axmaqlıq isə Allah qarşısında məsiyət, günah etməkdir.

Ey camaat! Əgər məğribdən məşriqə kimi məndən və qardaşım Hüseyndən başqa babası Rəsulallah olan bir kəs axtarmaq istəsəniz, heç vaxt tapa bilməzsiniz. Allah sizi Həzrət Mühəmməd (səlləllahu əleyhi və alihi və səlləm) ilə hidayət etdi, amma siz onun Əhli-beytini tək qoydunuz. Müaviyə, mənim layiq olduğum və mənə məxsus olan bir işdə mənimlə müharibə etdi, amma mən dost tapmadığım üçün, habelə ümmətin məsləhəti və sizin sağ qalmağınız üçün müharibədən əl çəkdim. Siz mənimlə beyət etmişdiniz ki, mən hər kəslə sülh etsəm, sülh edəcək və hər kəslə müharibə etsəm, onunla müharibə edəsiniz. Mən bu ümmət üçün sülh edib qan tökülməsinin qarşısını almağı məsləhət gördüm.



---

1- [26] İrşad (Şeyx Müfid), səh.355.

Hər halda bu iş, Allahın haqqın qələbəsini istədiyi, onun səbəblərini müyəssər edəcəyi vaxta qədər müsəlmanlar üçün bir fitnə, münafiqlər üçün əhəmiyyətsiz, kiçik .mənfəətdir

### QEYS MÜAVİYƏYƏ BEYƏT EDİR

Sülhdən sonra Müaviyə Qeys ibni Sədi çağırdı ki, ona beyət etsin. O, şücaətli, güclü, pəhləvan cüssəli və ucaboylu bir kişi idi. Ata minəndə ayaqları yerə çatırdı. Qeys Müaviyəyə dedi: Mən and içmişəm ki, səninlə görüşməyəm. Bizim aramızda yalnız nizə və qılınc olacaq. Müaviyə bu andı götürmək üçün nizə və qılınc hazır etdi və onu çağırdı. Qeys dörd min nəfərlə bir tərəfdə durmuşdu və Müaviyə ilə müxalifət məqamında idi. .İmam Həsən (əleyhis-salam) onun beyət etməsini əmr etdikdən sonra o beyət etdi

## ALTINCI HİSSƏ: SÜLHÜN SƏBƏBLƏRİ

### CAMAATIN İMAM HƏSƏN (ƏLEYHİS–SALAM)–IN HÖKUMƏTİNƏ DÖZÜMÜ YOX İDİ–۱

İmam Həsən bilirdi ki, ona beyət edənlər öz əhdlərində möhkəm və sabit deyillər. Çünki, Həzrət Əmirəl-möminin Əli (əleyhis-salam)-ın beş illik

xilafət dövrü göstərdi ki, camaatın məsum imamların rəhbərliklərini qəbul etməyə .hazırlıqları yoxdur

Həzrət Əli (əleyhis-salam)-a həddindən artıq şövq, sevinc və rəğbətlə etdikləri beyət (qısa müddətdən sonra süstləşdi və beyəti pozdular.(۱

İmam Həsən (əleyhis-salam) isə elə əvvəldən xəvaric, qənimət həvəskarları, qəbilə başçılarının tərfdarları, rahatlıq sevən və süst əqidəli adamlarla üzbəüz idi. Belə ki, onlar istədiklərini əldə etmək üçün özlərini zəhmətə salmağa ümumiyyətlə hazır deyildilər. Yalnız çoxlu danlaq və məzəmmətlərdən sonra Müaviyə tərəfə getməyə .hazırlaşdılar

## İMAM HƏSƏN (ƏLEYHİS-SALAM)-IN NƏZƏRİNDƏ SÜLHÜN SƏBƏBLƏRİ-۲

Camaatın əhval-ruhiyyəsinin hansı səviyyədə olduğunu İmam Həsən (əleyhis-salam)-ın bu çıxışı daha yaxşı aydınlaşdırdı. O Həzrət Mədain ordugahında öz döyüşçülərinə :buyurdu

Siz Siffeyn yoluna dünyanızı dininizdən arxada qoymuşdunuz. Amma bu gün dininizi dünyanızın arxasında qoymuşsunuz. Siz keçmişdə (Siffeyn və Nəhrəvan müharibələrində) öldürülən iki dəstənin arasında orta mövqeydəsiniz: Siffeyndə öldürülənlərin halına ağlayır, Nəhrəvanda öldürülənlərin intiqamını bizdən almaq (istəyirsiniz.(۲

Şeyx Müfid yazır: İmam Həsən (əleyhis-salam) Hücr ibni Ədini qoşun yığmağa əmr etdi. O, camaatı



---

Əlavə məlumat almaq üçün Əmirəl-möminin Əli (ə)-ın başına nələr gəldi kitabına[۲۷] -۱ .müraciət edə bilərsiniz

.Məlahim və fitən-Seyyid ibni Tavus[۲۸] -۲

cihada təşviq edirdi. Lakin axırda xəbər verdi ki, mən, öz qəbiləmdən olan min nəfər döyüşçü ilə hazıram. Amma yerdə qalanların bəziləri şəkkdə, tərəddüddədir. Bəziləri fitnəçilərin əlində oyuncaq olaraq qənimət yığmaq fikrindədirlər. Bir hissəsi də cahiliyyət təəssüblərinə malik olmaqla İslam məktəbinin qayda-qanunları ilə tərbiyə olunmayıblar.(١)

### ٣– CAMAATIN FİKRİ BİR DEYİLDİR

İmam Həsən (əleyhis-salam) öz döyüşçüləri barəsində belə buyurdu:

Onlardan heç birinin fikri və rəyi digəri ilə eyni deyildir. Hər birinin öz nəzəri var, qəlbləri bir-birlərindən uzaqdır. Əsl hidayət yoluna qədəm qoymamışlar. Onların rəyləri elə puçdur ki, nə xeyir, nə də şər tərəfə fikrləşməyə qadir deyillər.

Bu sifətlər Həzrətin döyüşçülərinin və tərəfdarlarının əksəriyyətinin ruhiyyəsi idi.(٢)

### ۴– HÜCRÜN ETİRAZI

Qeys ibni Səd ibni Übadənin rəhbərlik etdiyi qoşunda vuruşanda üzündən yaralanmış Übeyd ibni Əmr Kindi İmam Həsən (əleyhis-salam)-ın hüzuruna gəldi. Həzrət ondan soruşdu:–Üzünə nə olub?

O dedi:–Döyüşdə olmuşdur.



---

١- [٢٩] İrşad (Şeyx Mufid), səh.١٧٠.

٢- [٣٠] Kamil (İbni Əsir), ٣-cü cild, səh.۶٢.

Sonra Hücr ibni Ədi İmam Həsən (əleyhis-salam)-a dedi:–Biz Müaviyə və onun tərəfdarları ilə döyüşdən meyilsiz və acıqlı halda qayıtdıq, düşmənlərimiz isə şad, sevinə-sevinə qayıtdılar.

Bu söz Həzrəti narahat etdi, işarə ilə onu sakitləşdirdi. Sonra buyurdu:–Ey Hücr! Camaatın hamısı heç də sənin istədiklərini istəmir, nəzərləri sənin nəzərin kimi deyildir. Mənim gördüyüm işlər yalnız səni qorumaqdan ötrü olmuşdur və Allahın iradəsi hər gün bir cürdür.(١)

### ۵–SÜLH–MÜSƏLMANLARIN CANININ QÜRUNMASI ÜÇÜN

Sibt ibni Cozi Süddidən nəql edir ki, İmam Həsən (əleyhis-salam) heç də dünyaya bağlı olduğuna görə Müaviyə ilə sülh etmədi; əksinə, Həzrət İraq camaatının onunla bir olmadığını, ona qarşı hiylə qurduqlarını və onu tutub Müaviyəyə təhvil verəcəklərini görürdü. Məhz bu səbəbdən də Həzrətin sülhdən qabaq Nüxeylədə camaata etdiyi xitab bu sözə şahid ola bilər. Həzrət buyurmuşdu:

Ey camaat! Müaviyə ilə ixtilafda olduğumuz bu iş (xilafət) mənim haqqımdır, lakin ümmətin islahı, müsəlmanların canının qorunması üçün ondan keçirəm. Bəlkə bu, sizin üçün müəyyən müddətə qədər bir sınaq və faydalı olsun.



---

١- [٣١] Səfinətul-bihar, ١-ci cild, səh.٢٢٣; Nəhcül-bəlağənin şərhi (İbni Əbil-Hədid)

**DOSTLARIN OLMAMAZLIĞI–۶**

Sülh müqaviləsi imzalandıqdan sonra, şiənin görkəmli şəxsiyyətləri, Əmirəl-möminin Əli (əleyhis-salam)-ın dostları Həzrət İmam Həsən (əleyhissalam)-ın dövrəsinə yığışıb (onu məzəmmət etdilər və gördüyü bu tədbirə görə hay-küy saldılar.(۱)

Təbərsi Ehticac kitabında nəql edir ki, Həzrət etiraz edənlərin cavabında buyurdu: Allaha and olsun, mən yalnız döyüş üçün köməkçilərim olmadığına görə hökuməti Müaviyəyə həvalə etdim. Əgər köməkçim olsaydı, Allahın bizim aramızda hökm .edəcəyi vaxta qədər onunla döyüşərdim

**ÜMMƏTİN MƏSLƏHƏTİ–۷**

Müaviyə Kufədə camaat üçün etdiyi söhbətində, sülhün şərtlərini aşkar şəkildə pozduğunu elan edəndə, Müsəyyib ibni Nəxlə İmam Həsən (əleyhis-salam)-a ərz etdi:–Mən hələ də sizin işinizdən təəccübdəyəm! Qırx min nəfər sənə kömək etməyə hazır olduğu halda sən Müaviyə ilə sülh etdin və ondan sülhün şərtlərinə və əhdinə əməl etmək üçün iltizam almadın. Allaha and olsun, onun səni öldürməkdən başqa heç .bir məqsədi yoxdur

?Həzrət buyurdu:–İndi sənin nəzərin nədir

Müsəyyib ərz etdi:–Əvvəlki yerinizə qayıdın, çünki o, rəsmi olaraq sülhün şərtlərini və .əhdini pozduğunu bildirib



---

.(Məqatilit-talibin (Əbul Fərəc İsfahani[۳۲] -۱

İmam Həsən (əleyhis-salam) buyurdu:–Ey Müsəyyib! Əgər mən dünya üçün döyüşsəydim, şübhəsiz ki, döyüş meydanında Müaviyə məndən dözümlü və mətanətli olmazdı, amma mən sizin məsləhətinizi, xeyrinizi istəyirdim ki, bir-birinizin arasındakı çaxnaşmanın qarşısını alam. Buna görə də siz Allahın qəzavü-qədərinə razı olun. Bu halda yaxşı insanlar asudə olub şər adamların pəncəsindən amanda qalarlar.(١)

### ٨–CAMAATIN MÜHARİBƏDƏN BEZARLIĞI

İmam Həsən (əleyhis-salam) Mədain yolunda Sabat məntəqəsində qoşununun vəziyyətini müşahidə edərkən söhbətlərinin birində buyururdu:–Görürəm ki, sizin çoxunuz müharibədən yorulmusunuz və müharibə edib-etməmək barəsində tərəddüddəsiniz. Ona görə də istəmədiyiniz bir şeyi sizə qəbul etdirməyi ağıllı iş hesab etmirəm.(٢)

### ٩–İMAM HƏSƏN (ƏLEYHİS–SALAM)–IN SÜLHÜ HƏZRƏT XIZRIN İŞİ KİMİ İDİ

İmam Həsən (əleyhis-salam) Müaviyə ilə sülh etdikdən sonra camaatın və Kufə böyüklərinin bəziləri onun hüzuruna gəlir, məzəmmət edərək deyirdilər:–Niyə Müaviyə ilə beyət etdin?

Həzrət onlara deyirdi:–Vay olsun sizə, mənim nə etdiyimi bilmirisiniz? Allaha and olsun ki, mənim



---

١–[٣٣]Nəhcül-bəlağənin şərhi (İbni Əbil Hədid).

٢–[٣٤]Dinəvəri səh.٢١٦.

şiələr üçün etdiyim yaxşılıq günəşin saçıdığı şeylərin hamısından daha yaxşıdır! Siz bilmirsiniz ki, Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm)-in aşkar buyurduğuna görə sizin mənə itaət etməyiniz vacibdir və mən, behiştin ən yaxşı iki cavanından ?biriyəm

.Dedilər:–Bəli bilirik

Həzrət buyurudu:–Bilmirsiniz ki, Xızrın etdiyi iş Musanın qəzəblənməsinə səbəb oldu? Çünki o işlərin hikməti Musa üçün gizli idi, Xızrın etdiyi işlər də Allahın yanında eynilə hikmət və düz iş idi. Bilmirsiniz ki, Qaim (əleyhissalam) istisna olmaqla biz imamların hamısı zalım xəlifənin yaşadığı zamanda onlara beyət edəcəkdir? Amma təkcə Həzrət Qaim (əleyhissalam) zalım xəlifəyə beyət etməyəcək, Həzrət İsa (əleyhis-salam) onun arxasında namaz qılacaq. Allah onu gözlərdən gizlədəcək ki, heç bir zalım və tüğyançı ona qalib olmasın. O, qardaşım Hüseynin doqquzuncu övladı olacaqdır. Allah yer üzü tamamilə zülmlə, ədalətsizliklə dolana qədər onun ömrünü və qeybdə olma müddətini uzadacaqdır. Allah onun əli ilə yer üzünü haqq-ədalətlə dolduracaq. Allah onu qırx yaşına çatmamış bir cavan kimi zahir edəcəkdir. Bunların hamısı Allahın qüdrətindəndir ki, insanların məsləhətini onda bilir. Mənim bu sülhüm də tarixin sizin məsləhətinizə (tamam olan həssas nöqtəsidir.(١)



---

.(Ehticac (Təbərsi[۳۵] -١

## İMAM HƏSƏN (ƏLEYHİS-SALAM): ƏGƏR MƏN SÜLH ETMƏSƏYDİM ŞİƏLƏRDƏN BİR-١٠ NƏFƏR DƏ SAĞ QALMAYACAQDI

Əbu Səid İmam Həsən (əleyhis-salam)-ın hüzuruna gəlib ərz etdi:–Ey Peyğəmbərin oğlu! Nə üçün Müaviyə ilə razılığa gəlib sülh etdin? Halbuki, bilirdin ki, haqq səninlədir, ?Müaviyə yolunu azmış və təcavüzkardır

Həzrət buyurdu: Ey Əba Səid, sən məni atamdan sonra Allahın xalqa höccəti, xəlifəsi ?və itaəti vacib olan İmam bilmirsənmi

.Ərz etdi:–Bəli, bilirəm

İmam Həsən (əleyhis-salam) buyurdu:–Cəddim Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-din Həsən və Hüseyn–hər ikisi imamdırlar, istər sülh etsinlər, istərsə də ?müahirəbə deyə buyurduğunu eşitməmisənmi

.Dedi:–Eşitmişəm

Həzrət buyurdu:–Əgər məni İmam kimi qəbul edirsənsə, bil ki, mən ümumxalq məsləhətini özümün şəxsi mənafe və danılmaz məqamımdan üstün hesab edərək sülh etdim. Mənim Müaviyə ilə bağladığım sülhün səbəbləri eynilə cəddim Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in Bəni Zümrə və Bəni Əşcə tayfaları ilə, Məkkədən qayıdarkan Hüdeybiyyə müharibəsində qoyduğu şərtlərə oxşayır. Səhabələrdən çoxu .o həzrəti danlayıb o sülhlə razılaşmadılar

Mənim Müaviyə ilə bağladığım sülh də eynilə o sülhə oxşayır. Yalnız bir fərqlə ki, onlar Qurana qarşı aşkar kafir idilər, Müaviyə və Bəni-üməyyə hizbi isə zahirdə müsəlman, batində isə kafirdirlər. (Daha sonra bu sülhün səhih və əzəmətli bir iş olduğunu təkid etmək üçün buyurdu:) Musa və Xızrın

hekayəsini eşitməmisən? Xızr salamat gəmini deşdi, oğlanı öldürdü və köhnə divarı təmir etdi. Musanın bu işlərin sirrindən xəbəri yox idi. Xızr bu işlərin hikmətini deyəndə Musa onun işlərinin düz olduğunu qəbul etdi. Siz də mənim işimin hikmət və fəlsəfəsini dərk edə bilməzsiniz. Əlbəttə zamanın keçməsi bu işlər barəsində səhih mühakimə yürüdəcək, onun sirrlərini sizin üçün bəyan edəcəkdir. Hələlik bu qədər bilin ki, əgər mən sülh etməsəydim, bizim işə və dostlarımızdan bir nəfər də sağ qalmaz, hamısı qətlə yetirilərdi. Mən qan tökülməsinin qarşısını almaq üçün öz haqqımdan keçdim və dinin əbədi qalması naminə sülh etdim.(۱)

## ۱۱–SÜLHÜN BAŞQA BİR SƏBƏBİ

Süfyan ibni Ləyl deyir: İmam Həsən (əleyhis-salam)-ın sülh etməsi xəbərini eşidən kimi dərhal dəvəyə minib onun yanına getdim. Gördüm ki, öz evinin qabağında oturub və camaat onun ətrafına yığışıb. Dedim: Əssəlamu əleykə ya muzilləl-möminin. (Salam olsun sənə, ey möminləri zəlil edən!)

Həzrət buyurdu: Əleykəs-salam ya Süfyan! Dəvədən enib onu, bağladım və Həzrətin yanında oturdum. Həzrət buyurdu: Ey Süfyan nə dedin? Ərz etdim ki, Əssəlamu əleykə ya müzilləl-möminin. Həzrət buyurdu: Mənə bu cür xitab etməyinə nə bais olub? Dedim: Atam-anam sənə fəda olsun, sən bizi zəlil etdin. Yüz minlərlə qılıc vuran və öz canını sənə



---

۱- [۳۶]Bihar ۱۰-cu cild, səh.۱۰; Sülhül-Həsən səh.۱۲۲.

qurban etməyə hazır olan əsgər olduğu halda sən xilafəti tüğyançı düşmənə, ciyəryeyən Hindin məlun oğluna həvalə etdin. İmam Həsən (əleyhis-salam) buyurdu: Ey Süfyan biz Əhli-beyt haqqı bilir və tanıyırıq. Buna görə də heç vaxt haqqdan kənara çıxmır, həmişə haqqa arxalanırıq. Mən atam Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-dan eşitdim, o da Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-dən belə rəvayət edirdi: Dövran keçəcək, bir zaman çatacaqdır ki, bu ümmətin rəhbərliyi boğazı gen olan bir nəfərin əlinə düşəcəkdir. O, çox yeyəcək, amma doymayacaqdır. Allah ona öz imtahanını verib qurtarana qədər möhlət verəcəkdir. Bu müddətdə o özünə düşmənçilikdən, zəlalət və azğınçılıqdan ağır yük düzəldəcəkdir. Belə ki, .asimanlarda bəhanəsi, yerdə dostu, köməkçisi olmayacaqdır

Bu zaman axşam düşdü və müəzzinin azan səsi ucaldı. Həzrət üçün bir miqdar süd gətirdilər. O, südün bir qədərini özü içdi, qalanını da mənə verdi. Daha sonra Həzrətlə birlikdə məscidə getdim və ərz etdim:–Həzrət Mühəmmədi haqq olaraq peyğəmbərliyə məbus edən Allaha and olsun ki, mən bu sözləri sizə qarşı məhəbbət .üzündən dedim

İmam (əleyhis-salam) buyurdu:–Bu şad xəbəri eşit: atamdan eşitdim ki, o da Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-dən rəvayət etdi: Mənim Əhli-beytim, onlara məhəbbət göstərənlərlə birlikdə hovuzun kənarında mənim yanıma daxil olacaqlar. Onlar (Əhli-beyt və onları sevənlər-müt.) biri-birlərindən ayrılmayan iki şəhadət barmağı kimidir. Bunu da bil ki, dünya həm yaxşı, həm də pis insanların yeridir. .Bizim şiələr isə yaxşı insanlardandır

İmam Həsən (əleyhis-salam) Müaviyə ilə sülh etdikdən sonra Süleyman ibn Sürəd Xüzai Həzrətin hüzuruna gəlib ərz etdi:–Əssalamu əleykə, ya muzilləl-mömininǃ Ey Peyğəmbərin oğlu, sizin bu təəccüblü işiniz heç vaxt mənim yadımdan çıxmaz. Siz nə cür Müaviyə ilə sülh etdiniz? Halbuki, qırx min döyüşçü cəngavər sizin qoşununuzda idi, Bəsrə və Hicazlılar sizə tərəfdar idi. Nə oldu ki, sizin lazımi qədər tərəfdar və qüdrətiniz olduğu halda xilafəti Müaviyəyə həvalə etdiniz və öz ixtiyarınıza keçirmədiniz? Yaxşı olardı ki, siz qəbilə başçılarını dəvət edirdiniz ki, bu əhdnamə hamının hüzurunda yazılardı, heç olmazsa, ondan sonra xilafət sizin ixtiyarınıza keçərdi. Amma bu sülhnamənin möhtəvasından heç kəs xəbərdar olmamışdır. İş o yerə çatıb ki, Müaviyə minbərə çıxıb deyir: Mən müharibə odunu söndürməkdən ötəri müəyyən şərtləri qəbul etdim və fitnəni kökündən kəsdim. İndi ki, ixtilaf aradan qalxdı, sülhün şərtlərini ayağımın altında qoydumǃ Ey Peyğəmbərin oğlu, Müaviyənin məqsədi yalnız xilafəti ələ keçirmək idi. O, sülhün şərtlərinin heç birinə əməl etməyəcəkdir. Yaxşı olar ki, siz də öz əhdinizi pozub müharibəyə dair əmr verəsiniz. Mən də Kufəyə gedib qoşun toplayım .və Müaviyənin əlaltılarını oradan çıxardam. Allah xaini sevməz

Bunları deyib sakit oldu. İmam Həsən (əleyhis-salam) buyurdu:–Ey Süleyman, siz bizim şiə və dostlarımızsınız. Əgər mən dünyanı əldə etmək istəsəydim, onu əldən verməz, hökmranlığı əlimdə

bərk-bərk saxlayardım. Bunu bil ki, Müaviyə iradə və tədbirdə məndən heç də üstün deyil. O, qüdrətdə məndən irəli keçə bilməz. Amma mənim gördüyüm şeyləri siz görmürsünüz. Mən ümmətin canı, qanı və namusunu hifz etmək naminə onunla sülh etdim. Mən Allahın razılığı, xalqın məsləhəti və hikmət üzündən onunla sülh edib bu .müqaviləni imzaladım. Sizin borcunuz sakit olub itaət etməkdir

### VƏFASIZ DOSTLAR-۱۳

Müsəyyib ibni Nücəyh İmam Həsən (əleyhis-salam)-a ərz etdi:–Ey Peyğəmbərin oğlu, mən çox təəccüb edirəm ki, sizin qırx min döyüşçünüz olduğu halda nə cür Müaviyə ilə sülh etdiniz; bundan əlavə, bu sülhü möhkəmlətmədiniz ki, heç olmazsa, sizin üçün də faydası olsun. Müaviyə şərtlərin heç birinə əməl etmədi. Məsləhət görürəm ki, siz də .əhdinizi pozasınız

İmam Həsən (əleyhis-salam) buyurdu:–Ey Müsəyyib, əgər mən dünyanı əldə etmək üçün tədbir görsəydim, Müaviyə məndən qabağa keçə bilməz və bu yolda məndən möhkəm, səbirli ola bilməzdi. Mən sizin məsləhət və mənafeyinizə görə sülh etdim. Mən istəmədim ki, bir-birinizi qılıncdan keçirəsiniz. Sizin çoxunuz qırx, yaxud yüz min nəfərin döyüş üçün hazır olmasını güman edərək səhvə düşmüsünüz. Mən öz köməkçilərimin vəfasızlıqlarını gördüyüm üçün, müsəlmanların məsləhəti naminə sülh .etdim. İndi siz Allahın razılığı, qəzavü-qədərini qəbul edib, mömin və pərhizkar olun

## BƏNİ–ÜMƏYYƏNİN HAKİMİYYƏTƏ ÇATMASI LABÜDDÜR–۱۴

Bir neçə nəfər Mədinədə İmam Həsən (əleyhis-salam)-ın hüzuruna gəlib nalayiq sözlər deməyə, onu məzəmmət etməyə başlayıb dedilər:–Ey möminləri zəlil, üzlərini !qara edən

İmam Həsən (əleyhis-salam) buyurdu: Məni məzəmmət etməyin və kobud danışmayın. Çünki, bu işdə sülh üçün məsləhət vardı. Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) yuxuda gördü ki, Bəni-Üməyyə (meymun surətində) biri digərindən sonra onun minbərinə çıxıb xütbə oxuyurlar. Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) çox qəmgin oldu. Cəbrəil Kovsər surəsini və bir gecəsi Bəni-üməyyənin .hökumət etdiyi min aydan (təqribən ۸۰ il-müt.) yaxşı olan Qədr surəsini gətirdi

## SÜLHÜN BAŞQA BİR SƏBƏBİ–۱۵

İmam Hüseyn (əleyhis-salam) qardaşı İmam Həsən (əleyhis-salam)-dan Xilafətin Müaviyəyə verməyin səbəbi nə idi? deyə soruşduqda, həzrət buyurdu: Elə atanın (xilafəti qəsb edənlərin müqabilində sükut etdiyi səbəblərə görə.(۱

## ...QƏLƏBƏ MÜMKÜN DEYİLDİ–۱۶

İmam Cəfər Sadiq (əleyhis-salam) buyurur: İmam Həsən (əleyhis-salam) sülhə etiraz :edən azsaylı dostlarına cavab olaraq buyurdu

Həqiqətən mən, sizin onlara qələbə çalmaq üçün qüdrətinizin olmadığınızı gördükdə ,həm özümün



---

.Bihar ۱۰-cu cild, səh.۱۳[۳۷] -۱

.həm də sizin sağ qalmağınız üçün xilafəti Müaviyəyə verdim

## İMAM BAQİR (ƏLEYHİS-SALAM)-IN NƏZƏRİNDƏ SÜLHÜN SƏBƏBİ-١٧

Südeyr Seyrəfi İmam Baqir (əleyhis-salam)-a ərz etdi: Necə mümkün ola bilər ki, İmam Həsən (əleyhis-salam) İmam ola-ola xilafəti Müaviyənin öhdəsinə qoysun? Həzrət buyurdu: Bəsdir! O, gördüyü işləri sizdən yaxşı bilirdi. Əgər sülh etməsəydi şiənin kökü kəsilərdi və böyük bir bədbəxtçilik baş verərdi. İmam Həsən (əleyhis-salam)-ın Müaviyə ilə etdiyi sülh ümmət üçün dünya və onda olanlardan yaxşı idi. :Allaha and olsun bu ayə o cənabın sülhü barəsində nazil olubdur

O kəsləri görmədin ki, onlara müharibədən əl çəkin, namaz qılın, zəkat verin deyildi. Amma elə ki, cihad hökmü onlara yazıldı, düşməndən, Allahdan qorduqları kimi, yaxud daha çox qorxdular. Dedilər: Ey Allah, nə üçün bizə cihadı vacib etdin? Nə yaxşı olardı (ki, cihad hökmünü bir qədər təxirə salardın!(١

Sonra Həzrət ayəni belə təfsir etdi: İmam Həsən (əleyhis-salam)-ın zamanında onlara əmr olundu ki, imama itaət edin, müharibəni dayandırın, namaz qılın və zəkat verin. Amma onlar razı olmadılar. İmam Hüseyn (əleyhis-salam)-ın zamanında isə cihad vacib oldu, amma dedilər: Nə üçün cihad hökmünü Həzrət



---

.Nisa surəsi, ٧٧[٣٨] -١

(Qaim (əleyhis-salam)-ın zühuruna qədər təxirə salmadın?(١)

İmam Baqir (əleyhis-salam) bir gün səhabələrinə buyurdu: Qüreyş bizə nə zülmləri rəva görmədi! Bizim şiələrə və dostlarımıza onların əlbir olması nəticəsində nə qədər zülmə məruz qaldılar! Hansı ki, Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) dünyadan gedəndə buyurmuşdu ki, biz Əhli-beyt imamət və xilafətə hamıdan artıq layiqliyik. Amma Qüreyş bizim haqqımızı əlimizdən almaq üçün əl-ələ verdilər. Camaat Əli (əleyhis-salam)-la beyət edən zamana qədər xilafəti özünün əsl mərkəzindən uzaqlaşdırdılar. Qüreyş ona beyət etdikdən sonra yenidən pozdular, üstünə qılınc .çəkdilər və onu şəhid edənə qədər ardı-arası kəsilməz müharibəni davam etdirdilər

Daha sonra onun oğlu İmam Həsən (əleyhis-salam)-la beyət etdilər və beyətdən sonra hiyləyə əl atdılar, məkr qurdular, onu düşmənə təhvil etmək istədilər. İraq camaatı onun üzünə durdular, sinəsinə xəncər vurdular, xeyməsini qarət etdilər və onu təngə gətirdilər. Nəhayət Müaviyə ilə sülh etdi və bu yolla özünün və Əhli-beytin .canını hifz etdi



---

.Üsuli Kafi, Cəlalül-üyun[٣٩] -١

## İMAM HƏSƏN (ƏLEYHİS–SALAM)–IN AŞKAR MÜSAHİBƏSİ

Şeyx Tusi nəql edir: İmam Səccad (əleyhis-salam) buyurdu: İmam Həsən (əleyhis-salam) Müaviyə ilə sülh bağlamaq üçün yola düşdü. Məscidə daxil olduğu zaman Müaviyədən əlavə çoxlu adam da orada var idi. Müaviyə minbərə çıxıb dedi: Ey camaat! Əliyyibn Əbi Talib və Fatimeyi Zəhranın oğlu Həsən məni xilafətə layiq bilir və özünü xilafətə layiq bilmir. O öz meyli və rəğbəti ilə mənimlə beyət etməyə gəlib. !(Sonra İmam Həsən (əleyhis-salam)-a dedi:) Qalx və məsələni xalqa de

:İmam Həsən (əleyhis-salam) ayağa durub bəlağətli, gözəl bir xütbə oxudu, buyurdu

Ey camaat! Mənim sözlərimi eşidin. Diqqətiniz məndə olsun və dediklərimi yadınızda saxlayın. Allah biz Əhli-beyti İslama körə əzizləyib, bizi seçmiş və bizdən ricsi uzaqlaşdırıbdır. Rics şəkk etmək mənasında işlədilir. Yəni biz Əhli-beyt bir an da olsun, Allahın vücudunda və Onun dinində şəkk etmərik. Allah bizi hər bir yalandan, zəlalətdən təmiz edib, ulu babalarımızı–Həzrət Adəm (əleyhis-salam)-a kimi şirkdən, çirkinliklərdən uzaqlaşdırıbdır. Hər zaman camaat iki dəstəyə ayrıldıqda biz yaxşıların içində olmuşuq. İşlər tərtibə salındı. Səbəblər hazır oldu və Allah Həzrət Mühəmməd (səlləllahu əleyhi və alihi və səlləm)-i peyğəmbərliyə seçərək ona Öz kitabını nazil etdi. Sonra ona əmr etdi ki, camaatı Allaha tərəf çağırsın. Peyğəmbərin dəvətini qəbul edib Allaha iman gətirən və Onun Peyğəmbərini təsdiq edən ilk şəxs atam idi. Quran :buyurur

Kimdir Pərvərdigarı tərəfindən (Quran kimi) aşkar dəlili olan şəxs? Ki, ona şahid olan bir şəxs onun özündən olub ardınca gəlir.(١)

İmam Həsən (əleyhis-salam) bu ayənini təfsirində buyurdu: Yalnız Peyğəmbər Allahın tərəfindən qəti dəlil, aşkar sübut üzrə idi; və yalnız mənim atam onun davamçısı və həqiqətinə şahid idi. Onna görə ki, Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm) Bəraət surəsini Əbubəkrə verib Məkkəyə göndərdi. Amma atam Əlini onun arxasınca köndərdi ki, surəni alıb Məkkə camaatı üçün oxusun. Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) buyurdu: Mənə əmr olunub bu surəni ya özüm, ya da ki, mənim kimi olan bir kişi aparsın. Ey Əli, o kişi sənsən (və sən) məndənsən. Deməli, Əli Peyğəmbərdən və Peyğəmbər də Əlidəndir.

Həmçinin, Rəsuli Əkrəm (s) atamla onun qardaşı Cəfər və onun qulamı Zeyd ibni Harisə arasında Həmzənin qızının qapısında hökm edəndə buyurdu: Ey Əli, sən məndənsən, mən də səndən; sən məndən sonra hər möminin mövlası və rəhbərisən. Bəli, mənim atam hamıdan qabaq Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-i təsdiq etdi və onu öz canı ilə mühafizə etdi. Rəsuli Əkrəm atam Əliyə etimad etdiyinə, inandığına görə çətin hallarda onu irəli göndərirdi və hər bir çətinlik üçün onu hazırlayırdı. O, Allah və Onun Peyğəmbərinə hamıdan çox daha yaxın idi. Quran buyurur:

İmam gətirməkdə qabaqcıl olanlar... yalnız onlardır Allah dərgahına yaxın olanlar.(٢)



---

١- [٤٠] ١٧ Hud surəsi.

٢- [٤١] ١٠ Vaqiə surəsi.

Məkkənin fəthindən qabaq infaq (ehsan) və müahribə edənlərin (Allah yanında) böyük məqamları var və fəthdən sonra infaq və müharibə edənlər onlarla bərabər ola bilməzlər; onların Allah yanındakı məqamları sonrakılardan daha üstündür.(١)

Bəli onların dərəcəsi fəthdən sonra infaq və müharibə edənlərin məqamından çox-çox böyükdür.

Mənim atam hamıdan qabaq iman gətirib İslamı qəbul etdi; hamıdan qabaq Allaha və Peyğəmbərə tərəf hicrət etdi və hamıdan qabaq öz gücü və bacarığı qədər Allah yolunda infaq etdi. Allah buyurur:

Onlardan (mühacir və ənsardan) sonra gələnlər Allahın dərgahına belə ərz edərlər: Pərvərdigara, bizi və bizdən qabaq iman gətirən qardaşlarımızı bağışla!(٢)

Bütün ümmətlər Qiyamət gününə qədər atam üçün, Allaha və Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-ə hamıdan qabaq iman gətirdiyinə görə istiğfar diləyirlər. Yenə də Allah buyurur:

Məgər hacılara su verən və Məscidül-Həramı təmir edən bir şəxs Allaha və Qiyamət gününə iman gətirib Allah yolunda cihad edənlərlə bərabərdirmi? Onlar Allahın yanında əsla bərabər deyillər!(٣)

Doğrusu, Allah yolunda haqq olaraq cihad edən o (atam) idi. Bu ayə onun şənində nazil olubdur.



---

١- [۴٢] Hədid surəsi, ١٠.

٢- [۴٣] Həşr surəsi ١٠.

٣- [۴۴] Tövbə surəsi ١٩.

Peyğəmbərin dəvətini məmnuniyyətlə qəbul edənlər onun əmisi Həmzə və əmisi oğlu Cəfər idi. Onların hər ikisi çoxlu şəhidlərlə birlikdə şəhid edildilər. Allah Öz lütfünü onlara şamil etdi. Həmzəni Seyyidüş-şühəda (şəhidlərin ağası) etdi, Cəfərə iki qanad .əta etdi ki, hər yerə istəsə məlaikələrlə birgə uçsun

Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-ə qohum olduğu üçün bu yüksək məqam və lütfülər tənha onlara şamil oldu. Həzrət Ühüd şəhidləri arasında Həmzəyə yetmiş namaz qıldı. Allah belə müqəddər etdi ki, onun qadınlarının xeyir işlərinin savabı və ya günahlarının cəzasını başqalarından iki dəfə çoxaltsın. Bunların hamısı onların o həzrətlə qohum olmasına görə idi. Peyğəmbər məscidində qılınan namazı İbrahim Xəlilin Məscidi olan Məscidul-Həramdan başqa məscidlərdə qılınan namazların mininə bərabər etdi. Bu fəzilət o məscidin Allahın Rəsuluna məxsus olduğuna görə idi. Allah Öz Rəsuluna salavat göndərməyi bütün möminlərə vacib etdi. Daha sonra səhabələr Ey Allahın Rəsulu, biz sənə necə salavat göndərək? deyə soruşanda, Həzrət buyurdu: (:(Salavatı belə göndərin

.Allahummə səlli əla Muhəmmədin və Ali-Muhəmməd

Hər müsəlmana vacibdir ki, Allahın Rəsuluna salavat göndərəndə bizə də salavat göndərsin. Allah qənimətin xumsunu Öz Rəsuluna halal etdi, Öz kitabında (xumsu) ona və bizə aid etdi. O Həzrətə sədəqə almağı haram etdiyi kimi bizə də haram etdi. Allah Öz Peyğəmbərini daxil etdiyi hər şeyə bizi də daxil etdi; Öz Peyğəmbərini çıxartdığı hər şeydən bizi də çıxartdı. Bu, Allahın bizə qarşı etdiyi ehsan və bir

fəzilətdir ki, onun səbəbi ilə bizi sair bəndələrdən üstün edibdir. Kitab əhlindən olan :kafirlər onun nübüvvətini inkar, onunla höcətləşdikdə Allah bu ayəni nazil etdi

De: gəlin bizim öz övladlarımızı və sizin öz övladlarınızı; bizim qadınlarımızı və sizin qadınlarınızı; bizim öz canlarımızı və sizin öz canlrınızı çağıraq, sonra mübahilə edək.(۱) (Sonra Allahın lənətini yalnçılara yağdıraq!(۲

Allahın Rəsulu öz canının əvəzində mənim atamı, övladlarından məni və qardaşımı, qadınlardan anam Fatiməni apardı. Onun əhli, əti, qanı və canı yalnız bizik; biz ondan :idik və o da bizdən. Allah buyurur

Allahın iradə və istəyi yalnız bu olmuşdur ki, siz Əhli-beytdən hər növ çirkinliyi aradan (aparıb Sizləri pak-pakizə qərar versin.(۳

Təthir ayəsi nazil olanda biz Ümmü Sələmənin evində idik. Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm) məni, qardaşımı, anamı və atamı bir yerə yığıb biz dörd nəfəri əbanın altına daxil etdi və dedi: Pərvərdigara, bunlar mənim Əhli-beytimdir. Bunlar mənim itrətimdir. Onlardan hər ricsi (hər növ günah) uzaqlaşdır, onları pak-pakizə !qərar ver

Daha sonra Ümmü Sələmə dedi: Ya Rəsuləllah, mən də onlarla bir yerə daxil olum? Həzrət buyurdu: Allah sənə rəhmət etsin, sən xeyirdəsən, sənin



---

Mübahilə bir şeyin haqq olmasını sübuta yetirmək üçün müqabil tərəfə, Allahdan[۴۵] -۱ .bəla nazil etməsini istəyərək qarğışlamaq

.Ali-İmran surəsi, ۶۱[۴۶] -۲

Əhzab surəsi, ۳۳[۴۷] -۳

.aqibətin xeyirlədir. Mən səndən çox razıyam. Lakin bu iş mənə və bunlara məxsusdur

Həzət bu ayə nazil olduqdan sonra, vəfat etdiyi vaxta qədər hər gün sübh çağı bizim evin qapısına gəlib Əssəlat, yərhəmukumullah! deyər, sonra bu ayəni oxuyub gedərdi. Həzrət əmr etdi ki, bizim evin qapısından başqa yerdə qalan evlərin məscidə açılan qapısını bağlasınlar. Bu iş barəsində danışıq etdilər, Həzrət buyurdu: Mən sizin evlərin qapısını bağlatdırıb, Əlinin evinin qapısını açıq qoymağı özümdən demirəm. Allahın mənə nazil etdiyi vəhyə itaət edirəm. Allah mənə əmr etmişdir ki, bütün evlərin .qapısını bağlayıb, təkcə Əlinin evinin qapısını açıq qoyam

İndi məlum olur ki, o Həzrətin məscidində mənim atamın evinin qapısı onun (cəddimin) ....evinin qapısı ilə yanbayandır və bizim mənzilimiz onun mənzillərinin arasındadır və

Ey camaat, əgər mən illər boyu durub Allahın bizə məxsus etdiyi fəzilətləri, kəramətləri sizin üçün saysam, əsla qurtaran deyildir. Bəşir, Nəzir, Siracul-munir Peyğəmbərin oğlu mənəm! Allah onu bütün aləmlər üçün rəhmət göndəribdir. Atam Əli möminlərin vəlisi və Harun kimidir. (O, Musa peyğəmbərin vəziri, canişini idi.-müt.) Səxrin oğlu Müaviyə iddia edir ki, mən onu xilafətə layiq bilib özümü isə layiq bilmirəm. O yalan deyir! Allaha and olsun ki, mən xilafətə Allahın kitabında və Rəsulunun sünnətində hamıdan layiqliyəm. Lakin biz Əhli-beyt həmişə məzlum olmuşuq, haqqımız qəsb edilib. Allahın Rəsulu dünyadan gedən gündən bu günə qədər elə bu cür olmuşdur. Allah Özü bizimlə, bizə zülm edib haqqımızı qəsb edənlərin, boynumuza minənlərin, camaatı bizə hakim edənlərin, Allahın

kitabında xums və qənimətdən bizim üçün müəyyən olunmuş payı əlimizdən alanların, anam Fatimeyi Zəhraya atasından irs çatanları onun əlindən alanların arasında hökm etsin! Mən şəxsən kiminsə adını çəkmirəm. Amma Allaha and içirəm ki, əgər camaat Allahın və Onun Rəsulunun sözlərinə qulaq assaydılar, hökmən asiman öz bərəkətini onlar üçün yağdırar, heç vaxt iki nəfər bir-birinin üstünə qılınc çəkməz və ilahi .nemətlərdən Qiyamət gününə kimi bəhrələnərdilər

Ey Müaviyə, sən heç vaxt xilafətə göz dikə bilməzdin, lakin ilk əvvəldə xilafəti əsl .mərkəzindən çıxartdılar, imamətin rüknlərini sarsıtdılar

Qüreyş tayfası öz aralarında imamət məsələsində çəkişməyə başladılar, imamət məqamını əldən-ələ ötürdülər. Sanki onu meydandan oğurladılar. Nəhayət iş o yerə çatdı ki, ey Müaviyə, sənin kimi bir adam da ona tamah gözü dikdi. Ey Müaviyə, sənin dostların da sənə tamah salacaqlar. Allahın Rəsulu (səlləllahu əleyhi və alihi və səlləm) buyurmuşdur: Həqiqətən hər ümmət, aralarında bir şəxsdən biliklisi olan halda (bilikli olmayan) bir kəsi rəhbər seçsələr, onların işləri get-gedə, tədricən alçaqlıqlara (cahiliyyət dövrünə) doğru gedər. Bəni-İsrail Musanın qardaşı və canişini Harunu tərk etdilər. Onun Musanın canişini olduğunu bildikləri halda bir dananın dövrəsində yığışıb .öz samirilərinə itaət etdilər

Bu ümmət də Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-dən, mənim atama Səninlə mənim münasibətim Harunun Musaya olan münasibəti kimidir. Bu fərqlə ki, məndən sonra peyğəmbər olmayacaqdır. buyurduğunu eşitmişdilər. Allahın Rəsulu Qədir Xumda onu öz yerinə təyin edəndə, hamı onun nidasını eşitdi. Belə ki, Həzrət onu mömin

və möminələrin vəlisi elan etdi, çox təkid etdi ki, orada olanlar (bu xəbəri) qaiblərə .çatdırsınlar

Allahın Rəsulu mağaraya getdi. O, öz tayfasını Allaha tərəf dəvət etdiyi halda onu qətlə yetirmək istədilər. Peyğəmbər onlarla cihad etməyə köməkçi tapmadığı üçün mağaraya getdi. Əgər köməkçi tapsaydı, hökmən onlarla cihad edərdi. Allahın Rəsulundan sonra atam da əshabdan və camaatdan yardım istədi. Lakin köməkçi tapmadığı üçün xilafətdən əl çəkdi. Əgər köməkçi tapsaydı, şübhəsiz, onlarla cihad edərdi. Allah Öz Rəsulunu üzrlü hesab etdiyi kimi, onu da üzrlü hesab etdi. Həmçinin, bu ümmət məni tək qoyub kömək etmədilər və ey Hərbin oğlu, səninlə beyət etdilər. Əgər məni aldatmaq fikrində olmayan səmimi köməkçilər tapsaydım, heç vaxt səninlə beyət etməzdim. Necə ki, Harunun tayfası onu zəiflədib və onunla düşmənçilik etdikləri zaman Allah onu üzrlü hesab etdi. Bu ümmət məni və atamı tərk edib bizdən başqalarına itaət edikləri zaman köməkçi tapa bilmədiyimizə görə biz də Allah yanında .üzrlü sayılırıq. Bəli, bu ümmətin halı eynilə keçmiş ümmətlərin halı kimidir

Bu anda minbərdən endi. Müaviyə dedi: Allaha and olsun, Həsən minbərdən düşərkən .dünya gözümdə qaraldı

## HÜCRÜN MÜXALİFƏTİ

Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-ın fədakar köməkçisi olan Hücr ibni Ədi ruhdan düşmüş, incimiş halda İmam Hüseyn (əleyhis-salam)-ın hüzuruna gəlib, kinəli düşmənin

müqabilində sükut etməyərək dərhal qiyam etməsini istədi və dedi: –Siz öz izzət və ağalığınızı satıb zillət və xarlığa razı oldunuz. Cüzi, azacıq xeyri qəbul edib çoxlu xeyri itirdiniz. Biz bu gün əmrə itaət etdik. Amma ruzigar bizdən üz çevirəcəkdir. Mən sizdən istəyirəm ki, İmam Həsən (əleyhis-salam)-ın sülh barəsindəki nəzərinə əhəmiyyət verməyin. Kufə camaatı içindəki şiələrdən qoşun toplayıb sərkərdəliyini mənimlə dostum Übəydət ibn Əmrə tapşırın. Görərsiniz ki, Müaviyə yerindən qalxmamış qılncla .onun başının üstünü kəsdirəcəyik

:İmam Hüseyn (əleyhis-salam) onun cavabında buyurdu

(Biz beyət edib peyman bağlamışıq, daha beyəti pozmaq üçün heç bir yol yoxdur.(١)

O həzrət söhbətlərində təkid edirdi ki, hərgah İmam tərəfindən hər hansı bir peyman və əhd bağlanarsa, heç bir kəs onu poza bilməz. Çünki, İlahi rəhbər həqiqi məsləhətlər, mənafelərə əsasən hərəkət edir, öz şəxsi meylini və istəklərini nəzərə .almır. Buna görə də onunla müxalifətçilik düzgün iş deyil və haramdır

İmam Hüseyn (əleyhis-salam)-ın əsas çətinliyi bu idi ki, baş verən hadisələrdə ilahi qəzavü-qədər, müqəddərat barəsində tam aşkar danışa, İslam ümmətini, yaxud heç olmazsa şiələri agah edə bilmirdi ki, Hərəti Müctəba (əleyhis-salam)-ın bundan başqa .çıxış yolu yox idi

İmam Həsən (əleyhis-salam)-ın heç bir köməkçisi, qiyam və qələbə üçün bir vasitə .olmadığı halda bir ölkənin rəhbəri kimi qiyam etməsi qeyri-mümkün idi



---

.Əxbarüt-təval səh.٢٢٢[۴٨] -١

Amma siyasi şəraitdən düzgün məlumatları olmayan sadə şiələr öz etirazlarını davam .etdirdilər, amma Allahın sirlərini dərk etməyə qüdrətləri yox idi

Buna görə də İmam Hüseyn (əleyhis-salam) izah edib buyudu ki, bağlanan peyman haqq üzündən olmasa da və Müaviyənin zülm və haqsızlıq etməsinə baxmayaraq, bizim tərəfimizdən qəbul edildiyindən, onu pozmaq düzgün deyildir. Heç bir müsəlmanın bağladığı əhd-peymanı pozmağa haqqı olmadığı halda, Allah-Taala tərəfindən haqq olaraq seçilən İmamın bu cür yaramaz işi görməsi necə mümkün ola bilər?! Hamıdan çox o (İmam), öz əhd-peymanına vəfadar qalmalıdır. Həzrət İmam .Hüseyn (əleyhis-salam)-ın müsəlmanlara öyrətdiyi böyük dərs, bax, budur

## ŞİƏLƏRİN ETİRAZLARI

Bir dəfə də şiələrədən bir qrupu: Əli ibni Bəşir Həmdani, Süfyan ibni Əli Leyli Həmdani Nəhdi, Müsəyyib ibni Nəcbə, Əbdüllah ibni Vərak və Sərah ibni Malik Xəsəmi İmam Hüseyn (əleyhis-salam)-ın hüzuruna gedib və İmam Həsən (əleyhis-salam)-la görüşdüklərini o həzrətə dedilər və ondan istədilər ki, onlarla razılaşıb ciyəryeyən Hindin oğlunun əleyhinə qiyam etsin. Amma Həzrət buyurdu: Əbu Muhəmməd İmam Həsəni Müctəba (əleyhis-salam) düz buyurmuşdur. Nə qədər ki, bu murdar kişi sağdır, .gərək öz evlərinizdə oturasınız

## İMAM HÜSEYN (ƏLEYHİS-SALAM) QADAŞININ ƏMRİNƏ TABE İDİ

Cabir ibni Əbdüllah Ənsari İmam Hüseyn (əleyhis-salam)-a ərz etdi: Sən də qadaşın İmam Həsən (əleyhis-salam) kimi sülh edirsən? Həzrət buyurdu: Şəksiz ki, qardaşım Allahın və Peyğəmbərin əmri ilə iş gördü. Mən də Allahın və Peyğəmbərin əmri ilə iş görürüəm.

İbni Şəhraşub rəvayət edir ki, İmam Hüseyn (əleyhis-salam) qardaşının hüzurunda olanda (işləri həll edərkən) ona hörmət əlaməti olaraq heç nə danışmazdı.(١)

Habelə İmam Sadiq (əleyhis-salam) buyurur: İmam Hüseyn İmam Həsənə təzim və hörmət əlaməti olaraq heç vaxt onun qabağınca yol getməz, söhbət edərkən ondan əvvəl danışmazdı.(٢)

Bəli, lətif və dəqiq mənaları dərk etməkdə aciz olmaq nəticəsində İmam Həsən (əleyhis-salam)-a qarşı pis rəftar etdilər və nadürüst sözlər danışdılar. Ümumiyyətlə, insanların dərk səviyyələri bir-birindən fərqlənir. Aləmin yaradılış sirlərini dərk etmək onların hamısında bir səviyyədə deyildir. Bu məsələ ilahi məsum İmamlar proqramlarında daha gözəl hiss olunur.

İmam Həsən (əleyhis-salam) sülhdən sonra Kufədən Mədinəyə gəlib orada məskunlaşdı. Amma çox yaşamadı; ۴۹ yaşında ikən, Müaviyədən çox-çox qabaq dünyadan getdi. (Müaviyə ۵۸ yaşında ikən xilafəti İmam Həsən (əleyhis-salam)-dan almışdı.)



---

١- [۴۹] Mənaqib, ٢-ci cild, səh.١٢٣.

٢- [۵٠] Muşkatul ənvar (Təbərsi), səh.١۵۴.

## YEDDİNCİ HİSSƏ

## MÜAVİYƏNİN HİYLƏSİ

Fərvət ibni Nofəl Əşcəi ۵۰۰ nəfər xəvariclə kənara çəkilib Zur şəhərinə getmişdi. Onlar deyirdilər ki, indi hökmən hökumət ilə müharibə etmək lazımdır. İndi ki, Müaviyə hakimiyyətə gəlib xəlifə oldu, onunla müharibə etmək bizə vacibdir. Buna görə də İraqa gəldilər, Kufənin Nüxəylə məntəqəsinə çatdılar. İmam Həsən (əleyhis-salam) isə artıq Kufədən Mədinyə yola düşmüşdü. Həzrət Qadisiyyəyə çatanda, Müaviyəyə xəbər verdilər ki, bu xarici məzhəb (dindən çıxmış) kişi ۵۰۰ nəfərlə itaətsizlik və tüğyan edir. Müaviyə İmam Həsən (əleyhis-salam)-la bağladığı sülhü möhkəmlətmək istəyirdi. Buna görə də ona belə bir məktub yazdı: Fərvət ibni Nofəl xarici ۵۰۰ nəfər döyüşçü ilə Kufəyə gəlibdir. Sizə əmr edirəm ki, onunla vuruşub məğlub edəsiniz. .Bundan sonra Mədinəyə gedə bilərsiniz

İmam Həsən (əleyhis-salam) Qadisiyyənin yaxınlığında ikən bu məktubu aldı. Həzrət :həyasızcasına yazılan bu məktubun cavabında yazdı

Ey Müaviyə! Əgər mən əhli-qiblədən bir nəfər ilə müharibə etmək istəsəydim, əvvəlcə səninlə edərdim. Yalnız İslam ümmətin məsləhəti və qan axıdılmasının qarşısını almaq .üçün müharibə etmədim və səninlə razılaşdım

## MÜAVİYƏ ƏHDİ POZUR

Müaviyənin sülhdən sonra gördü ilk iş peymanı pozmaq oldu. O gündən başlayaraq şiələr ardı-arası kəsilməz əzab-əziyyətlərə, çətinliklərə sinə gərib zülm odunda yanırdılar. Əlaqələr kəsilir, gözlər hədəqəsindən çıxarılırdı. Camaatın gözü önündə onların əl-ayaqları kəsilir, dar ağacından asılaraq həlak edilirdilər. Dərin, vəhşətli zindanlarda boyunlarını zəncirləyirdilər. Mübarizlərin əksəriyyəti əlçatmaz səhralara sürgün edirdilər. Kəsilmiş başları nizələrə keçirirdilər. Süməyyənin oğlu Ziyad Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-ın tərəfdarını tanıyırdı. O, Bəsrəyə hakim seçildikdən sonra hər yerdə onları axtarmağa başladı. Şiələri ələ keçirdikdə ən ağır işgəncələr verir, əllərindən gələn zülmü əsirgəmirdi. Minbərdə söhbət edərkən fəryad edərək deyirdi: Allaha and olsun, fərarilərin əvəzində onların qohumlarını tutacağam. Əgər biri dünyadan getmiş olsa, gələcək nəsillərini zəncirləyəcəyəm. Əgər (bir günahkar xəstələnsə, onun sağlam qohumlarını tutacağam.(١)

## ÇƏTİN GÜNLƏR BAŞLANIR

İmam Baqir (əleyhis-salam) şiələrin o günərdəki çətin şəraitlərini belə bəyan etmişdir: Biz Peyğəmbər Əhli-beyti, həmişə xar olmuş, zülm çəkmişik, öz əsl yerimizdən uzaq düşmüşük. Əzab-əziyyətlərə düçar olmuşuq. Öz haqqımızdan məhrum qalmışıq. Çoxlarımız öldürülüblər. Özümüzün və şiələrimizin



---

.Tarixi Təbəri, ۶-cı cild, səh.١٢۵[۵١] -١

canını qoruya bilməmişik. Digər tərəfdən də yalançılar və ilahi həqiqətlərə inanmayanlar batilə istinad edərək hər şəhərdə zalım hakimlərə yaltaqlanaraq nalayiq qazılar və onların əlaltılarının vasitəsi ilə bizim adımızdan yalan hədislər qoşublar. Onların bizim adımızdan etdikləri rəvayətləri biz heç vaxt deməmişik. Bu alçaqların bu .kimi işlərdən məqsədi camaatı bizə qarşı bədbin etmək olmuşdur

Müaviyənin zamanında ən çətin şərait və amansız irtica İmam Müctəba (əleyhis-salam)-ın şəhadətindən sonra yaranmışdı. O ağır günlərdə bütün şəhərlərdə bizim .şiələrin sayı azalmışdı

Əllər və ayaqlar kiçik bəhanə ilə kəsilirdi. Hər kəsin adı bizim dostlarımızın sırasında .olsaydı, özünü zindana salıb mal-dövlətini qarət edir və evini yerlə yeksan edirdilər

Həzrət İmam Hüseyn (əleyhis-salam)-ın qatili Übeydullah ibni Ziyadın hökuməti zamanına kimi çətinliklər bu minvalla geniş vüsət alırdı. Ondan sonra Həccac ibni Yusif hökmran oldu. O, şiələrin hamısını qılıncdan keçirtdi. Azacıq şübhə və töhmət ilə camaatı tutub əsir edirdi. İş o yerə çatmışdı ki, əgər bir nəfəri kafirliklə müttəhim etsəydilər, onu Əliyyibni Əbitalib (əleyhis-salam)-ın şiəsi kimi qələmə verməyə çox xoşhal olurdu. Təzyiq və irtica o qədər şiddətlənmişdi ki, xeyirxah, təqvalı, doğruçu insanların çoxu belə, yalançı hədis söyləyənlərin keçmişdəkilərin fəzilətinə dair .qondardıqları hədisləri nəql edirdilər

Təəccüblüdür ki, qoşulan bu yalanlara o yazıqlar da inanırdılar. Çünki bu yalan mətləbləri rəvayət

(edənlər nə yalançılıqla, nə də təqvasızlıqla tanınmamışdılar.(١)

Müaviyə bütün imkanlardan istifadə edərək, hər hiylə ilə şiələri qətlə yetirirdi. Onun etdiyi alçaq işlərdən biri də Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-ı söyməyi rəvac vermək idi. Bu çirkin, mənfur işin rəvac verilməsinə o qədər təkid edirdi ki, hətta özü də bu barədə belə demişdi: Bir nəsli bu əqidə əsasında böyüyüb boya-başa çatdırmışam! Bundan da böyük müharibə (təbliğat müharibəsi) olarmı?! Özü də psixoloqi, ruhi təbliğat müharibəsi. Daha sonra Kufədəki adlı-sanlı, tanınmış şiə .ağsaqqallarının hamısını qılıncdan keçirtdi

Mədaini yazır: Ziyad onları hər daşın, kəsəyin altını axtardı, qəlblərində qəribə qorxu, vəhşət yaratdı. Əlləri, ayaqları kəsdi, gözləri çıxartdı. Şiələrin çoxunu xurma .ağaclarının budaqlarından asdı və başqa bir hissəsini də İraqdan qovub didərgin etdi

Bu hadisədən irticanın hücuma keçdiyi o ağır, qəmli günlərdə şiələr üçün necə də ağır keçdiyi məlum olur. Onların rəhbəri İmam Həsən (əleyhis-salam) Allahın əmri ilə .mübarizələri dayandırıb ٢٥ il sükut edən atası kimi sükut etmişdir

Həzrətin səmimi və fədakar köməkçiləri də çox az idi. Sayca çox az olan bu dostların da münafiq və xəvariclərin müqabilində müqavimət göstərməyə gücləri yox idi. Belə ki, münafiqlər Müaviyəyə vədə vermişdilər ki, əgər Həsən müharibə etmək fikrində .olarsa, biz onu tutub sənə təhvil verəcəyik

Şiələrin bir hissəsi də İmam Hüseyn (əleyhis-salam)-a üz gətirdilər. Amma həzrət onların hamısına



---

.Nəhcül-bəlağənin şərhi (İbni Əbil Hədid), ٣-cü cild, səh.١۵[۵٢] -١

başa saldı ki, zəmanənin İmamı Həsən (əleyhis-salam) sülhü qəbul etdiyinə görə, müsəlmanların hamısı ona təslim olmalıdır. Çünki Peyğəmbəri Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm) və Əmirəl-möminin (əleyhis-salam)-ın aşkar buyuruğuna görə .imamət onun öhdəsində idi

## MÜAVİYƏNİN HİYLƏGƏRLİK PLANI

İmam Həsən (əleyhis-salam)-ın müqəddəs vücudu möhkəm, alınmaz bir qala idi ki, şiələr canlarını onun pənahında hifz edirdilər. Müaviyənin o Həzrətin həyatda olduğu zaman faciə törətməyə, zülüm etməyə cürəti yox idi. Buna görə də onun şiələri ilə yaxşı tərzdə rəftar edirdi. Belə ki, Əmirəl-mömin (əleyhis-salam)-ın dostları və şiələri Şama səfər edir, Müaviyə ilə qarşı-qarşıya durub öz söhbətləri ilə həqiqətlərin üstünü .açmağa başlayırdılar

Müaviyə İmam Həsən (əleyhis-salam) kimi böyük bir şəxsiyyətin müqabilində dizə çökdü, Həzrəti özü üçün böyük böyük bir sədd, maneə görüb bu fikrə düşdü ki, onu aradan götürsün. Əks halda heç vaxt özünün alçaq niyyətli əməllərini həyata keçirə bilməzdi. Məxsusən Müğeyrət ibni Şöbənin təlimi ilə Yəzidin vəli-əhdlik məsələsi onu daha çox maraqlandırırdı. O, nəyin bacasına olursa olsun Bəni-üməyyə sülaləsinin .napak, murdar səltənətini möhkəmlətmək istəyirdi

Müaviyə Həzrət İmam Həsən (əleyhis-salam)-ın vücudundan çox qorxurdu. Çünki, sülhün şərtinə əsasən Müaviyə öldükdən sonra xilafət İmam Həsən (əleyhis-salam)-a çatmalı idi. O, bundan çox nigaran idi. O zaman İmam Həsən (əleyhis-salam)-ın ۴۸, Müaviyənin isə ۶۸ yaşı var idi. Buna görə də qərara gəldi ki, həzrəti zəhərləsin. Bu məqsədlə Həzrətin həyat yoldaşına (o, Əşəsin qızı idi) çoxlu pul vermək, onu oğlu Yəzidə almaq kimi yağlı vədələr verərək aldadıb İmam Həsən (əleyhis-salam)-ı zəhərləməyə məcbur etdi. Cödə bu işi gördükdən sonra Müaviyə pul verdi, amma onu Yəzidə almaq vədəsindən imtina edərək kinayə ilə dedi: Mən oğlumun həyatına çox !əhəmiyyət verirəm

İmam Həsən (əleyhis-salam) şəhid olduqdan sonra Müaviyə öz sevincini gizlədə .bilmirdi. O, həmişə İbni Abbasa tənəli sözlərlə bəzi şeyləri xatırladırdı

Kufənin şiələri İmam Həsən (əleyhis-salam)-ın şəhadət xəbərini eşidən kimi dərhal Süleyman ibni Sürəd Xüzainin evinə yığışıb İmam Hüseyn (əleyhis-salam)-a uzun bir məktub yazdılar. Məktubda Həzrətə başsağlığı verib bu dərdlə şərik olduqlarını izhar etdikdən sonra istədilər ki, qardaşının şəhadətinə görə Müaviyənin əleyhinə qiyam .etsin. Onu əmin etdilər ki, öz canlarını bu yolda fəda etməyə hazırdırlar

İmam Hüseyn (əleyhis-salam) yenə də Müaviyə ilə bağlanan əhdnaməni xatırlatdı və onların istəklərinə müsbət cavab vermədi. Habelə onlara nəsihət etdi ki, müharibəyə .təhrik etməkdən çəkinsinlər və nə qədər ki, Müaviyə sağdır, öz evlərində otursunlar

cu hicri ilində İmam Həsən (əleyhis-salam) şəhid oldu. Camaat bu hadisədən çox-۴۹ mütəəssir oldu. Onun şəhadəti camaat üçün o qədər kədərli idi ki, dövrün adlı-sanlı adamları deyirdilər: İmam həsən (əleyhis-salam)-ın şəhadətindən sonra camaat xar və zəlil oldular. Həqiqətdə də bu cür idi. Çünki, bu zaman Müaviyə hər yeri ələ keçirmək üçün şəraiti çox münasib gördü. Daha onun təcavüzləri və zülmlərinin qarşısını almaq üçün bir kəs yox idi. O, Əbu Süfyan sülaləsinin səltənətinin qızıl dövrünə çatmışdı: hər bir hərəkatın qarşışsını alır, onunla müxalifət edən hər kəsi məhv və həlak edirdi. Camaatı həyəcanlandırmaq və Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-a qarşı pis, nalayiq sözlər danışmaq üçün hər vasitə və şəxsdən istifadə edirdi. Elə qorxulu bir mühit yaratmışdı ki, heç kəs qorxusundan cürət .edib Əli adını dilinə gətirə bilmirdi

Bu dövrdə Müaviyənin öz imperiyasında casusları vasitəsi ilə yaratdığı təzyiq o qədər .kəskinləşmişdi ki, heç kəsə, azacıq da olsun, qiyam etməyə imkan vermirdi

O bu dövrdə Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-ın heç hansı .vəchlə təslim olmağa hazır olmayan ardıcllarını ən kiçik bəhanələrlə aradan götürürdü

İmam Baqir (əleyhis-salam) Əhli-beyt və şiələrə qarşı törədilən müsibətləri xatırlayaraq buyururdu: İmam Həsən (əleyhis-salam)-ın şəhadətindən sonra şiələrin başına gələn acınacaqlı hadisələr, onların didərgin salınması olduqca qəmli, qüssəlidir. ,Çünki

Müaviyənin zülmü həddini aşmışdı. Şiələr hər şəhərdə qətlə yetirilirdilər. Bizimlə sadəcə dostluq zindana düşməyə, malın qarət və evlərin viran olmasına səbəb (olurdu.(١

Amma özlərini Müaviyəyə satanlar əmin-amanlıqda idilər. Məsələn, Hətat ibni Yəzid Əhnəf və Cariyə ibni Qüdamə Müaviyənin yanına gəldilər. O Əhnəfə yüz min dinar(٢), Hətata yetmiş min dinar bağışladı. Hətat gileylənməyə başladı. Müaviyə dedi: Bu, (mənə satdıqları dinlərinin qiymətidir! Həttat dedi: Mənim də dinimi al!(٣

Bəli, dinlərini satmaqla amanda qalmaq istəyən bu cür insanlar məxsus imkanlardan istifadə edirdilər. Lakin dinlərini dünyaya dəyişməyə, Müaviyənin qarşısında təslim olmağa razı olmayan pak və şərafətli insanlar nəinki hökumətin məxsuus bəhrələrindən, hətta sadə yaşayışdan belə məhrum



---

(Nəhcül-bəlağənin şərhi (İbni Əbil Hədid[٥٣] -١

Əhnəf ibni qeys Əmirəl-möminin (ə)-ın əshablarından idi. Onun ləqəbi Əhnəf və[٥۴] -٢ Bəsrənin adlı-sanlı adamlarından sayılırdı. Cəməl müharibəsində camaatı, həzrəti Əli (ə)-a itaət etməyə dəvət edirdi. Siffeyn müharibəsində də o həzrətin qoşununda Müaviyəyə qarşı vuruşurdu. Müaviyə hakimiyyətə çatandan sonra onunla get-gəli olmuşdur. Bir dəfə Müaviyə əlli min dinar (qızıl pul) bağışladı. İmam Hüseyn (əleyhis-salam) Kufəyə hərəkət etməzdən qabaq Əhnəfə məktub yazaraq onu köməyə çağırdı, amma Əhnəf ona köməyə gəlmədi. O ömrünün axırlarında ibni Zübeyrin hökumətinə mayil olub Muxtardan uzaqlaşdı və Müsəbin qoşununu onun əleyhinə qaldırdı. O, Müsəbin hakimiyyəti zamanı, yetmiş yaşında ikən Bəsrədə dünyadan getdi. İbni Zübeyr onun dəfn mərasimində piyada, ayaqyalın iştirak etdi, meyyit namazını .qıldı.Biharül-ənvar, ۴۵-ci cild; Əyanüş-şiə, ٧-ci cild, səh.٣٨٣; Ricalü Nəcaşi, səh.٩١

.Tarixi Təbəri, ۶-cı cild, səh.١٣۵[۵۵] -٣

olurdular. Onların yeri ya zindan, ya da sürgün idi. Əgər Əhli-beytə daha çox vəfadar olsaydılar, şəhid olunurdular. Bu məsələnin daha da aydın olması üçün Hücr ibni Ədinin .həyatını nümumə kimi qeyd edirik

## SƏKKİZİNCİ HİSSƏ

### HÜCR İBNİ ƏDİ ETİRAZ EDİR

Müğeyrə Kufənin valisi idi. O, hər dəfə minbərə çıxanda xütbənin sonunda Əmirəl-möminin Əli (əleyhis-salam)-a qarşı nalayiq sözlər danışır, ədəbsizlik edirdi. Hər gün də Hücr ibni Ədi və onun dostlarının ciddi müqaviməti ilə qarşılaşırdı. Elə bir gün olmurdu ki, Hücr ibni Ədi Müğeyrənin bu nalayiq hərəkətindən sonra ona etiraz edərək .onu bu işdən əl çəkməyə vadar etməsin

Bir gün Müğeyrə xütbə oxuyub qurtardıqdan sonra Hücr ayağa qalxıb məsciddəkilərə dedi: Ey iman gətirənlər, haqq-ədaləti bərqərar edənlərdən, Allah üçün şəhadət verənlərdən olun, hətta öz əleyhinizə tamam olsa da!(١) Mən şəhadət verirəm ki, sizin arxasınca nalayiq sözlər danışdığınız şəxs insanların ən yaxşısıdır. Onun fəzilət və ləyaqəti sizin sözlərinizlə aradan gedə bilməz. Siz bu əməlinizlə yalnız özünüzü rüsvay edirsiniz. Sizin təriflədiyiniz şəxslərdə xeyirdən azacıq belə əsər-əlamət yoxdur. Siz elə -bir şəxsiyyətin əleyhinə danışırsınız ki, kiçik



---

.Nisa surəsi, ١٣۵[۵۶] -١

böyük hamı onun fəzilət, şərafət və əzəmətini etiraf edir. Hamı bilir ki, o, İslam övladı və Peyğəmbrin səmimi dostudur. Siz puç hökumətinizin sütunlarını günahsız insanların qanı bahasına möhkəmlətmək istəyirsiniz. Sizin camaat üçün xeyirxah kimi qələmə .verdiyiniz şəxslərin İslama heç bir xeyri yoxdur

Başqa gün Müğeyrə məsciddə Həzrətə nalayiq sözlər deyəndə Hücr ayağa qalxıb mərdliklə öz etirazını bildirərək dedi: Ey Müğeyrə! Pərhizkarların rəhbərinə iftira yağdırmaq və səni bu məqama çatdıran keçmişi qara ləkəli, bədəməl insanları tərifləməkdənsə, yaxşı olar ki, camaatın maaşını verəsiniz, xalqı pis günə qoyan yoxsulluq və nadanlıqdan nicat verib, israfkarlığa sərf etdiyiniz haqlarını özlərinə .çatdırasınız

Daha sonra onu daşlamağa başladı. O da minbərdən enməyə məcbur oldu. Cammat Hücrün sözlərini təsdiq və tərəfini saxlamaq üçün ayağa qalxdı. Müğeyrənin ətrafında olan muzdurlar Hücrə qarşı etdiyi mülayim rəftardan heyrədə dalmışdılar. Ondan onu nə üçün öz başına qoyursan deyə soruşduqda, cavab verdi: Bu xoş rəftar ilə Hücrü tələyə salmışam. Çünki o öz yolunu bu minvalla davam etdirəcəkdir. Məndən sonra bir hakim gələcəkdir ki, Hücr onu da mənim kimi səbirli təsəvvür edəcəkdir. Amma həmin hakim onu tutdurub qətlə yetirəcək. Mən ömrümün son anlarında bu şəhərin adlı-sanlı şəxsiyyətlərinə, ağsaqqallarına əzab-əziyyət verib bu cinayətimlə Müaviyənin işini .dünyada möhkəmləndirmək, özümü isə axirət əzabına düçar etmək istəmirəm

## ZİYAD KUFƏNİN VALİSİ OLUR

Müğeyrət ibni Şöbə əllinci hicri ilində öldü. Müaviyə Ziyad ibni Əbihi Bəsrə və Fars məntəqəsinin hökmdarlığından əlavə, Kufəyə də hakim seçdi. O, bu vasitə ilə Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-ın dostlarının baş qərargahı sayılan Kufəyə .qaniçən, satqın və fəsad törədən bir rəzil şəxsi hakim etdi

Ziyad əvvəllər Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-ın şiələri ilə dostluq edirdi. Sonralar isə onlara qarşı ən qatı düşmənlərdən biri oldu. Bu cani hakimiyyəti ələ .keçirdikdən sonra şiələrin qiyamını boğmaq üçün sərt polis reqimi tətbiq etdi

Bu qaniçən, kinli şəxs Kufəyə çatdıqdan sonra özünün tarixdə məşhur olan söhbətinə başladı. Söhbətdən əvvəl Allaha həmd-səna, Peyğəmbərə salavat göndərmədi. Bu iş onun ən böyük ədəbsizliyi və hörmətsizliyi idi. Elə həyəcəan yaratdı ki, hamı öz işini bildi. Müxaliflərin mallarını qarət və müsadirə etməklə təhdid etdi, heç kəsə danışmaq icazəsi vermədi. Ona qarşı müqavimət göstərənlərə ölüm cəzası təyin etdi. Kobud və (təhqiramiz sözlər danışaraq hər bir hərəkəti boğub məhv edəcəyini elan etdi.(١

Ziyad əvvəllər Əmirəl-möminin Əli (əleyhis-salam)-ın tərəfində Fars məntəqəsinin valisi idi. Bu məntəqənin idarə olunmasında xeyli müvəffəqiyyətlər qazanmışdı. Belə ki, Müaviyə onun qüdrətindən, nüfuzundan və idarəçiliyindən təəccüb edirdi. O, həm bacarıqlı, həm də hiyləgər və



---

.Tarixi Yəqubi ٢-ci cild, səh.١۶٢[۵٧] -١

şeytansifət bir adam idi. Məhz buna görə də uzun müddət Müaviyənin qulluğunda idi. Bu müddətdə Müaviyə üç məntəqənin: Fars, Bəsrə və Kufənin hökmdarlığını ona həvalə etmişdi. Qeyd olunmalıdır ki, o zaman tənha Fars məntəqəsi çox geniş ərazi olmaqla Əhvaz və Farsdan Hindistan sərhədlərinə qədər; Kufə məntəqəsi Xorasanın yaxınlığına qədər bütöv İran ərazilərini əhatə edirdi. Bəsrə məntəqəsi də öz növbəsində çox böyük əraziləri əhatə edirdi. O zamanlar (Müaviyənin dövründə) Bəsrə və Kufənin idarə olunması çox da asan deyildi. Ondan qabaq qısa müddət ərzində bir neçə hökmdarı dəyişmişdilər. Çünki onların bu məntəqələri idarə etməyə ləyaqətləri yox idi. O zamanlar bu iki məntəqədə bir qurup camaat Müaviyənin əleyhinə qiyam etmişdilər. Ziyad ora varid olduqdan sonra qiyamların hamısını yatırdıb qiyamçıların hamısını tutdu və əl-qolu bağlı halda Müaviyənin yanına göndərdi. O, bu məntəqələrdən o vaxta kimi misli görünməyən miqdarda vergi toplayıb Müaviyəyə verdi. Onun atası məlum olmadığından, Ziyad ibni Əbih (atasının oğlu) adlandırırdılar. Bəzən onu anasının, bəzən də atalarından birinin adı ilə çağırırdılar. Çünki onun anası zinakar (fahişə) bir qadın idi. (۱) İlk dəfə Ayişə onu Ziyad ibni Əbih adlandırmışdır. Bu qədər qüdrət və təriflərlə yanaşı, atası məlum olmadığı üçün qəlbində kinəsi var idi. Müaviyəyə yaxınlaşana qədər bu minvalla davam etmişdir. Hər yerdə bir zinazadə, haramzadə tapılsaydı, onu Əbu Süfyana aid edirdilər. Bu da onun



---

Cahiliyyət dövründə bəzi fahişə qadınlar müştərilərin nəzərini cəlb etmək üçün[۵۸] -۱ evlərinin damına bayraq sancırdılar. Onlara zatül-ələm (bayraq sahibləri) deyilirdi. .Müaviyənin, Əmr Asın və Ziyadın anası da bu qəbildən idi

böyük iftixarlarından idi. Özü də bunu istəyirdi. Əmr ibni Asın barəsində də belə iddiada olmuş, onu öz oğlu hesab etmişdir. Bu səbəbdən Ziyadı öz adamları hesab edərək deyirdilər ki, Əbu Süfyan da Süməyyə (Ziyadın anası) ilə qeyri-qanuni cinsi əlaqədə olmuşdur. Müaviyə Ziyadın Əbu Süfyanın övladı olduğunu sübut etmək üçün şahid .gətirdi və bunu İslam ölkələrinin hər yerində elan etdi

Adlı-sanlı şəxslərdən biri olan Yunis Səqəfi Müaviyəyə dedi: Sən bu işə şahid gətirməklə Ziyadın sənin qardaşın olduğunu deyil, atanın zinakar olduğunu sübut etdin. Müaviyə də onu hədələdi ki, bir də səsini çıxartmasın. Bundan sonra Ziyad özünü .Əbu Süfyanın oğlu hesab edirdi

İbni Əbil Hədid yazır: Müaviyə İraqın hökumətini Ziyada verdi. Əvvəllər Ziyad şiə olduğundan, şiələrin hamısını tanıyırdı. Buna görə hər yerdə bir şiə gizlənsəydi, tapıb öldürür, yaxud da işgəncə verdikdən sonra sürgün edir, bəzilərini də diri-diri yerə (basdırır, bəzilərini də dar ağacından asırdı.(١

Həmçinin qeyd olunur ki, Ziyad Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-ın vəfalı dostlarından biri olan Rəşid Hicrini, şiə olduğuna görə dilini kəsib dar ağacından .asdı

Əvvəllər Ziyad Hücr ibni Ədi ilə dost idi və onun parlaq keçmişindən xəbərdar idi. Buna görə də bir nəfər göndərib onu çağırtdırdı və dedi:–Ey Hücr, sən mənim Əli ilə dostluq ?və yaxşı münasibətimi görmüşdünmü

!Hücr:–Bəli



---

(Nəhcül-bəlağənin şərhi (İbni Əbil Hədid[٥٩] -١

Ziyad:–İndi bu dostluq kinəyə və düşmənçiliyə çevrilmişdir! Sən mənim Müaviyəyə ?qarşı nə qədər kinli və düşmən olduğumu bilirdinmi

!Hücr:–Bəli

Ziyad:–Bu kinə və düşmənçilik dostluğa çevrilmişdir! İndi gərək Əlinin yaxşılığına və Müaviyənin pisliyinə danışmayasan. Ey Hücr, ehtiyatlı ol ki, öz əlinlə öz qəbrini qazmayasan! Mən bu gün səninlə dostam, istəyirəm bu dostluğumuz davam etsin. Sən .hər gün yanıma gəl, hər işin olsa mənə deməlisən ki, mən dərhal o işi görüm

Bunların hamısı, Ziyadın nəzərdə tutduğu işlər idi və onları yerinə yetirmək üçün .mümkün olan hər vasitədən istifadə edir, hər növ cinayətə əl atırdı

### HÜCR ZİYADA ETİRAZ EDİR

Ziyad Əmr ibni Hərisi öz yerində qoyub Kufədən Bəsrədəki qərargahına yola düşdü. O, Ziyadın müavini kimi, Kufə ağsaqqallarını məscidə çağırdı. İstər-istəməz Hücrün yaxın dostları da gəldilər. Əmr ibni Həris xütbə oxuyub Osmanı təriflədi, ərbabının müqabilində nökər sifətini zahir etdikdən sonra, camaatı tabeçiliyə, itaət etməyə .səslədi

Bu həssas anlarda Hücr ibni Ədi və onun dostları ayağa qalxıb təkbir deyərək onu, Ziyadı, Müaviyəni və Osmanı pislədilər. Ona həmlə edib daşa basdılar və minbərdən aşağı saldılar. O Darul-imarəyə (hökumət sarayına) qaçmağa məcbur oldu. Qapıları möhkəm bağlayıb hadisəni Ziyada xəbər verdi. Sonra təkid etdi ki, əgər Kufəni əldə ,saxlamaq istəyirsənsə

.yubanmadan qayıt. Əks halda Hücr ibni Ədi öz köməkçiləri ilə hər yeri əlinə keçirəcək

Ziyad təcili surətdə Kufəyə gəldi. Cümə günü minbərə cıxıb belə bir hədələyici xütbə söylədi: Əgər bu kiçik məntəqədə Hücrün yaratdığı iğtişaşın qarşısını ala bilməsəm, kişi deyiləm! (Sonra Hücr ibni Ədiyə xitabən dedi:) Ey Hücr, bəxtin gətirmədi! Sənin məsəlin gecə qaranlığında yem axtarmağa gedib səhvən canavara qismət olan heyvanın .məsəli kimidir

Ziyad düz deyirdi; çünki o, canavar idi. Elə bir canavar ki, insanlara hücum edib onları parçalayırdı. O, bir canavar idi ki, başqa canavarın vasitəsilə çoban paltarında qoyunların arasında zahir olmuşdu. Elə bir canavar ki, başqa canavarın köməyi iə .şərafətli insanları didir, parçalayır, boğurdu

## HÜCRÜN TUTULMASI FƏRMANI

Ziyad fərman verdi ki, Hücr ibni Ədini tutsunlar. Amma onun muzdurları Hücrə hücum etdikdə onun səmimi dostları onların qabağını alıb dedilər: Biz Hücrün Ziyadın yanına getməsinə icazə verməyəcəyik! O, Ziyadın fərmanına boyun əymir! Bu minvalla, muzdrlar Hücrün dostlarının kəskin və güclü müqaviməti ilə qarşılaşıb geri çəkilməyə .məcbur oldular və bu işin öhdəsindən gələ bilməyəcəklərini Ziyada xəbər verdilər

Bu hadisədən sonra Ziyad təqibi gücləndirərək Hücrü tutmaq üçün daha çox adam göndərdi. Amma bu dəfə də məğlub oldular. Hücr öz dostları ilə əvvəldəki kimi mərd-mərdanə dayanıb, öz

mətinliklərini davam etdirdilər. Kufədə vəziyyət gərginləşmişdi. Ziyad camaatı Hücrün ətrafınadan dağıtmaq üçün yeni-yeni hiylələrə əl atdı. Camaatı ondan uzaqlaşdırmaq, onu təkləmək məqsədilə Kufənin ağsaqqallarını dəvət edib onlara dedi: Siz bir əlinizlə başınızı yarıb o biri əlinizlə məlhəm qoyursunuz. Sizin ürəkləriniz Hücrlədir. Çünki, öz qardaş və oğlanlarınızı onu himayə etmək üçün göndərir, özünüz isə mənim yanıma gəlirsiniz. Bu, sizin qurduğunuz hiylədir. Dərhal ondan uzaqlaşmalısınız. Əks halda .çoxlu qoşun göndərib azğınçılıq və inhirafınızı islah edəcəyəm

Öz mənfəət, imtiyaz, sərvət və qüdrətlərini təhlükədə görən Kufə ağsaqqalları təlaş və həyəcan içində yerlərindən qaxıb dedilər:–Bizim hamımız sənin fərmanına tabeyik. Hər !nə istəyirsən de, biz yerinə yetirməyə hazırıq

!Ziyad dedi:–Tez olun öz qohum-qardaşlarınızı Hücrün ətrafından dağıdın

Kufənin nüfuzlu şəxsləri onun fərmanlarına əməl edərək dərhal öz adamlarını geri çağırdılar. Ziyad bu yolla Hücr ibni Ədini təkləyib dostlarının sayını azaltdı. Bir neçə nəfər istisnla olmaqla bir kəs qalmadı. Hücr bir müddət çarpışdıqdan sonra gizləndi. Ziyad bu dəfə təhdid etməyə başladı və qədimki hiylələrini işə saldı. Hücrün mənsub olduğu qəbiləsinin rəisi Məhəmməd ibni Əşəsi çağırtdırıb hədələyərək dedi:–Allaha and olsun, əgər Hücrü təhvil verməsən əmr edəcəyəm ki, sənin xurma ağaclarını .dibdən kəsib evlərini yerlə yeksan etsinlər. Özünü də tikə-tikə doğrayacağam

Məhəmməd ibni Əşəs işin bu yerə çatdığını gördükdə Hücrü təhvil vermək üçün üç gün .möhlət istədi

Hücrün dostlarının hamısı Ziyadın polisinin vasitəsi ilə tutuldular. Dostlarının tutulması və Ziyadın hədə-qorxu gəlməsi xəbəri Hücrə çatdı. Onun vicdanı heç vaxt qəbul edə bilməzdi ki, özü gizlənsin, dostları isə cəlladların işgənəsi altında can versinlər, qəbilə üzvləri təqiblərə məruz qalsınlar, qohum-əqrəbası qətlə yetirilsin və əmlaklarının .müsadirə edilməsi ilə hədələnsinlər

## HÜCRƏ AMAN VERİLDİ

Hücr bir nəfəri Məhəmməd ibni Əşəsin yanına göndərib ona təklif etdi ki, Ziyadın yanına gedib ondan aman alsın ki, ona ziyan vurulmasın və onu mühakimə olunmaq üçün Müaviyənin yanına göndərsin. Hücrün fərmanının ardınca Məhəmməd ibni Əşəs Kufənini ağsaqqalları və tanınmış şəxsiyyətlərindən bir neçəsini çağırıb birlikdə, Hücrün təklifini müzakirə etmək üçün Ziyadın yanına getdilər. Müzakirədən sonra aman aldılar ki, Hücrü Müaviyənin yanına göndərsin. O, bu təklifi qəbul etdi və Hücrə .zərər vurmayacağına söz verdi

Yalnız bundan sonra Hücr baş qərargaha daxil oldu. Ziyad onu danlamağa, məzəmmət etməyə başladı. Elə güman etdi ki, Hücrün əl-ayağını bağlamaqla məğlub etmişdir. Buna görə dedi:–Camaat bizimlə müharibəni dayandırıb təslim olduğu zaman sən ?bizimlə müharibə etmək istəyirsən

Daha sonra ona bəzi hədələyici sözlər dedi ki, hamısı onun yırtıcılıq xasiyyətindən və –:qaniçən olmasından söz açırdı. Hücr onun cavabında dedi

Sən mənim canıma və malıma aman vermisən və söz vermisən ki, məni Müaviyənin .yanına göndərəsən

Ziyad dedi:–Əgər verdiyim amanın ehtiramı məsələsi olmasaydı, elə bu saat səni !öldürərdim

.Daha sonra fərman verdi ki, onu zindana salsınlar

### HÜCR MÜAVİYƏNİN YANINA GÖNDƏRİLİR

Ziyad əsirləri cəzalandırmaq üçün Müaviyənin yanına göndərməli idi. O, törətdiyi cinayətlər qarşısında özünə bəraət qazandırmaq və camaatı daha çox qorxutmaq üçün Kufə ağsaqqallarını dəvət edib onlara dedi ki, Hücr və dostlarının əleyhinə şəhadətnamə yazsınlar. Daha sonra camaatı məcbur etdi ki, şəhadətnamənin altını imzalasınlar. Onun özü kimi ruhi xəstəliklərə düçar olmuş bir qrup satqın, o cümlədən Osmanın zamanında da cani sayılan Üqbət ibni Əbi Muit, Əbu Musa Əşərinin oğlu və s. .kimi bir neçə nəfər bir yerə yığışıb şəhadət verdilər

Saxta və başdan-başa yalanla dolu olan şəhadətnamə yazıldı. Dustaqları Dəməşqə göndərmək üçün hazırladılar ki, orada Müaviyənin ədalətli məhkəməsində mühakimə olunsunlar (!) və əvvəlcədən çıxarılmış hökmlər icra olunsun. (Dustaqların sayı ۱۴ nəfər (.idi

Ziyad ibni Əbih cəlladlarından ikisinə əmr etdi ki, məhbusları Şama aparsın. Onları zəncirlə bağlanmış halda kecavəyə mindirib sübhdən axşama qədər Kufə meydanında saxladılar ki, hamını qorxudub bildirsinlər ki, bunlar Əmirəl-möminin Əliyyibni Əbitalib .(əleyhis-salam)-ı himayə edənlərdir ki, axır-aqibətləri belə oldu

səh:۱۰۰

Gecə əsirlər karvanı hərəkət edib bir müddətdən sonra Dəməşqin ١٢ milliyindəki Mərc Əzra adlı bir yerə çatdı. Bura həmin yer idi ki, Hücr ibni Ədi İslam qoşunu ilə Şamı fəth .etmək üçün oraya gəlmişdi. Orada təkbir deyən ilk müsəlman da məhz o idi

İndi isə bu kəndin canavarları onu parçalayıb qanını axıtmaq istəyirdilər. Məhbusları .orada saxladılar. Müaviyə onların saraya daxil olmalarına icazə vermədi

Ziyadın məmurları məktubları və şəhadətnamələri Müaviyənin yanına apardılar və onu əsirləri gətirdiklərindən və məktubların mətnindən xəbərdar etdilər. Saray işçiləri Şamın adlı-sanlı adamlarından bir qrupunu çağırdı. Müaviyə onların yanında şəhadətnamənin mətnini oxudu və məhbusların günahını geniş surətdə şərh etdi. Sonra məclis əhlinin müttəhimlər barəsindəki nəzərlərini soruşdu. Hər kəs bir söz dedi... Sonra Ziyadın məktubunun cavabını belə yazdı: Hücr ibni Ədinin işində çox fikrləşdim. Gahdan onu əfv edib bağışlamağa, gahdan da ölümə layiq kördüm. Ziyad bu məktubun mətnindən xəbərdar olduqdan sonra (onda intiqamçılıq və şeytan xasiyyəti olduğuna görə həmişə nahaq yerə başqalarının qanını axıtmaq istəyirdi) öz yaxın adamlarından birini çağırıb onun vasitəsi ilə Müaviyəyə xəbər verdi ki, əgər Kufənin hökmranlığını əlində saxlamaq istəyirsənsə, Hücr və yoldaşlarını hökmən .aradan götürməlisən

Bu şəxs öz yolüstü Mərci Əzrada dayanaraq Hücrün dostlarına nəsihət etməyə başladı. Onlara xəbərdarlıq etdilər ki, əgər diri qalmaq istəyirsinizsə, Əlidən bezarlıq edin. Amma Hücr və dostları öz niyyətlərində qətiyyətli və möhkəm idilər. Bu təklifi qəbul etmək onlar üçün qeyri-məntiqi və

insaniyyətdən uzaq idi. Onlar inanırdılar ki, əgər bu işi qəbul etsələr təkcə Əlidən yox, həm də İslamdan bezarlıq etmiş olurlar. Hücr ona dedi ki, sifarişini Müaviyəyə çatdırıb desin ki, şahidlər düşmənçilik və həsədlə bizə töhmət vurdular. Bu söz Müaviyəyə çatdıqdan sonra onun kin-küdurətlə dolu olan qəlbi haqq sözləri qəbul etmədi, dedi ki, .Hücrün sözləri yox, Ziyadın sözləri düzdür

## HÜCRÜN VƏ DOSTLARININ ŞƏHADƏTİ

Müaviyə işi birdəfəlik etmək üçün öz cəlladlarından üç nəfəri Mərci Əzraya göndərdi ki, əfv edilənləri azad edib Hücrü və onun yoldaşlarını isə öldürsünlər. Cəlladalar oraya çatdıqda biri həyasızcasına Hücr ibni Ədiyə dedi:–Ey yolunu azmışların rəisi, ey küfrün, tüğyanın və Əbu Turabın qulu! Əmir bizə əmr edibdir ki, əqidənizdən əl çəkib Əlidən bezarlıq edərək onu lənətləməyi təklif edək; əgər qəbul etsəniz azad olacaqsınız; yox .əgər qəbul etməsəniz hamınız öldürüləcəksiniz

Hücr dedi:–Bizim üçün iti qılınclara dözmək sizin təklifinizi qəbul etməkdən çox-çox asandır. Biz heç vaxt bu cür alçaq, namərdcəsinə olan işi qəbul etməyəcək, ölümü qarşılayacağıq, çünki, Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) və Əmirəl-möminin (əleyhis-salam)-ın hüzurunda olmağı cəhənnəm oduna daxil olmaqdan qat-.qat üstün tuturuq

Onlar ağır qandalları o alicənab insanların əllərindən və ayaqlarından açdılar, kəfənləri hazırlayıb qəbirləri qazmağa başladılar. Bu

cinayətkarlar bu əməllərlə Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-ın dostlarının ruhiyyəsini zəiflətmək, ölüm əlamətlərini onlara göstərməklə özlərinə tərəf cəlb etmək istəyirdilər. Bu da Əli (əleyhis-salam)-ın dostları və şiələri üçün zatən qeyri-mümkün bir iş idi.

Cəlladlar Hücrə və dostlarına bir gecə möhlət verdilər. Onlar da fürsətdən istifadə edib bütün gecəni namaza, Allaha raz-niyaza, münacata məşğul oldular.

Müaviyəyə aldananlar bu igidlərin vəziyyətini müşahidə edib onların gecə namazı qılan həqiqi abid olduqlarını gördükdə dedilər: –Biz sizin bütün gecəni namaz qıldığınızı və yaxşı dua etdiyinizi gördük. İndi isə gecələri oyaq qalıb ibadətə məşğul olan Osmanın barəsində nəzərinizi bəyan edin. (Bu bədbəxtlərin hələ də İslamdan dəqiq və düzgün xəbərləri yox idi. Elə fikirləşirdilər ki, Müaviyə və Osman İslamın təcəssümü, bariz nümunələridir.)

Dedilər: –Onlar müsəlmanlar arasında zalımcasına hakimlik edib, çoxlu qanunsuz, xilaf əməllər və xoşagəlməz işlər görən ilk şəxslər idilər.

Müaviyənin adamları dedilər: –Əmir sizi elə yaxşı tanıyıbdır!

Cəlladlardan biri onların yenidən Əli (əleyhis-salam)-dan bezarlıq etmələrini təklif etdi. Amma cavabda Biz Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-dan bezarlıq etmək deyil, əksinə, ona daha da yaxınlaşmaq istəyirik kəlamını eşitdilər.

Bundan sonra onları bir-bir tutub boyunlarını vurdular. Nəhayət növbə Hücr ibni Ədiyə çatdı. Onun nəzərində namaz həyatının ilk anlarından etibarən əzəmətli və dəyərli olduğundan cəlladlardan dəstəmaz alıb iki rəkət namaz qılmağa möhlət istədi. Ona icazə verdilər. Dəstəmaz alıb namaz qılmağa

başladı, ömrünün axır anlarını Allah ilə raz-niyaz etməklə keçirtdi. Namaz qurtardıqdan sonra onu məzəmmət edib söydülər və dedilər:–Ölümdən qorxduğun ?üçün namazı uzatdın

Hücr dedi:–Allaha and olsun, mən bütün ömrüm boyu bu qədər qısa namaz .qılmamışdım

Sonra dua etmək üçün əllərini asimana doğru qaldırıb dedi: Pərvərdigara! Biz Səndən istəyirik ki, intiqamımızı bu camaatdan alasan!! Çünki, Kufə əhli bizim barəmizdə yalandan şəhadət verdilər. Şam camaatı da bizi nahaq yerə öldürür. (Sonra onlara dedi:) Allaha and olsun, məni bu yerdə öldürürsünüz, amma bilin ki, bu diyara zəfərlə daxil olan ilk süvari, təkbir səsini bu yerdə ucaldan ilk müsəlman mən olmuşam. Bu ...diyarın itləri ilk dəfə mənim üstümə hürmüşlər

Daha sonra vəsiyyət edib buyurdu:–Məni bu halda qəbrə daxil edin və bədənimin qanını yumayın, çünki elə bu halda–zəncir ayağımdan açılmamış halda Müaviyə ilə ...görüşmək istəyirəm

Məlunlar irəli gedib İslamın mətin övladını, Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-.salam)-ın səmimi dostunu qanına qəltan etdilər

Qırxıncı il Ramazan ayının ۲۰-də Hücr ibni Ədi azadlıq sevənlərin başçısı və azad insanların böyük rəhbəri Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-a belə demişdi: Allaha and olsun, ya Əmirəl-möminin, əgər bədənimi qılıncla tikə-tikə doğrasalar, məni oda atmaq üçün tonqal qalasalar da, mən bunların hamısını qəbul .edərəm, amma səndən ayrılmağı qəbul etmərəm! ...Və o tarixdən on bir il keçmişdi

## MÜAVİYƏNİN PLANLARI, YEZİDİN VƏLİƏHDLİYİ

Müaviyə İmam Həsən (əleyhis-salam)-ın şəhadətindən xəbər tutan kimi dərhal Yezidin vəliəhdliyi məsələsini ortaya atdı. Bununla da öz arzusuna–əməvi sülaləsinin hökmranlığının davam etdirilməsi arzusuna çatmaq istəyirdi. Lakin bu iş çox da asan deyildi. Buna görə də Müaviyə çox ehtiyatla hərəkət edir, öz hökmranlığına məxsus olan bütün vasitələrdən (siyasi oyunlar, küllü miqdarda bəxşişlər, rüşvət təklif etmək, tamahlandırmaq və nəhayət hədə-qorxu gəlmək) istifadə edirdi. O, qəbilə başçılarını ələ almaq, onların içərisində olan qətiyyətli şəxsləri sakitləşdirmək, yerində oturtmaq .yolu ilə işə girişdi

Bu kimi işlər ölkənin hər yerində tətbiq olunurdu. Lakin Hicazda tətbiq olunan iş tərzi başqa vilayətlərlə daha çox fərqlənirdi; Hicaz elə bir yer idi ki, orada Peyğəmbər .səhabələrinin övladları yaşayırdı

## MÜAVİYƏ MƏDİNƏDƏ

Müaviyə xalqdan Yezid üçün beyət almaq qərarına gəldikdən sonra Mədinəyə yollandı. İmam Hüseyn (əleyhis-salam) ilə İbni Abbas onun yanına gəldi. Əvvəlcə Müaviyə İmam Həsən (əleyhis-salam)-ın övladlarının əhvalını soruşdu. Həzrət də onun cavabını verdi. Daha sonra Müaviyə bir xütbə oxuyaraq Rəsuli-Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm)-i xatırlayıb axırda dedi:–Siz əvvəldən Yezidin işindən xəbərdarsınız. Allah şahiddir ki, Yezidi vəliəhdlik məqamına seçməkdə məqsədim

ixtilafları və təfriqələri aradan qaldırmaqdan başqa bir şey deyildir. Belə iş çox gözəldir, bunu yalnız bəsirətli olanlar qəbul edər bilərlər. Bu mənim Yezid haqqındakı fikrimdir. Sizə gəldikdə isə, bir tərəfdən qohum, digər tərəfdən həmyerli, həm də alicənab insansınız. Bu fikrimi təsdiq etməkdə Siz daha ləyaqətlisiniz. Mən Yezidi müxtəlif işlərdə yoxlayıb, onda elə mühüm xüsusiyyətlər görmüşəm ki, bu xüsusiyyətlər hətta sizdə belə yoxdur. Bundan əlavə, o həm sünnə, həm də Quranla »tanışdır, dözümlüdür və həm də

İndi isə mən siz iki nəfərdən yalnız insaf gözləyirəm, çünki təkcə qohum-əqrəba deyil, hamı sizin fikrinizə uyğun şəkildə söz danışır. Böyük Allahdan özümə və sizə .bağışlanmaq istəyirəm

### İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN MÜAVİYƏYƏ CAVABI

Müaviyə sözlərini biaptirdikdən sonra İbni Abbas sözə başlamaq istədi, lakin İmam .Hüseyn (əleyhis-salam) işarə ilə ona başa saldı ki, sakit ol, onun məqsədi mənəm

İmam (əleyhis-salam) ayağa durdu, Allaha şükür edib Peyğəmbərə salavat göndərdi, sonra buyurdu:–Ey Müaviyə! Hər hansı natiqin sözü nə qədər uzun-uzadı olsa belə, Rəsulullahın gözəl xüsusiyyətlərini sayıb qurtara bilməz, yalnız onun gözəl sifətlərinin bir qismini sadalayar. Mən bilirəm ki, Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in vəfatından sonra İslam ümməti hansı yolu seçmişlər. Onlar Nəbiyyi Əkrəmin ,mədhində olanları puç edərək

.onunla canişin (xəlifə) barəsində olan beyəti pozmuşlar

Çox əfsus ki, günün parlaq işığı gecənin qaranlığını rüsvay edərək onun parlaq nuru .çıraqların işığını azaltdı

Sən acgözlükdə ifrata vararaq ləyaqətsiz adamlara üstünlük verməkdə həddini .aşmısan

Paxıllıq etməyə adət verərək haqları ödəməkdən boyun qaçırmısan. Zülm etməyi rəva bilmisən. İnsan hüquqlarının ödənməsinə zərrə qədər də olsun belə riayət etməmisən. Nəticədə isə şeytan öz kamil bəhrəsini çox yüksək keyfiyyətlə əldə etmişdir. Amma Yezidin İslam ümmətinə rəhbərlik üçün ləyaqətli olması ilə yanaşı onun insani sifətləri barədə dediklərindən belə məlum olur ki, deyəsən camaatı Yezidin haqqında zəlalətə salmaq istəyirsən. Onun barəsində elə danışırsan ki, sanki pərdə dalında olan bir insan haqqında təsəvvür yaradır, tanınmaz bir şəxsi tanıtdıraraq guya xüsusi, yaxud məxfi bir işi akşkar edirsən! Yox! Belə deyil! Ey Müaviyə, Yezid özünü yaxşı tanıtdıraraq öz qabında olanları hamıya göstərmişdir. Əgər onun xüsusiyyətlərindən sadalamaq istəyirsənsə ov itlərindən, eyş-işrətlə məşğul olduğu gözəl qızlarından xəbər ver, kef !məclislərində onun üçün oxuyan müğənni qadınların barəsində danış

Bəli, Yezid elə bir adamdır ki, mənə tanıtdırmağına ehtiyac yoxdur. Doğrudan, görəsən sənin çiynində olan bu qədər günah yükü Qadir Allahla görüş üçün kifayət deyildirmi ki, indi də camaatı zəlalətə salmaq yükünü günahlarının üstünə gələsən?! Allaha and olsun ki, sən həmişə yaramaz işlər görmək qəsdindəsən, zülm və işkəncədən başqa ,ayrı bir işin yoxdur. Cinayətlərin hər yeri tutmuşdur

səh:۱۰۷

amma sənin ölümlə çox da fasilən yoxdur; tezliklə qiyamət günü gəlib çatacaq, o gün gördüyün bütün əməllərindən hesab-kitab çəkiləcək, lakin qaçmağa yolun olmayacaqdır. Ey Müaviyə! Sən ki bizə qarşı çıxıb bizi öz ata-babalarımızın qanuni haqlarından məhrum etmisən! Elə haqlar ki, Rəsulullah təvəllüdümüzün ilk günündən bizim üçün müəyyən etmişdi. Sən bizim haqqımızı qəsb etmək üçün müxtəlif iyrənc bəhanələrə əl atdın. Elə xilafət iddiaçıları da Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in canişininin haqqını (onun vəfatından) qəsb etdikdən sonra həmin bəhanələrə əl atmışdılar. O bəhanələri dəlil kimi qəbul edərək insaf tələb etmişdir. Bəli, siz hər cür cinayətə əl atıb hər sözü danışdınız. Nəhayət, iş o yerə çatdı ki, sən .Peyğəmbərin yerinə keçdin, halbuki xilafət libası başqa şəxsin bədəninə biçilmişdi

Müaviyə İmam Hüseyn (əleyhis-salam)-ın sözlərindən sonra İbni-Abbasa baxıb dedi:– .Bunlar nədir?! Yəqin ki, sən də bu sözləri söyləyəcəksən

İbni-Abbas onun bu sözlərinin cavabında dedi:–Allaha and olsun, o, Peyğəmbər övladı, Ali-Əbanın beş nəfərindən biridir. O, pak və məsum bir ailədə böyümüşdür. Hər nə istəyirsən ondan soruş, bil ki, Allah Öz hökmünü icra edəcəkdir. O, hökm edənlərin ən (yaxşısıdır.(١



---

(Əl-imamətu vəs-siyasət (İbni Qüteybə[۶٠]-١

## MÜAVİYƏYƏ XƏBƏR

Mərvan Müaviyə tərəfindən Mədinəyə vali təyin edilmişdi. O, Müaviyəyə aşağıdakı :məzmunda bir məktub yazdı

Əmr ibni Osman xəbər verib ki, İraq və Hicazın tanınmış şəxsiyyətləri Hüseyn ibni Əli ilə əlaqə yaratmışlar. Mən bu barədə axtarış aparmışam. Məlum olmuşdur ki, onun .hökumətlə müxalifət niyyəti var. Bu barədə öz fikrini mənə bildir

:Müaviyə məktubun cavabında belə yazdı

Məktubun mənə çatdı, Hüseyn ibni-Əli barəsində yazdıqlarını oxudum. Sənə sifarişim budur ki, qətiyyən onunla işin olmasın! Nə qədər ki, onun səninlə işi yoxdur, ona maneçilik törətmə! Hələlik o, bizim beyətimizdədir, buna görə də onu incitmək .niyyətimiz yoxdur. Sən onu izlə, lakin ehtiyatlı ol ki, onunla qarşılaşmayasan

## MÜAVİYƏNİN İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–A MƏKTUBU

Eləcə də Müaviyə İmam Hüseynə (əleyhis-salam) aşağıdakı məzmunda bir məktub :yazdı

Sənin barəndə mənə bəzi xəbərlər çatmışdır ki, əgər düz olsalar heç də sənə yaraşan işlər deyildir. Mən səni belə işlərə baş qoşmaqdan çəkindirirəm. Hər kəs bir müqavilə bağlasa, çox yaxşı olar ki, öz əhd-peymanı üstündə möhkəm dayansın. Camaat arasında səndən başqa öz əhd-peymanına sadiq qalacaq bir şəxs vardırmı? Sənin məqamın və şərafətli mövqeyin tələb edir ki, öz əhd-peymanına sadiq qalıb bu işdə möhkəm olasan. Bunu bil ki, əgər mənim üçün hiylə qurmaq fikrinə düşsən, mən də

hiyləyə əl atacağam; yox əgər haqqımı inkar etsən, mən də sənin məqamını inkar edəcəyəm. Belə olan surətdə İslam ümmətinin başçılarına zərbə vurmaqdan çəkin, qoyma bu millət sənin əlinlə fitnəyə düşsünlər. Sən camaatı tanımış, yoxlamısan buna görə də özünün, dininin, Peyğəmbər ümmətinin barəsində bir az fikirləş, ağılsız, biliksiz !adamlarla yoldaşlıq etməkdən uzaq ol

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN CAVAB MƏKTUBU

:Bu məktub İmam (əleyhis-salam)-a çatan kimi həzrət ona belə cavab yazdı

Sənin məktubunu aldım. Yazırsan ki, mənim barəmdə bəzi xoşagəlməz sözlər eşitmisən. Sənin fikrincə, mən pis iş görmüşəm? Elə bir iş görmüşəm ki, bu iş yaxşı insanlardan baş verməz, bu işlər barəsində yalnız tək olan Allah mühakimə edər. Bu xəbərlər barəsində deməliyəm ki, onları sözgəzdirənlər quraşdırmışlar. Onların səyi həmpeymanlar arasına nifaq salmaqdır. Zəlalətdə olanlar həmişə yalan söyləyərlər. Mənim səninlə müharibə, ya müxalifət niyyətim yoxdur. Sənə bu barədə bəzi şeylər yazıb çatdırmağım yalnız höccəti tamamlamaq məqsədi ilə olmuşdur, vəssalam. Mən ilahi əzabdan qorxuram və vəzifəm haqqı, həqiqəti sənə deməkdir. Təki sənin və zülmkar, dinsiz dostlarının heç bir bəhanəsi qalmasın. Onlar şeytanın hizbindən olub .İblisin dostlarıdırlar

Ey Müaviyə, məgər sən Hücrü nahaq yerə öldürən, onun dostlarını şəhid edən şəxs deyilsənmi? Onlar namaz qılan, zülm ilə mübarizə aparan, bidətləri rəva görməyən, yaxşılıqlara əmr edərək, pisliklərdən çəkindirənlərdən idilər. Amma sən onları zülm ilə öldürdün, halbuki onlara söz vermiş, möhkəm əhd-peyman bağlamış, onların əmin-amanlıqda olacaqlarına əmin etmişdin. Sənin bu işin (onları qətlə yetirməyin) Allaha .qarşı bir üsyan, Onun peymanını ayaq altına salmaqdır

Ey Müaviyə, məgər Xatəmül-ənbiya (səlləllahu əleyhi və alihi və səlləm)-in böyük səhabələrindən biri olan Əmr ibni Nəmiq Xüzaini öldürən sən deyilsənmi? Sən əməli-saleh bir şəxsi öldürmüsən. O, elə bir şəxs idi ki, ibadətin məşəqqəti üzünü saraldıb-soldurmuş, bədənini zəiflətmişdi. Sən onunla peyman bağlayaraq aman vermişdin. Hətta əgər bu amanı çöl ahularına versəydin dağlardən çox arxayınlıq və xatircəmliklə .enib sənə tərəf gələrdilər

Ey Müaviyə, məgər sən Ziyadı İslam hərəmində atan Əbu Süfyandan dünyaya gəldiyini iddia edən adam deyilsənmi? Hansı ki o, Səqəfi adlı bir qulun evində dünyaya gəlmişdi. Sən onu Əbu Süfyanın oğlu, öz qardaşın hesab etdin, halbuki Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm) belə buyurub: Övlad yataq sahibinə aiddir və zinakar daş-qalaq olunmalıdır. Sən bu işi nəfsani ehtiraslar, istəklər, dünyapərəstlik üzündən gördün, sonra onu müsəlmanları qətlə yetirib, əl-ayaqlarını kəsdirərək, gözlərini çıxarmaq və xurma ağaclarından asdırmaq üçün onların canına saldın. Elə !?təsəvvür edirsən ki, bu işlərin sənə heç bir dəxli yoxdur

Ey Müaviyə, məgər sən o adam deyilsən ki, Əli (əleyhis-salam)-ın dostlarını və ardıcıllarını qətlə

yetirmək barədə Ziyada fərman verdin, o da sənin əmrini yerinə yetirdi. Halbuki, Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam) öz əmisi oğlunun (Peyğəmbərin) dininə iman gətirmişdi. O Həzrətin əmrinə əsasən, sənə və atana qarşı vuruşurdu ki, bu gün məhz həmin dinin nuru sayəsində bu məqama çatmısan, yoxsa, sənin və ata-babalarının şərafəti yayın və qışın məşəqqətli günlərində köç etməkdən başqa bir şey .deyildi

Ey Müaviyə, məktubda yazırsan ki: Özünün, dinin və Peyğəmbər ümməti barəsində fikirləş, İslam ümmətinə zərbə vurmaqdan çəkin, onları çətinliyə salma. Amma mən sənin İslam cəmiyyətinə hökmranlıq etməyindən daha böyük və təhlükəli bir fitnə görmürəm. Mənim öz dinim və cəddimin ümməti üçün ən böyük arzum budur ki, səninlə mübarizə edəm; belə bir iş görsəm, Allaha daha yaxın olaram, yox, əgər ondan .boyun qaçırsam, onda gərək Allah dərgahına tövbə edəm

Məktubun başqa bir yerində yazırsan ki, Əgər sən mənim barəmdə hiylə işlətsən, mən də hiyləyə əl atacaq; haqqımı inkar etsən, mən də sənin məqamını inkar edəcəyəm. Mən isə sənə deyirəm: Bütün hiylələrini işə sal, məkrini başla. Ümidvaram ki, sənin məkr və hiyləndən heç bir ziyan görməyəcəyəm. Onun ziyanı hər kəsdən artıq sənin !özünə dəyəcək. Çünki nadanlıq atına minib, o yan-bu yana çapan sənsən

Əhd-peymanı pozan da sən özünsən. Canıma and olsun ki, sən sülhün şərtlərindən heç birinə əməl etməmisən. Sən sülh müqaviləsi bağlanandan, sonra bu qədər insanları öldürməklə öz əhdinə vəfadar olmamağı sübut etmisən. Onlar nə səninlə .mübarizəyə qalxmış, nə də ki, bir kəsi öldürmüşdülər

Təqsirləri yalnız bu idi ki, bizim xatirəmizi canlandıraraq, haqqımızı böyük hesab etmişdilər. Sən onları öldürdün, çünki onlardan qabaq öləcəyindən, yaxud onların ələ .keçmədən ölməklərindən qorxurdun

Amma ey Müaviyə! Bil ki, səndən qisas alınacaq, gördüyün işlərin haqq-hesabına yetişəcəklər. Bil ki, Allah yanında bir yazı vardır ki, (o) heç bir kiçik və ya böyük işdən keçməz, hamısını hesab-kitaba gətirər. Bil ki, Böyük Allah sənin işlərini unutmaz; sən hər hansı güman və töhməti bəhanə edərək adamları nahaq yerə qətlə yetirirsən, Allah dostlarını ucqar şəhərlərə sürgün edib sərxoş və it oynadan bir uşağı (Yezidi) .müsəlmanlara hökmdar seçirsən

Ey Müaviyə! Görürəm ki, özünü həlak, dinini isə xarab etmisən. İslam ümmətini qara günə qoymuş, çiyninə aldığın əmanətə xəyanət etmisən. Sən nadan və ağılsızlardan (nəsihət alır, təqvalı, Allahdan qorxan şəxslərdən isə qaçırsan. Vəssalam(۱)

### YEZİD ZİYADIN NƏZƏRİNDƏ

Müaviyə Ziyad ibni Əbihə bir məktub yazıb, Kufə əhalisindən oğlu Yezid üçün beyət almasını istədi. Ziyad (Əməvi reqiminin müti qulu) Übeyd ibni Kəb Təmriyə bir məktub :yazıb Yezidi belə təriflədi

Yezid xoşgüzəran, əhli-kef və dinsiz bir cavandır ki, ova, əyləncəyə daha çox hərisdir. Cəmiyyəti idarə etmək, müsəlmanlara rəhbərlik çox çətin işdir və Yezid kimi bir adam .xilafət kürsüsünə çıxmamalıdır



---

(Əl-imamətu vəs-siyasət (İbni Qüteybə[۶۱] -۱

Sonra Ziyad, Übeyd ibni Kəbi çağırıb tapşırdı ki, bu xəbəri Müaviyəyə çatdırıb onu Yezidin yaramaz işlərindən, eləcə də dini məsələlərdə olan azğınlığından xəbərdar (etsin(١

## MÜAVİYƏNİN ÖLÜMÜ

Yezid altmışıncı hicri ilinin rəcəb ayında Müaviyənin ölümündən sonra xilafətə keçdi. O, İslamdan qabaqkı dövrə (cahiliyyət dövrünə) mənsub olan üzdəniraq cavanların həyat tərzinin bariz nümunəsi idi. Xalq arasında heç bir ehtirama malik deyildi; onun İslama .qarşı zidd olan rəftarı, aşkar əxlaqsızlıqları o dövrün İslam dünyasında məşhur idi

Yezid İslam hökumətində açıq-aşkar xalq arasında şərab içən, ən iyrənc, murdar cinsi pozğunluqlarla məşğul olan ilk hakim idi. Vaxtını eyş-işrət, tar-kaman və musiqiyə sərf edərək, meymun və it ilə əylənirdi. Onun simasında din və dindarlıqdan heç bir əsər-əlamət yox idi, üstəlik başqalarının məzhəbi etiqadlarına da ehtiram göstərmirdi. Bütün bunlarla yanaşı, Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in canişinlik .iddiasını etməkdən çəkinmirdi

Müaviyə bu vəziyyətlərə baxmayaraq, özünün İslam dünyasına olan böyük hərbi qüdrətindən istifadə edərək oğlunun xəlifə olması üçün yolu hamarlayırdı. Buna görə də Yezid möminlərin əmiri kimi bütün qəbilə və əyalətlər tərəfindən alqışlanırdı. Eyni halda, onun xilafəti İslamın tanınmış şəxsiyyətlərindən olan dörd nəfərin, xüsusilə də



---

Tarixi-təbəri, ۶-cı cild, səh.١۶۵[۶٢] -١

İmam Hüseyn (əleyhis-salam) kimi əzəmətli bir şəxsin beyəti olmadan həyata keçə bilməzdi. Bütün müsəlmanların nəzər-diqqətləri, o Həzrətin göstərəcəyi əks-təsirə yönəlmişdi. Müaviyə göstərdiyi bütün ciddi-cəhdlərə baxmayaraq, bu dörd nəfərdən .Yezid üçün beyət ala bilmədi

Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in yeganə nəvəsi olan İmam Hüseyn (əleyhis-salam) xalq arasında dərin hörmətə malik idi. Şübhəsiz, ondan beyət almadan Yezidin hakimiyyəti möhkəmlənə bilməzdi. Yezid ibni Müaviyə cinayətkar, meypərəst bir adam idi, dinsizliyə və küfrə adət etmişdi; dini məsxərəyə qoyur, kənizlər, qulamlar .və çalğıçılarla başını qatır, həmişə meymunlarla, itlərlə oynayırdı

İmam Hüseyn (əleyhis-salam) belə bir adamın müsəlmanlara hakim olmasını heç cür qəbul edə bilməmişdi. O, Mərvan ibni Həkəmə belə buyurdu: Əgər Yezid kimi bir adam müsəlmanların rəhbəri olarsa və İslam ümməti belə bir murdar adamın əlinə düşərsə, onda İslamın gələcəyi naməlum olacaqdır. Eləcə də öz qardaşı Məhəmməd ibni Hənəfiyyəyə buyurdu: Qadir və Mütəal Allaha and olsun, dünyada heç bir sığınacaq .tapmasam belə, yenə Yezid kimi bir adama beyət etmərəm

## YEZİDİN MƏDİNƏ HAKİMİNƏ GÖSTƏRİŞİ

Yezid o vaxt Mədinə hakimi olan əmioğlusu Vəlid ibni Ütbəyə bir məktub yazdı. Məktubun məzmunu belə idi: Mənim hökumətim üçün hamıdan, xüsusilə

də Hüseyn ibni Əlidən beyət almalısan. Əgər beyət etməzsə, başını kəsib mənə .göndərməlisən

Vəlid bu məktubu alandan sonra Mərvan ibni Həkəmlə məşvərət edib onun bu barədəki nəzərini soruşdu. Mərvan cavab verib dedi ki, o Həzrət heç vaxt Yezidə beyət .etməyəcək. Əgər mən sənin yerinə olsam, onun boynunu vuraram

.Vəlid dedi: Kaş bu dünyada olmayaydım və bu səhnə ilə üzləşməzdim

Sonra İmam Hüseyn (əleyhis-salam)-ın yanına bir nəfər göndərib o, Həzrəti gecə ikən hökumət qərargahına çağırdı. İmam Hüseyn (əleyhis-salam) dərhal bu dəvətin səbəbini başa düşüb yaxın adamlarından ۳۰ nəfərlə birgə oraya getdi. Onlar İmam (əleyhis-salam)-ın göstərişi ilə silahlanmışdılar. Çünki gecənin bu vaxtı o Həzrətə sui-qəsd edilməsi gözlənilirdi. Qərara alındı ki, İmamla (əleyhis-salam) gələnlər Vəlidin sarayı ətrafında hazır vəziyyətdə otursunlar, hər vaxt İmam (əleyhis-salam)-ın uca .səsini eşitsələr, dərhal hücum edib o Həzrətə zərər dəyməsinin qarşısını alsınlar

İmam (əleyhis-salam) saraya daxil oldu. Qısa söhbətdən sonra Mərvan Vəlidə təklif etdi ki, o Həzrəti zindana salaraq ondan beyət alsın. İmam (əleyhis-salam) üzünü Mərvana tutub buyurdu:–Heç vaxt Yezidə beyət etməyəcəyəm. Vay olsun sənə, ey Zərqanın oğlu! Sən mənim qətlimə fərman vermək istəyirsən? Allaha and olsun, yalan !demisən və yanılmısan

Sonra üzünü Vəlidə tutub buyurdu:–Ey Vəlid! Biz nübüvvət əhli-beyti, risalət mədəniyik. Bizim evimiz mələklərin gedib-gələn yeridir. Allah varlıqlar içərisində bizi seçərək risalət işinin xətmini bizim öhdəmizə qoymuşdur. Amma Yezid nalayiq işlər

görən, şərab içən bir adamdır. Möhtərəm insanların hörmətini sındırmış və öz alçaqlığını aşkar etmişdir. Buna görə də mənim kimi bir insan heç vaxt Yezidə beyət .etməyəcək

İmam (əleyhis-salam) bu sözləri deyib dərhal Vəlidin sarayından çıxdı və öz adamları .ilə birlikdə evə qayıtdı

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN MƏRVANLA QARŞILAŞMASI

İmam Hüseyn (əleyhis-salam) sübh çağı mənzildən çıxdı. Yolda Mərvanla rastlaşdı. Mərvan ona dedi:–Ey Əba Əbdillah, mən sənə bir nəsihət edirəm: əgər onu qəbul .etsən, üzünə həqiqət yolunun qapısı açılacaq

.İmam Hüseyn (əleyhis-salam) buyurdu:–De, qulaq asıram

Mərvan dedi:–Mən sənə tövsiyə edirəm ki, din və dünyanı hifz etmək üçün Yezid ibni .Müaviyəyə beyət edəsən

:İmam (əleyhis-salam) buyurdu

Əgər Yezid kimi bir adam bu ümmətin rəhbərliyini əlinə alarsa, onda İslamın fatihəsini .oxumaq, matəm saxlamaq lazımdır

## İMAM (ƏLEYHİS–SALAM) MƏKKƏYƏ TƏRƏF HƏRƏKƏT EDİR

İmam (əleyhis-salam) ۶۰-cı hicri ili rəcəbin ۲۸-də sübh (başqa rəvayatə görə gecə) Mədinədən Məkkəyə

doğru hərəkət etdi. Mədinədən çıxan zaman Musa (əleyhis-salam)-a, Fironun :qorxusundan Mədyən şəhərinə getməsi barədə nazil olan ayəni oxudu

Qorxunc bir halda düşmənin gəlməsindən ehtiyat edərək şəhərdən xaric olub dedi: !Pərvərdigara, məni zülmkar xalqdan xilas et

İmam Hüseyn (əleyhis-salam) Məkkəyə doğru adi yollarla irəliləyirdi. O Həzrətin əhli-beyti dedi:–İbni Zübeyr kimi gizlin yollarla hərəkət edin ki, bir kəs sizi tutmaq istəsə, .tapa bilməsin

İmam (əleyhis-salam) buyurdu:–Mən düz yoldan çıxmaram, qoy Haqq-təala mənimlə .(onlar arasında Öz istədiyi kimi hökm etsin(١

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM) MƏKKƏYƏ DAXİL OLUR

İmam Hüseyn (əleyhis-salam) cümə günü şəban ayının üçündə Məkkəyə daxil olub bu :ayəni oxudu

Həzrət Musa) Mədyənə doğru baxaraq dedi: Ümidvaram ki, Rəbbim məni düz yola) .hidayət edər və öz məqsədimə çatdırar

Məkkə əhalisi, həmçinin başqa yerlərdən ömrə həccinə gələnlər imamın gəlişindən xəbər tutduqda o Həzrətin yanına get-gəl edərək səhər-axşam onun yanında qalırdılar. Həmin vaxtlarda Əbdüllah ibni Zübeyr də Məkkədə idi. O, Kəbənin yaxınlığında tutduğu evdə qalır, camaatı aldatmaq üçün çoxlu namaz qılaraq tez-tez İmam (əleyhis-salam)-ın yanına gəlirdi. Zahirdə çox sevinir, batində isə İmam (əleyhis-salam)-ın Məkkəyə gəlişindən narazı idi. O



---

(İrşad (Şeyx Müfid[۶۳] -١

çox gözəl bilirdi ki, İmam (əleyhis-salam) Məkkədə olduğu halda Hicaz əhlindən heç (kəs ona (Yezidə-müt.) beyət etməyəcək.(١)

## BƏSRƏ ƏHALİSİNİN VƏZİYYƏTİ

Bəsrəlilərin dini vəziyyəti kufəlilərdən heç də yaxşı deyildi. İmam Hüseyn (əleyhis-salam)-ın bəsrəlilərə yazdığı məktublardan biri də Münzər ibni Caruda idi. Məktub onun əlinə çatanda bədəni lərzəyə düşdü. O, məktubu Übeydullah ibni Ziyada verdi. Çünki o, elə fikirləşirdi ki, bu işi (məktub yazmağı) Übeydullah özü qurmuşdur. Übeydullah Münzəri yaxalayıb edam etdi, sonra minbərə çıxıb Bəsrə əhalisini hədələyərək, ona vəfadar qalanlara çoxlu vədlər verdi, qəbilə başçılarının kisələrini pulla doldurdu və onlara çoxlu hədiyyələr payladı. İbni Ziyad elə bir iş gördü ki, hamı .qorxuya düşdü və daha heç kəs ona qarşı çıxmağa cürət etmədi

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN BƏSRƏ ŞİƏLƏRİNƏ MƏKTUBU

Allah Həzrət Mühəmməd (səlləllahu əleyhi və alihi və səlləm)-i camaat arasından seçmiş, ona peyğəmbərlik məqamı verməklə şərəfləndirmiş və ilahi hökmləri yaymaq üçün göndərmişdi. O Həzrət camaata öyüd-nəsihət verib öz peyğamını onlara



---

(İrşad (Şeyx Müfid[۶۴] -١

çatdırdıqdan sonra Allah onu özünə tərəf apardı. Biz onun sülaləsi və Əhli-Beytiyik. Yaxşı adamlar içərisindən məhz bizlərə rəhbərlik təqdim olunmuşdur. Biz onun əmanətdarları, sizin aranızda olan xəlifə və canişiniyik. Biz onun yerini tutmaq üçün camaat arasında ən layiqli şəxslərik. Amma... camaat bu kimi imtiyazlarda özünü bizdən üstün bildi. Biz sükut etdik, çünki ixtilafı və ikitirəliliyi sevmirik. Biz cəmiyyətin əmin-amanlıq və rifahının hifz olunmamasından nigaran idik. Əlbəttə, biz rəhbərliyi bizdən alanlardan daha ləyaqətli olduğumuzu bilirdik»

Mən öz nümayəndəmi sizin yanınıza göndərməklə sizi Allahın kitabı və Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in sünnətinə əməl etməyə dəvət edirəm. Bu sünnət artıq xatirələrdən silinmiş, bidətlər(۱) güclənmişdir. Əgər mənə qulaq asıb göstərişlərimə itaət etsəniz, onda sizi düz yola hidayət edərəm. Vəssalamu əleykum və rəhmətullahi və bərəkatuh.

## KUFƏLİLƏRİN TOPLANTISI

Müaviyənin ölümündən sonra, İmam (əleyhis-salam)-ın Yezidə beyət etməkdən imtina edərək Məkkəyə doğru hərəkət etməsindən xəbər tutan kufəli şiələr Süleyman ibni Sürəd Xüzainin evində bir yerə yığışdılar. Süleyman Kufənin tanınmış şəxsiyyətlərindən biri sayılırdı. Onun, camaat arasında böyük hörməti var idi. Hamı onun sözünü qəbul edirdi. Bu iclasda Müaviyənin ölüm xəbəri,



---

۱- [۶۵] Bidət–dində onmayan şeyləri dinə daxil etmək.

onun zülmkar hökumətində şiələrin keçirdiyi əzab-əziyyətlərdən söz açıldı və onun yerində əyləşən Yezidin ondan qat-qat alçaq olması bəyan edildi.

Bu yığıncaqda əvvəlcə Süleyman ibni Sürəd ayağa qalxdı, Allahın dərgahına həmd-səna etdikdən sonra dedi:–Bildiyiniz kimi, Müaviyə ölmüş, Yezid onun yerində xilafət kürsüsünə oturmuşdur. Hüseyn ibni Əli onunla müxalifət etmiş və Məkkəyə gəlmişdir. Siz onun və atasının şiələrindənsiniz. İndi baxın, əgər ona kömək etmək, onun düşməni ilə mübarizə aparmaq üçün özünüzdə qüvvə və hazırlıq görürsünüzsə, o Həzrətə məktub yazıb Kufəyə dəvət edin. Amma, əgər zəiflik və süstlüyünüzdən ehtiyat edirsinizsə, o Həzrəti aldadıb düşmənə giriftar etməyin.

Hamı bir səslə dedi:–Biz onun düşməni ilə vuruşub canımızı onun yolunda fəda edəcəyik.

## KUFƏLİLƏRİN İMAM (ƏLEYHİS–SALAM)–A YAZDIQLARI MƏKTUB

Bu yığıncaqdan sonra kufəlilər İmam (əleyhis-salam)-a aşağıdakı məzmunda bir məktub yazdılar:

Bismillahir-Rəhmanir-Rəhim.

Bu məktub Hüseyn ibni Əliyə Kufə əhalisindən olan Süleyman ibni Sürəddən, Müseyyib ibni Nəcbətdən, Rəfaət ibni Şəddad Bəclidən, Həbib ibni Məzahirdən və onun digər şiələrindəndir.

Salam olsun sizə. Sonsuz həmd-səna olsun tək Allaha. Allaha şükür olsun ki, düşməninizin (Müaviyənin) arxasını yerə vurdu. O, qəddar və kinli bir adam idi, İslam ümmətinə hakim olaraq, hökumət

işlərini onların əlindən oğurlamışdı. Beytül-malı zorla alırdı, cammatın razılığı olmadan onlara hökmranlıq edib yaxşı insanları qətlə yetirmiş, alçaq və yaramazları onların .yerinə təyin etmişdi

Allah malını özünün, ailəsinin və zülmkar dostlarının eyş-işrətinə sərf edirdi. Allah Səmud qövmünü Öz rəhmətindən uzaq etdiyi kimi, onu da Öz rəhmətindən uzaq .etmişdi

Ey Rəsulullahın oğlu! Bil ki, səndən başqa bizim imamımız yoxdur. Bizim şəhərimizə gəl, inşallah, Tanrı sənin qüdrətli əllərinlə bizi haqq mehvərində cəm edər. Hal-hazırda Nöman, yəni Bəşir hökumət qəsrində oturmuşdur, amma bizim heç birimiz onunla həmfikir deyilik; cümə və bayram namazlarına getmirik. Hər vaxt sənin Kufəyə tərəf gəlməyindən xəbər tutsaq, dərhal onu Kufədən qovacağıq ki, Şama gedib, öz !mövlasına (Yezidə) qoşulsun. İnşallah

Bu məktubu Əbdüllah ibni Mismə Həmdani və Əbdüllah ibni Valaya tapşıraraq tez bir zamanda İmama çatdırmağı xahiş etdilər. O iki nəfər də təcili olaraq özlərini Məkkəyə çatdırıb mübarək Ramazan ayının ۱۰-da İmam Hüseyn (əleyhis-salam)-ın hüzuruna .çatdılar

Kufəlilər məktub yazmalarından iki gün keçməmiş, daha ۱۵۰ məktub yazaraq Qeys ibni Müshir Seydavi, Əbdürrəhman ibni Əbdullah ibni Şəddad Üzdi, Əmmar ibni Əbdüllah Səlulinin vasitəsi ilə Məkkəyə göndərdilər. Hər bir məktubda kufəlilərdən bir neçəsinin imzası var idi. İki gündən sonra kufəlilərin daha mühüm bir məktubu Hani ibni Hani Əssəbli Səid ibni Əbdullah Hənəfinin vasitəsi ilə Məkkəyə göndərildi ki, məktubun :məzmunu belə idi

.Bismillahir Rəhmanir Rəhim

.Bu bir ərizədir Hüseyn ibni Əliyə, onun şiə və fədailəri tərəfindən

Ey əziz İmam! Təcili olaraq özünü Kufəyə çatdır. Camaat sizin gəlişinizi közləyir, sizdən .başqa heç kimi rəhbərliyə qəbul etmirlər. Elə isə tələsin, tələsin, tələsin! Vəssalam

Başqa bir məktub da Şibs ibni Ribi, Həccar ibni Əbcər İcli, Yəzid ibni Haris ibni Rüveym, Əzrət ibni Qeys Əhməsi, Əmr ibni Həccar Zübeydi, Məhəmməd ibni Ümeyr ibni Əttar :Təmrinin imzası ilə göndərilmişdi ki, məzmunu belə idi

Səhralar yaşıllaşmış, meyvələr yetişmişdir. Bizə tərəf gəlin. Bizim ordumuz... hazırlanmış, təchiz olunmuş halda sizin fərmanınızı gözləyir. Allahın salam və rəhməti (sizə olsun!(۱)

Kufəlilərin nümayəndələri bir-birinin ardınca əllərində məktub İmam (əleyhis-salam)-ın yanına gəlirdilər. Hətta təkcə bir gündə altı yüz məktub gəlib çatırdı. Nəhayət, (məktubların sayı ۱۲ minə çatdı.(۲)

Amma İmam Hüseyn (əleyhis-salam) bu məktubların heç birinə etina etmirdi. Hətta bir gün Kufə əhalisindən İmam (əleyhis-salam)-a bir xəbər gəlib çatdı. Bütün Kufə əhli yazmışdılar ki, Ey Hüseyn, ey Peyğəmbər qızının oğlu, sən bilirsən ki, Yezid bizə zülm edir, kişilərimizi öldürür, mal-dövlətimizi qarət edir. Onun tüğyançılığı həddini aşmışdır. Biz də öz məktublarımızda səndən istəmişik ki, yanımıza gələsən, sənə kömək edib, Yezidlə vuruşaq, xilafəti sənə həvalə edək. Siz isə heç bircə dəfə də olsun etina .etmirsiniz



---

(İrşad (Şeyx Müfid[۶۶] -۱

.Lühuf (Seyyid İbni Tavus), səh.۱۹[۶۷] -۲

Ey Hüseyn, səni and veririk, cəddin Mühəmməd Müstafanın haqqına ki, bizim yanımıza gələsən, biz də Sizin köməyiniz ilə Yezidə qarşı vuruşaq, onu xilafətdən salaq. Əgər razı olmasan, bizim istəkləri qəbul etməsən, qiyamət günü Allah qarşısında deyəcəyik :ki

İlahi, Hüseyn (əleyhis-salam) bizə zülm etdi, bizə zülm olunmasına razı oldu, bizə olunan zülmün qarşısını almadı. İlahi, bizim haqqımızı Hüseyndən al. Bu halda sən Allah qarşısında nə cavab verəcəksən? Allah bəndələrinə qarşı etdiklərinin cavabını necə ?verəcəksən

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN CAVABI VƏ MÜSLÜMÜN GÖNDƏRİLMƏSİ

Bu məktub çatandan sonra İmam (əleyhis-salam) kufəlilərin məktublarına belə bir :surətdə cavab yazdı

.Bismillahir-Rəhmanir-Rəhim

Bu məktub Hüseyn ibni Əlidən müsəlman və imanlı xalq kütlələrinədir. Sizin axırıncı nümayəndələriniz–Hani və Səid məktubunuzu mənə çatdırdı. Məktublarınızın məzmunundan, yazdıqlarınızdan belə nəticəyə gəldim ki, rəhbəriniz yoxur. Məndən istəyirsiniz ki, sizə tərəf gəlim və Allahın lütfü ilə, hamılıqla haqqın mehvərinə .toplaşasınız

İndi isə mən etimad bəslədiyim bir şəxsiyyəti-qardaşım və əmioğlum Müslüm ibni Əqili sizin yanınıza göndərirəm. Əgər o öz xəbərlərində mənə yazsa ki, ağıl sahibləri, ,gözüaçıq şəxsiyyətlər və ümumxalq kütləsi məktubda yazdığınız

nümayəndələrin dedikləri barədə həmin fikirdədilər, tezliklə sizə qoşulacağam. İnşallah. Öz canıma and olsun, yalnız camaat arasında Allahın Kitabı əsasında hökm edib adil olan, dəyanətin düzgün yolundan inhirafa yuvarlanmayan və bu işləri Allahın (razılığı üçün yerinə yetirən şəxsdən başqa heç kəs İmam ola bilməz. Vəssalam(١

Nəhayət İmam (əleyhis-salam) bu dəvətlərə müsbət cavab vermək qərarına gəldi. İki .amil Həzrətin bu qərara gəlməsinə səbəb olmuşdu

İslamın təməlini qoyan şəxsin (Peyğəmbərin) nəvəsi və zəmanənin İmamı olmaq-١ .ondan tələb edirdi ki, müsəlmanların ardıcıl istəklərinə cavab versin

Yezidin beyət almaq üçün ardıcıl tələbləri o qədər idi ki, Peyğəmbər övladı və Allahın-٢ yer üzündəki canişini, ilahi bir şəxsiyyət olan İmam Hüseyn (əleyhis-salam) heç cür bu cahil və murdar şəxsi (Yezidi) Peyğəmbər (səllallahu əleyhi və alihi və səlləm)-in .canişinlik vəzifəsinə qəbul edə bilməzdi

## VƏZİYYƏT DAHA DA AĞIRLAŞIR

Vəziyyət olduqca ağır idi. Müaviyənin rəftarı Yezidin rəftarından tamamilə fərqlənirdi. Müaviyənin sırf dünyapərəst bir mövqe seçməsi, dini məsələlərə qarşı etinasız yanaşmasına baxmayaraq, zahirdə İslami meyarlara riayət edirdi. Amma Yezid Quran və Peyğəmbər qanunlarını pozmaqla kifayətlənmir, aşkar şəkildə dinin əsaslarını məsxərə edirdi. Bu



---

.Rovzətül-vaizin, səh.١۴٩[۶٨] -١

məsələ barəsində müsəlman tarixçiləri arasında fikir ayrılığı yoxdur. Hətta Müaviyənin yaxın adamları belə onu yaxşı tanıyırdılar. Məhz buna görə də Müaviyə Bəsrə və Kufə əhalisinə Yezidin canişinliyini qəbul etdirmək üçün hazırlaşın deyəndə, Ziyad ona nəsihət verərək, camaatdan oğlun Yezidlə həmkarlıq etmələri barədə iltizam .almazdan qabaq onu islah et söyləmişdi

## HƏZRƏT MÜSLÜMÜN YOLA DÜŞMƏSİ

Müslüm İmam Hüseyn (əleyhis-salam) tərəfindən ilahi bir tapşırıq aldığını bilən kimi dərhal mübarək Ramazan ayının ۱۵-də Məkkədən Mədinəyə yollandı, şəhərə daxil olub bir-başa Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) məscidinə getdi və orada namaz qılıb həzrətin qəbrini ziyarət etdi. Sonra öz ailəsinin yanına gedib onlarla .vidalaşaraq, İraqa doğru yola düşdü

***

Həzrət Müslüm Kufəyə daxil olarkən əvvəlcə Muxtar ibni Əbi Übeyd Səqəfinin evinə getdi. Onun bu evə gəlməsindən xəbərdar olan Kufə əhli onun görüşünə tələsdilər. Şəhərin böyük şəxsiyyətləri onun ətrafına yığışdılar. Şücaətli igidlər dəstə-dəstə, yaxud tək-tək onun hüzuruna gəlir, öz imamın nümayəndəsinin gəlişini təbrik edirdilər. Həzrət Müslüm hər şeydən əvvəl İmam (əleyhis-salam)-ın məktubunu onlara oxuyub dedi ki, sözlərinin üstündə möhkəm dayansalar və düşmənlə mübarizə etsələr, İmam onların çağırışına müsbət cavab verəcəkdir. Abbas ibni Şəbib Şakiri Müslümə dedi:– Mən camaat

barəsində səninlə söhbət etmirəm. Onların ürəklərində olanlardan da xəbərim yoxdur. Amma bilmirəm onların nəyinə aldanmısan! Amma öz qəlbimdə olanları sənə deyə bilərəm. Allaha and olsun, hər vaxt məni köməyə çağırsan, ləbbeyk deyəcək, sizinlə birgə düşmənə qarşı vuruşacağam. Bu yolda qılıncı qınından çəkib haqqın görüşünə tələsəcəyəm. Bu fədakarlıqda ilahi savabdan başqa heç nə istəmirəm və heç bir .qərəzim də yoxdur

Bəli, İmam Hüseyn (əleyhis-salam) kimi alicənab bir şəxs camaatın batini fikirlərindən agah olmaya bilməzdi. Həzrət bilirdi ki, onlar imtahandan alnıaçıq çıxa bilməyəcəklər. Əgər döyüş şiddətlənsə, haqqa kömək etməkdən əl çəkəcək, azacıq çətinliyə düşsələr, onu xar edəcəklər. Belə olan surətdə fəzilət və kəramət ailəsi (Əhli-beyt) köməksiz qalacaq, Bəni-Haşim, İmam (əleyhis-salam)-ın seçilmiş köməkçiləri din .düşmənlərinin caynağında bəlaya giriftar olacaqdı

Axı necə mümkün ola bilər ki, İmam Hüseyn (əleyhis-salam) imamətin sonsuz elmindən, habelə keçmiş təcrübələrdən bəhrələndiyi halda, kufəlilərin vəfasızlığı və ona qarşı edəcəkləri hiylələrindən qəflətdə qalsın? Məgər elə bu kufəlilər Peyğəmbərin canişini (Həzrət Əli (ə)) ilə necə rəftar etdiklərini unutmaq olarmı? Məgər onun qardaşı Həzrət Müctəba (əleyhis-salam)-ı yalqız qoymaları yaddanmı çıxarmı?! Məgər Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm)-in və Əmirəl-möminin (ə)-ın gələcəkdə baş verəcək acı hadisələr, Əhli-Beyt (əleyhis-salam)-ın başına gətiriləcək müsibətlər və dini şəxsiyyətlərin şəhadətə çatması barədə buyurduqları bəyanatlar İmam !?Hüseyn (əleyhis-salam)-ın xatirəsindən yayınamı bilərdi

İmam (əleyhis-salam) qarşıdakı hadisələri gözəl bilir, kufəlilərin ona qarşı edəcəkləri rəftardan tamamilə agah idi. Lakin İmam (əleyhis-salam) Allahın xalq üzərində olan höccətidir və bu hiyləgər camaat üçün bütün bəhanə və üzr yollarını bağlamalıdır. Elə buna görə də məktubların sayı və nümayəndələrin gəlişi artdıqdan sonra İmam (əleyhis-salam) üçün höccət tamam oldu. Həzrət onların canfəşanlıqlarına ona görə cavab verdi ki, qiyamət günü Peyğəmbərə (səlləllahu əleyhi və alihi və səlləm) biz İmamı istəyirdik, lakin övladın bu istəyimizə cavab vermədi, deməsinlər. Daha camaatda İmama (əleyhis-salam) qarşı heç bir dəlil yox idi. Onlar rəhbər barəsində agahlıqlarının olmamasını iddia edə bilməzdilər, çünki İmam (əleyhis-salam), Allahın camaata yol göstərib rəhbərlik etmək, onları cəhalət yuxusundan ayıldıb qiyama .hazırlamaq üçün seçdiyi bir şəxsdir

Həbib ibni Məzahir onun sözlərinə əlavə edib dedi:–Allah sənə rəhmət eləsin, öz xalis niyyətini aşkar surətdə bəyan etdin. Tək olan Allaha and olsun ki, mən tamamilə sənin .əqidəndəyəm

.(Səid Hənəi də bu iki böyük şəxsiyyətin sözünü təsdiq etdi.(١

Beləliklə, bu pak qəlbli insanlar Həzrət Mühəmməd (səlləllahu əleyhi və alihi və səlləm)-in risalətinin əvəzini əda edərək son nəfəsə kimi öz əhd-peymanlarına sadiq .qalacaqlarını büruzə verdilər

Amma Abisin düşüncələri kufəlilərin batini fikirlərini aşkara çıxarır, bu tayfanın məqsəd və xislətlərini bizə açıb göstərir, başa salır ki, bu şiələr



---

.Tarixi-Təbəri, ۶-cı cild, səh.١٩٩[۶٩] -١

öz fədakarlıq niyyətlərində tərəddüd keçirirlər. Bu sözün doğruluğunu isbat etmək üçün Əli ibni Həccacın söylədiyi rəvayətə nəzər salmaq daha maraqlı olardı. O deyir:– Məhəmməd ibni Bəşir Həmdanidən soruşdum ki, sən də Müslümün qarşısında bir söz dedin? Cavab verib dedi ki, mən istəyirdim ki, dostlarım izzət və şərəfə nail olub, qələbə çalsınlar. Lakin özümü ölümə vermək istəmirdim və yalan danışmağı da .(xoşlamırdım(١

Onun axırıncı cümləsindən məlum olur ki, kufəlilər yalan deyirmişlər. Müslümə qarşı şövq-məhəbbət göstərməkləri, əllərini beyət məqsədi ilə ona tərəf uzatmaları .hiylədən başqa bir şey deyilmiş

Aydındır ki, Həzrət Müslümün vəzifəsi zahiri qəbul etmək idi və onlardan beyət almaya bilməzdi. Necə ki, Rəsuli-Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm) Əqəbətüssaniyədə Ovs və Xəzrəc qəbilələrindən beyət aldı, fəth günü müsəlmanlarla beyəti təzələdi və qədr günündə də hamını Əmirəl-mömininə beyət etməyə çağırdı; həmçinin Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam) da hökuməti qəbul edən vaxt və Həzrət Müctəba (əleyhis-salam) atasının şəhadətindən sonra kufəlilərdən beyət almışdı. Bütün bu beyətlərdə bir məsələ vardır və o da Allahın Kitabına və rəsulullahın sünnətinə çağırış, Əhli-beyt dostlarına kömək etmək, düşmənləri ilə mübarizə aparmaq, sözdə və əməldə, bu ilahi şəxsiyyətlərlə müxalifət .etməməkdir



---

.Tarixi-Təbəri, ۶-cı cild, səh.١٩٩[٧٠] -١

## KUFƏLİLƏR HƏZRƏT MÜSLÜMLƏ BEYƏT EDİR

Həzrət Müslüm kufəlilərlə əhd-peyman bağlamaq məqsədini izhar edəndən sonra camaat beyət etmək üçün onun yanına sel kimi axışıb gəlirdilər, beyət əlaməti olaraq .onun əlini sıxdılar

Nəql edilənə görə, Həzrət Müslümlə beyət edənlərin sayı ١٧ min, başqa bir xəbərə (görə ٢٥ min(١) və ayrı bir məlumata görə isə ۴٠ min nəfərə çatırdı(٢

## HƏZRƏT MÜSLÜMÜN İMAM HÜSEYN (ƏLEYHİS-SALAM)-A YAZDIĞI MƏKTUB

Beyət yüksək göstərici ilə sona çatdıqdan sonra, Həzrət Müslüm dərhal İmam (əleyhis-salam)-a bir məktub yazıb Abis ibni Şəbib Şakiri və Qeys ibni Müshir Seydavi ilə göndərdi. Məktubda camaatın yekdil olmasını, haqq rəhbərin Kufəyə gəlişi üçün :hazırlıqlı olmalarını xəbər verərək yazırdı

Bir tayfanın nümayəndəsi heç vaxt öz yoldaşlarına yalan deməz. İndiyə kimi Kufə əhalisindən ١٨ min nəfəri mənə beyət edib əlimi sıxmışdır. Mənim məktubumu alan .kimi təcili olaraq Kufəyə tərəf hərəkət edin

Həzrət Müslümün bu məktubu öz şəhadətindən ٢٧ gün əvvəl yazmışdı. Bu məktubla eyni zamanda sair məktublar da (kufəlilərdən) gəlmişdi ki, onların



---

.Mənaqib (İbni Şəhraşub), ٢-ci cild, səh.٢١٠[٧١] -١

.Məşrül-əhzan, (İbni Nəma) səh.١١[٧٢] -٢

məzmunu belə idi: Ey Rəsulullahın oğlu, tez bizə tərəf gəlin, hal-hazırda Kufədə yüz !min qılınc sizə yardım etmək üçün hazırdır. Yubanmayın

## KUFƏ VALİSİ NÖMANIN ÇIXIŞI

Nöman ibni Bəşir Yezid tərəfindən Kufəyə vali təyin edilmişdi. O, camaatın Müslümün ətrafına toplaşıb ona beyət etməsindən xəbər tutduqdan sonra minbərə çıxaraq, camaatın Yezidə qarşı müxalifət etməmələrini məsləhət gördü. Bəni-Üməyyənin həmpeymanlarından bəziləri Nömanın sözlərini bəyənməyərək bu sözləri zəiflik əlaməti kimi qiymətləndirdilər. O, cümlədən Əbdullah ibni Müslüm ibni Səid Nömana dedi:–Sənin bu işin heç də xoşagələn deyildir. Öz düşməninlə zəif danışdın, bunun .çarəsi yalnız kobudluqdur

.Nöman dedi:–Məzlum kütlələrlə olmaq mənim üçün daha yaxşıdır

## YEZİDİN TƏRƏFDARLARININ KUFƏDƏ HAZIRLADIĞI HİYLƏ

Həzrət Müslümün Kufədə sakin olması və camaatın ona beyət etməsi Bəni-Üməyyə havadarlarına çox pis təsir etdi. Buna görə də Əbdullah ibni Müslüm Həzrəmi, Əmarət ibni Əqəbət ibni Əbi Müit, Ömər ibni Səd Yezidə belə bir məktub yazdılar: Müslüm Kufəyə gəlmiş, Hüseyn ibni Əlinin şiələri onunla beyət etmişlər. Əgər Kufənin hökmranlığını əlində saxlamaq istəyirsənsə, hökuməti

idarə etmək üçün elə nüfuzlu və iqtidarlı bir şəxs seç ki, düşmənlərinlə sənin özün kimi .rəftar etsin. Nöman ibni Bəşir ya bacarıqsız, ya da özünü acizliyə vuran bir adamdır

## İBNİ ZİYAD KUFƏYƏ GÖNDƏRİLİR

Yezid bu məktubları alan kimi atasının xidmətçilərindən biri olan Sərcun Rumi ilə Kufəyə kimi vali seçmək barədə məşvərət etdi. Sərcun Übeydullah ibni Ziyadı bu işə münasib gördü. Yezid də dərhal ibni Ziyada belə bir məktub yazdı: Kufədən mənə xəbər çatıb ki, Müslüm ibni Əqil camaatı ətrafına toplayıb, müsəlmanların vəhdətini pozmaq istəyir. Məktubum sənə çatan kimi dərhal, fürsəti itirmədən Kufəyə yola düş, nə yolla olursa olsun Müslümü tutub ya zindana sal, ya qətlə yetir, ya da Kufədən qov. .Vəssalam

Müslüm ibni Əmr Yezidin məktubunu Bəsrəyə, Übeydullahın yanına gətirdi. O, məktubun məzmunundan agah olduqdan sonra dayanmadan səfər tədarükü görərək sabahısı gün Kufəyə yola düşdü. İbni Ziyad səfərə çıxmazdan əvvəl Bəsrə əhalisinə xitabən dedi:–Möminlərin əmiri Yezid məni Kufəyə vali təyin etmişdir. Sabah ora yola düşürəm. Allaha and olsun, çətinliklər mənim qarşımda taqət gətirə bilməyəcək və ictimai hərəkatlar məndə iztirab yaratmayacaqdır. Öz düşmənlərimə qarşı qəddarcasına rəftar edəcəyəm. Mənimlə müharibəyə qalxan hər bir kəs üçün öldürücü zəhərə çevriləcəyəm. Ey Bəsrə əhli, mən Osman ibni Ziyad ibni Əbu Sufyanı öz yerimdə canişin qoyuram və sizi

fitnə-fəsad törətməkdən çəkindirirəm. Tək olan Allaha and içirəm, əgər mənə xəbər çatsa ki, sizlərdən biriniz müxalifət edir, onu və bütün dost-tanışlarını qətlə yetirəcəyəm. Həmin şəxsi tapmasam, qohum-əqrəbasını həbs edəcəyəm ki, mənim fərmanlarıma təslim olasınız və heç biriniz nə qiyam, nə də müxalifətə cürət etməyəsiniz. Mən Ziyadın oğluyam və bütün cəhətlərdə onun kimiyəm. Heç kimlə də .qohumluğum yoxdur

Übeydullah bu xütbədən sonra Müslüm ibni Əmr ibni Bahili, Şərik ibni Əvər Harisi, .(həmçinin xidmətçiləri və ailəsi ilə birlikdə Kufəyə doğru yola düşdü(١

Münzər ibni Carud Əbdi və Əbdüllah ibni Haris Nofəli də beş yüz nəfərdən təşkil olunmuş bir karvanla (İbni Ziyad onları Bəsrə camaatının arasından seçmişdi) yola düşdü. O, bütün yol boyu tam sürətlə irəliləyir, yoldaşlarından heç birinə görə ləngimirdi. Çünki, İmam Hüseyn (əleyhis-salam)-ın ondan qabaq Kufəyə çatmasından və vəziyyətin onun üçün daha da gərginləşməsindən qorxurdu. Hətta Şərik ibni Əvər, Əbdullah ibni Haris və onun başqa yoldaşları yorulub yolda qalmış və elə düşünürdülər ki, Übeydullah onlara görə dayanacaqdır. Amma o, heç kəsə diqqət yetirmədən öz .yolunu davam etdirirdi

Übeydullah Kufə yaxınlığında atdan enib Yəmən parçasından paltar geydi və başına qara əmmamə qoydu. Xalq onu Hüseyn ibni Əliyə oxşatsınlar;-deyə



---

.Tarixi-Təbəri, ۶-cı cild, səh.٢٠٠[٧٣] -١

.(üzünə niqab saldı və Nəcəf istiqamətindən tək-tənha şəhərə daxil oldu(١

Şəhər keşikçiləri ibni Ziyadı bu paltarda görüb onun Peyğəmbər nəvəsi olmasını zənn etdilər və buna görə də ucadan fəryad edib deyirdilər: Salam olsun sənə, ey Rəsulullahın oğlu! İbni Ziyad isə onların heç birinə cavab vermirdi.

Camaatın çox hissəsi onu görmək üçün evlərdən çölə çıxır, sevimli rəhbərin gəlişi münasibəti ilə bir-birini təbrik edirdilər. İbni Ziyad onların Peyğəmbər oğluna qarşı bu qədər məhəbbətli olmasından dilxor olur, amma səsini çıxartmırdı. O, gəlib hökumət sarayının darvazasına çatdı. Nöman darvazanı bağlatdırmışdı. Elə ki, camaatın hay-küyünü eşitdi, qəsrin qülləsinə çıxıb dedi: Ey Rəsulullahın oğlu, mən bu əmanəti sənə tapşırmayacağam. Səninlə döyüşməyə də ehtiyacım yoxdur. Übeydullah qəzəblə fəryad edib dedi:–Qəsrin qapısını aç, yoxsa başına bir oyun açaram ki, cəhənnəmi gözünlə görərsən.

Bu səsi eşitcək oraya toplaşanların rəngi qaçdı və səhv etdiklərini anladılar. Übeydullahın arxasında duranlar onun səsini aydın şəkildə eşidərək, camaatın içinə qayıdıb qışqırırdılar: Kəbənin Allahına and olsun ki bu Mərcanənin oğludur.(٢) Kufəlilər təzə valinin qorxusundan narahat və əsəbani halda evlərinə dağılışır, bir-birinə deyirdilər: Çox keçməz ki, bu zalım və alçaq günümüzü qara edib bizi quru yurdda oturdar.



---

١- [٧۴] Məsirül-əhzan. səh.١۴.

٢- [٧۵] Tarixi-Təbəri ۶-cı cild, səh.٢٠١.

## KUFƏDƏ ÜBEYDULLAHIN NİTQİ

Sübh çağı camaat Übeydullahın yanına gəldilər və Übeydullah da onlara xitabən dedi:– Möminlərin əmiri Yezid məni sizin şəhərin sərhədlərinizi qorumaq, beytül-malı yığmaq üçün rəhbər təyin etmişdir. O mənə əmr etmişdir ki, məzlumlarla xoş rəftar edəm, yoxsullara bəxşişlər verəm. Onun əmrlərinə itaət edənlərə yaxşılıq edəm, sözümdən çıxanlara cəza verəm. Sizin hər biriniz gərək öz barənizdə yaxşı düşünüb, fitnə-fəsaddan uzaq olasınız(۱). Haşimi tayfasından olan o kişiyə mənim sifarişimi çatdırın, onu mənim qəzəbimə düçar olacağı ilə qorxudun(۲).

O, bu qeyzli xitabəni oxuyaraq, şəhərin agah şəxslərini hədələdi və onlardan Müslümün yoldaşlarının adlarını deməyi tələb etdi. Bu işə hazır olmayanları, yaxud Müslümün tərəfdarlarına öz evində sığınacaq verənləri qanlarına qəltan edəcəyini, evlərinin qarşısında dar ağacından asılacaqlarını, qohum-əqrəbalarının da ümumi hüquqlardan məhrum ediləcəklərini,(۳) və yaxud da Zarə məntəqəsinə(۴) sürgün olunacaqlarını bildirdi.



---

۱- [۷۶] İrşad (Şeyx Müfid)

۲- [۷۷] Nəfəsül-məhmum, səh ۴۹.

۳- [۷۸] İrşad (Şeyx Mufid)

۴- [۷۹] Zarə bir məntəqənin adıdır ki, Übeydullah ibni Ziyad Mərqə ibni Səmat Əsədi adlı bir nəfəri oraya sürgün etmişdi. O, Aşura günü İmam (ə)-ın tərəfində döyüşürdü. Nəhayət, öz qüvvəsi tükəndi, qılınc götürməyə getdi. Amma ailəsi onu özlərinə tərəf çağırdılar, dedilər ki, sən bizim yanımıza gəl, biz sənə aman verərik. O, bu dəvəti qəbul etdi, düşmən ordusuna qoşuldu. Döyüş qurtarandan, əsirlər Kufəyə aparıldıqdan sonra Ömər Səd bu kişini Übeydullaha təqdim etdi, İbni Ziyad da onu Zarəyə sürgün etdi (Tarixi-Təbəri, ۶-cı cild, səh.۲۶۱.

Kufə camaatı heç vaxt yüksək insani hədəflər, əsasında hərəkət etməmişdilər. Arvadsifətli kişilər kimi hər gün özlərinə bir yol seçirdilər. Bir gün tamah onları müəyyən mərama doğru çəkir, başqa bir gün şəhvətpərəstlik tamamilə başqa bir istiqamətə təhrik edərdi. Azacıq bəxşişdən vəcdə gəlir, cüzi miqdarda mal-dövlət aldıqdan sonra öz qəzəblərini udurdular. Bu murdar xasiyyət onları həm dünyadan, !həm də dindən məhrum etmişdi

## KUFƏLİLƏRİN HƏMİŞƏKİ ADƏTLƏRİ

Bunlar kufəlilərin elə əvvəldən adət etdikləri ruhi xəstəliklər idi. Xüsusilə Həzrət Əmirəl-möminin, İmam Həsən və İmam Hüseyn (əleyhimüs-salam)-ın dövrlərinə, həmçinin Kərbəla qiyamından sonra baş verən hadisələrə nəzər salsaq, görərik ki, kufəlilər öz işlərini elə bu qayda ilə davam etdirmişlər. Təvvabin hadisəsi (qanlı Kərbəla faciəsindən sonra tövbə edənlərin hərəkatı), Muxtarın qiyamı, Ələvilərin hökuməti, xüsusilə də Zeydin qiyamı və s. kimi hadisələr göstərir ki, Kufə əhalisi həmişə öz rəhbərlərini qiyama, inqilaba vadar etmiş, iş çətinliyə düşəndə isə tənh qoyaraq .aradan çıxmışdılar

Tarixdə kufəlilərin bir işi başlayıb axıra qədər öz əqidələrində sabit qalması hələ də .görünməmişdir

Qəribədir, bəziləri Kufə əhalisini Əli (əleyhis-salam)-ın şiələri hesab edirlər! Əgər doğrudan da belədirsə, bəs onda Ələvilərin kökünü kəsmək

istəyən, Əli (əleyhis-salam)-ın nəslindən olan hər bir mömin şəxsi qanına qəltan etmək istəyən kimlərdir?! Məgər Kərbəla müsibətində Ömər Sədin otuz min nəfərdən çox olan qoşununu kufəlilər təşkil etməmişdilərmi? Onlar Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in nəvəsinə məktub yazaraq, öz şəhərlərinə dəvət etdilər, amma Həzrət onların yanına gəldikdən sonra, bağladıqları əhd-peymanı pozdular və .Mərcanə oğlunun (İbni Ziyadın) bayrağı altında öz əməl dəftərlərini əbədilik ləkələdilər

Übeydullah Kufəyə gələndə nə dost-tanışı var idi, nə də köməkçisi. O, şəhərə daxil olarkən elə yalqız idi ki, hətta camaatın etirazlarından amanda qalmaq üçün üzünü örtmüş və elə geyinmişdi ki, baxanlar onu Hüseyn ibni Əliyə (əleyhis-salam)-a oxşadıb öldürməsinlər. Buna görə də bu çağırılmamış qonağı görənlər onun Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in nəvəsi olduğunu güman edir və salam verirdi. İbni Ziyad qəsrə daxil olarkən yalnız bir-iki nəfər ona qoşuldular. Bu bir-iki nəfərə hücum edib öldürmək kufəlilər üçün çox asan bir iş idi. Çünki qəsrin içindəkilərin hamısı köməkdən məhrum idilər. Halbuki Həzrət Müslümə beyət edənlərin sayı ۲۵ min nəfərə .çatırdı

Əhd-peymanlarına sadiq olmayan bu xalqı bağışlamaq olarmı? Onlar hansı dəlilə görə beyətlərindən əl çəkib, atası məlum olmayan bir haramzadənin mənasız hədə-qorxusundan təşvişə düşdülər? Bəlkə onlar belə fikirləşirdilər ki, böyük bir qoşun Şamdan İraqa tərəf hərəkətdədir? Məgər onlar bilmirdilər ki, Əməvilərin başı Müaviyənin ölümünə qarışmış, hələ onun canişini səltənət taxtında möhkəm ?əyləşməmiş, Şam hələ də iztirab və təşviş içərisindədir

Bundan əlavə, əgər ordu İraqa gəlib çatsaydı belə, əvvəla, bu xalqın onlarla vuruşmağa kifayət qədər qüvvələri var idi, ikincisi artıq İmam Hüseyn (əleyhis-salam)-ın rəhbərliyini qəbul edərək Müslümə beyət etmişdilər. Tutaq ki, kufəlilərin əməvi cəlladlarının qarşısında dayanmağa o qədər də qüdrətləri yox idi, buna görə də ruhi iztirab içərisində idilər və imamlarının köməyinə gələ bilməmişdilər. Amma, yəni onlar o qədər də gücsüz idilər ki, Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) övladını öldürməkdən belə imtina da edə bilmədilər?!

Məgər onlar Siffeyn müharibəsindən sonra Müaviyənin səltənətini məhv etmək üçün qüvvə toplamaq istəyən Əmirəl-mömininə xəyanət edənlər, ətrafından dağılışanlar deyildilərmi? O Həzrəti elə namərdcəsinə tərk etdilər ki, Həzrət öz atəşin xütbələrindən birində bu barədə belə buyururdu:

Təəccüb! Allaha and olsun, insanın ürəyi dayanır, qəm-qüssəsi həddən artır. Müaviyə və onun köməkçiləri batil məqsədlər yolunda bu qədər sıx birləşmişlər, siz (namərdlər) isə haqq və düzgün məqsədlər yolunda parçalanmısınız?! Kaş ki,sizi görməyəydim və tanımayaydım. Allaha and olsun ki, sizinlə tanışlığımın peşmançılıq və qəm-qüssədən başqa bir səmərəsi olmadı. Allah sizi öldürsün, ürəyimi parçalamış, sinəmi qəzəblə doldurmusunuz. Çəkdiyim hər nəfəs mənə hüzn və qəm-qüssə gətirir. Mənə qarşı etinasızlıq etdiniz, əmrimdən çıxmaqla fikirlərimi alt-üst etdiniz(١).

Bəli, əgər murdar əməvi hökuməti kufəlilərin köməyinə arxalanmasaydı, heç vaxt Peyğəmbərin



---

١- [٨٠] Nəhcül-bəlağə, ٢٧-ci xütbə.

.məsum övladları ilə müharibə etmək fikrinə düşməzdi

Elə bu alçaqlar (kufəlilər) özləri Əhli-beyt ilə müharibə etmək üçün əl-ələ verərək, .onların üstünə kinli düşmənlər kimi hücum etdilər

## HƏZRƏT MÜSLÜM HANİNİN EVİNDƏ

Həzrət Müslüm Kufədə müxtəlif hadisələrlə rastlaşırdı. İbni Ziyadın ora gəlməsini və etdiyi işləri (camaat qarşısında danışmağı, onları hədələməyini və camaatın da təşvişə .düşərək öz vəhdətlərini əldən verməlerini) ona xəbər verirdilər

Həzrət Müslüm nigaran qaldığından Muxtarın evindən çıxıb şəhərdə böyük şəxsiyyət kimi tanınan Haninin evinə getdi. O bilirdi ki, Hani ictimai nüfuz və qüdrət baxımından Muxtardan daha üstündür, həmçinin o, Əhli-beytin vilayətinə etiqadı olan iradəli bir .şəxsdir

.Hani Müslümün onun evinə gəlməsindən çox xoşhal oldu

Böyük şəxsiyyət sahibi Hani ibni Ürvə Murad qəbiləsindən olması ilə yanaşı, Kufənin tanınmış ağsaqqallarından və Quran qarilərindən sayılırdı. Şəhər camaatı onun ehtiramını saxlayır, ailəsinə hörmət edirdilər. Murad qəbiləsinin başçılığı onun öhdəsində idi. ۴ min nəfər süvari və ۸ min piyada qoşun isə həmişə onun əmrinə hazır idi. Əgər onun Kində qəbiləsindən olan həmpeymanlarını da əlavə etsək, otuz min .(nəfərdən çox cəngavər olardı(۱



---

.Əğani, c. ۱۴ səh.۹۵[۸۱] -۱

Hani Həzrət Əli (əleyhis-salam)-ın elm və ədəb xəzinəsindən çoxlu bəhrələr(١) götürmüşdü. Hər üç döyüşdə (Cəməl, Siffeyn, Nəhrəvan) igidliklə iştirak etmiş və mərd-mərdanə döyüşmüşdü(٢). Bu mərd insan İslam Peyğəmbəri (səlləllahu əleyhi və alihi və səlləm)-in zəmanəsində də var idi. Şəhid olanda yaşı doxsanı ötmüşdü(٣). Onun məqamı barədə təkcə bunu qeyd etmək kifayətdir ki, Həzrət Seyyidüş-şühəda (əleyhis-salam) Sələbiyyədə onun şəhadət xəbərini eşitdikdə, onun üçün Allahdan rəhmət diləmişdi (Müslüm ibni Əqil və Hani ibni Ürvənin şəhid olmağı və öldürüldükdən sonra şəhərin küçə-bazarında yerlə sürülmələri xəbərini eşidib buyurdu:

(Allah Öz rəhmətini bu iki şəhidə şamil etsin! Bu sözü bir neçə dəfə təkrar etdi(٤).

Müslüm Haninin evinə daxil olan vaxt Şərik ibni Əvər də arxasınca ora gəldi və elə orada da xəstəlik yatağına düşdü.(٥)



---

١- [٨٢] İbni Əaskirin tarixi

٢- [٨٣] Zəxirətüd-dareyn, səh٢٧٨.

٣- [٨۴] İbni Həcər, (Əl-isabə)

۴- [٨۵] Tarixi-Təbəri, ۶-cı cild səh ٢٢۵.

۵- [٨۶] Şərik Əliin (ə) layiqli şiələrindən idi, Bəsrədə olurdu. Siffeyn müharibəsində o Həzrətin tərəfində vuruşur, Əmmar ibni Yasirin döyüş yoldaşlarından sayılırdı. Haninin köhnə dostu olduğuna görə görüş üçün onun eviiə getmişdi. Günlərin birində o, Müaviyənin yanına gələndö, Müaviyə ona dedi: Sən çirkinsən və gözəl üz çirkin üzdən yaxşıdır, adın da Şərikdir halbuki Allahın şəriki yoxdur. Sən taygözsən, halbuki iki gözlü adam bir gözlüdən yaxşıdır. Bəs necə olub ki, öz qəbilənə rəhbərlik məqamına nail olmusan)? Şərik dedi: Sənin adın Müaviyədir. bu da hürən it deməkdir . Sən Hərbin oğlusan və sülh, hərbdən yaxşıdır. Sən Səxrin (mənası çınqıllıqdır) oğlusan, düz yer də səxrdən yaxşıdır. Qəbilənin adı da Üməyyə dir. Üməyyə balaca, dəyərsiz kənizə deyərlər. Bəs necə oldu ki, özünü möminlərin əmiri adlandırırsan? Bunu deyib Müaviyənin yanından çıxdı.

İbni Ziyad Şərikə xəbər göndərərək onunla görüşmək istədiyini bildirdi. Şərik fürsəti qənimət sayıb İbni Ziyadı öldürmək üçün Müslümü həvəsləndirərək dedi:–Sənin, eləcə də bütün şiələrin arzusu bu murdar və zalım adamı məhv etməkdir. Yaxşı olar ki, pərdə arxasında gizlənəsən, İbni Ziyad mənim yanıma gəlib oturduqdan sonra, həmlə edib onu öldürəsən. Bil ki, mən böyük məmnuniyyətlə Kufənin işini sənə .(tapşıracağam(١

Onlar elə bu söhbətdə idilər ki, Übeydullahın gəldiyini xəbər verdilər. Müslüm gizləndi, Übeydullah Şərikin yanına gəlib oturdu. Bir neçə an keçdi, amma Həzrət Müslümdən bir xəbər çıxmadı. Onun bu hərəkətindən heyrətə gələn Şərik, xatırlatmaq üçün əmmaməsini başından götürüb yerə, sonra yenidən yerdən götürüb başına qoydu. Bu işi bir neçə dəfə təkrar edib, nəhayət uca səslə bu şeri dedi:–Bir qurtum sərin su tapılar ki, susuz olanda içəm? Elə bir su ki, bütün ümidlər ona dikilmişdir; əldən çıxması, tələf olması gözlənilir. Əgər aqibətinin pis olmasından qorxursansa, bil ki, gələcəkdə də (onun əzab-əziyyətlərindən amanda qalmayacaqsan.(٢

O, ardıcıl olaraq bu şeri deyir və Müslümün gizləndiyi yerə baxırdı. Elə ki, bu işin faydasız olduğunu gördü, uca səslə dedi:–Ona su verin, hətta mənim ölümümlə .tamamlansa belə

Bu vaxt Übeydullah üzünü Haniyə tutub dedi:–Əmioğlun xəstəliyin şiddətindən .sayaqlayır



---

Məsirül-əhzan, səh .١۶[٨٧]-١

Riyazül-məsaib, səh.۶[٨٨]-٢

Hani onun sözünü təsdiq edib dedi:–Şərik yorğan-döşəyə düşən vaxtdan bəri mənasız .sözlər danışır, elə sözlər deyir ki, heç özü də mənasını bilmir

Bir qədər keçdikdən sonra İbni Ziyad durub getdi. Həzrət Müslüm gizləndiyi yerdən çıxdıqda Şərik ondan İbni Ziyadı öldürməməsinin səbəbini soruşdu. Müslüm dedi: -Mən iki dəlilə görə bu işi görmək fikrindən daşındım. Birincisi, Əmirəl-mömininidən (əleyhis-:salam) eşitdiyim rəvayət idi. Həzrət buyurmuşdu

İman (kimisə) gözlənilmədən qətlə yetirməyin qarşısını alır. Belə isə, mömin olan şəxs (heç bir kəsi qəfildən öldürməz.(۱)

İkincisi budur ki, İbni Ziyad bura gəlməzdən əvvəl Haninin arvadı məni and verdi ki, bu işi onun evində törətməyim. O, mənim qarşımda ağlayıb xahiş etdi ki, İbni Ziyadı öldürməyim. Hani narahat olub dedi:–Vay olsun ona, bu xahişlə həm məni ölüm ayağına vermiş, həm də özünü təhlükəyə salmışdır. O qaçıb qurtarmaq istədiyinin tələsinə düçar olub.Bu görüşdən üç gün sonra Şərik vəfat etdi. İbni Ziyad ona meyit namazı qılıb Səviyyə adlı bir yerdə dəfn etdi(۲). Həzrət Müslüm bu işi ilə özündən sonrakı nəsillərə yüksək məqsəd və məramlara çatmaq yolunda dinin müqəddəs qanunlarının tapdalanmamasını öyrətdi. Anlatdı ki, nicat tapmağın, Allahın razılığını əldə etməyin yeganə yolu ilahi



---

Tarixi Təbəri, c. ۶ səh.۲۰۴.Mənaqib, c. ۲ səh.۳۱۸ [۸۹] -۱

Sonralar İbni Ziyad başa düşdü ki, Şərik Müslümü təşviq edirmiş ki, onu öldürsün,[۹۰] -۲ and içdi ki, bundan sonra heç bir iraqlıya meyit namazı qılmasın. O, dedi: Əgər Ziyadın qəbri bu məntəqədə olmasaydı, Şərikin qəbrini açıb çəsədini çölə çıxardardım. (Tarixi-(ibni Əsir c ۴ səh.۱۱

əmrlərə müti olmaqdadır. Şərafətli insanlar heç vaxt məqsəd vasitəni doğruldur kimi .aldadıcı şüarı qəbul etmir

## ÜBEYDULLAHIN CASUSU MÜSLÜMÜ TƏQİB EDİR

.Həzrət Müslümün Haninin evində olmasını sədaqətli şiələrdən başqa heç kəs bilmirdi

İbni Ziyad Müslümü ələ keçirmək fikrinə düşdükdən sonra bu barədə fəaliyyətə başladı. Bu məqsədlə Şərikin vəfatından sonra Məqəl adlı bir qulu çağırıb ona üç min dirhəm pul verdi, əmr etdi ki, şiələrlə görüşüb özünü Şam əhlindən, Zülməla Hümeydi qəbiləsindən olan bir adam kimi qələmə verib desin ki, mən Allahın lütfü ilə Əhli-beyt dostlarından olmuşam. Eşitmişəm ki, Hüseyn ibni Əlinin tərəfindən bu şəhərə bir nümayəndə gəlib, məndə ona çatası bir miqdar pul vardır. Məqəl şəhərin Came məscidinə gəldi, Müslüm ibni Ovsəcəni orada namaz qıldığını gördü. Camaatdan eşitdi ki, Müslüm ibni Ovsəcə İmam Hüseyn (əleyhis-salam) üçün beyət alır. Məqəl dərhal onun yanına gedib, məqsədini söylədi. Müslüm ibni Ovsəcə onun sözlərinə inanıb onu dua etdi və ondan beyət aldı, onunla əhd-peyman bağlayaraq Həzrət Müslümün .gizləndiyi yeri gizli saxlamağı və bu barədə heç kimə bir söz deməməyi tapşırdı

Beləliklə Məqəl Müslüm ibni Ovsəcə ilə birlikdə Haninin evinə gəlib gətirdiyi pulları Əbu Səmamə Saidiyə tapşırdı. Əbu Səmamə gözüaçıq, pəhləvan və

tanınmış bir şiə idi. Həzrət Müslüm onu şiələrin maliyyə işlərini sahmana salmaq, silah və döyüş sursatı almaq üçün məsul təyin etmişdi. Bununla da Məqəl hər gün gündüzlər Müslüm ibni Əqilin yanına gəlir, daxili hadisələrdən, qiyam və gələcək proqramlar .barəsində məlumat əldə edir, gecələr isə İbni Ziyada xəbər verirdi

### HANİNİN ÜBEYDULLAH TƏRƏFİNDƏN ÇAĞIRILMASI

Übeydullah Həzrət Müslümün Haninin evində olmasından xəbər tutan kimi Əsma ibni Xaricə, Məhəmməd ibni Əşəs və Əmr ibni Həccac adlı üç nəfəri çağırıb Haninin hökumət qərargahında olmamasının səbəbini soruşdu. Onlar bildirdilər ki, o, xəstədir. Übeydullah onların cavabını qəbul etmədi, çünki onun əlaltıları xəbər vermişdilər ki, Hani gecələr öz darvazasının qarşısında oturur. Buna görə də həmin üç nəfər Haninin yanına gəldi. Ona and verib, birlikdə Übeydullahın yanına getməsini xahiş etdilər; çünki əks təqdirdə onun, çox qəddar bir adamolub heç cür bəhanə qəbul etmək istəmir. Übeydullahın göndərdiyi şəxslərin əl çəkməyəcəklərini görən Hani dəvəsinə minib yola düşdü. Übeydullah Hanini görən kimi qışqırıb dedi: Xain özü-öz ayağı ilə bizim yanımıza .gəlibdir

Sonra üzünü Şüreyhə tutub dedi:–Mən ona bəxşiş vermək niyyətindəyəm, o isə məni ?öldürmək istəyir, de görüm öz dostuna hansı bəhanələrlə bəraət qazandıracaqsan

Sonra qəzəbli halda Haniyə xitab edərək dedi:–Sən Müslüm ibni Əqilə öz evində yer ?verib onun üçün silah yığırsan

Hani onun sözlərini inkar etdi, nəticədə mübahisə başladı. Sonra Məqəli çağırıb Hanini başa saldı ki, onun hər şeydən xəbəri vardır. Yaşlı bir kişi olan Hani daha Mərcanə oğlunun sözlərini inkar edə bilmədi. Bir an fikrə gedib, sonra üzrxahlıq etməyə başladı:–Mən Müslümü evimə dəvət etməmişəm, onun özü mənim evimə gəlib, məndən sığınacaq istəmişdir. Mən onu qəbul etməməkdən utandım, qəbul etdikdən sonra isə onun mühafizəsini və təhlükəsizliyini təmin etməli idim. Mən öz qonağımın təhlükəsizliyini təmin etməli idim. Sonra İbni Ziyaddan istədi ki, ona icazə versin ki, gedib Müslümdən onun evini tərk etməsini istəsin. Sonra əlavə edib dedi ki, mən Müslümü öz evimdə sənə təhvil verib, həmişəlik ərəblərin lənətini qazana bilmərəm. Bu iş üçün sənin yanında girov qoyuram. İbni Ziyad özündən çıxıb dedi ki, sən Müslümü .(mənə təhvil verməyincə çölə çıxmayacaqsan(١

Hani dözə bilmədi öz batini əqidəsini açıqlayaraq İbni Ziyada başa saldı ki, Həzrət !Müslüm rəhbərliyə səndən daha ləyaqətlidir

İbni Ziyad qəzəblənərək, ondan qəti surətdə Müslümü onun yanına gətirməsini tələb etdi. Hani də qətiyyətlə Heç vaxt!–dedi–Kişilikdən deyil ki, mən öz qonağımı sənə təhvil verim, sən də onu öldürəsən. Ey ibni Ziyad, əgər Müslüm mənim iki ayağımın altında –:olsaydı, heç vaxt ayaqlarımı yerdən ayırmazdım. İbni Ziyad yenə də qəzəblənib dedi



---

.Kamil ibni Əsir, c. ۴ səh.١١[٩١]-١

Əgər Müslümü buraya gətirməsən, cəllada əmr edərəm boynunu vurar. Hani dedi:– Əgər bu işi görsən, onda siyirmə qılınclı igidlərlə üzləşməli olacaqsan. (Hani ibni Ürvənin otuz min nəfər döyüşçüsü var idi. O, belə təsəvvür edirdi ki, onun qohum-əqrəbası onunladır və hər an onu müdafiə etməyə hazırdırlar.) Bu sözlərdən qəzəblənən İbni Ziyad Haninin üzərinə hücum edib əlindəki ağac sınana qədər onun baş-gözünə o qədər vurdu ki, üst-başı tamam qana bulaşdı. Hani tam şücaətlə Übeydullahın mühafizəçilərindən aldığı qılıncla onun işini bitirmək istəyirdi ki, yanındakı !kişi mane oldu. Übeydullah işi belə görəndə bağırıb dedi:–Sənin qanın mənə haladır

Sonra qulamlarına əmr edərək, Hanini saray otaqlarının birində zindana saldırdı və .ona nəzarət etmək üçün bir nəfər təyin etdi

Əsma ibni Xaricə Übeydullaha öz narahatlığını bildirərək –Sən ona kələk gəldin– dedi– Bizə əmr etdin və biz də onu sənin yanına gətirdik. İndi isə ona qarşı bu cür hərəkət .edirsən! Üz-gözünü yaralayıb, qanını axıdırsan

.İbni Ziyad əmr etdi ki, onu məclisdən qovsunlar

Məhəmməd ibni Əşəs dedi:–Biz əmirin xeyrimizə, yaxud zərərimizə olan bütün !qərarlarından razıyıq, çünki Əli bizi ədəbləndirir

Əmr ibni Həccaca xəbər çatdı ki, Hanini öldürüblər. (Bir rəvayətə görə Hani onun bacısının əri

(idi(١), başqa bir rəvayətə görə isə Hani Əmr ibni Həccacın qızını almışdı.)(٢

Əmr dərhal Müzhəc qəbiləsinin adamları ilə hökumət binasına tərəf yürüş edib oranı .mühasirəyə aldı

İbni Ziyad işi belə görəndə Şüreyh qazıya Haninin yanına getməyi, sonra isə onun sağ .olması xəbərini camaata çatdırmağı tapşırdı

Digər tərəfdən Hani qəsrin ətrafındakı, səs-küyü eşidib başa düşdü ki, Müzhəc qəbiləsi onu xilas etmək üçün gəlmişdir, Buna görə də uca səslə dedi: Ey igidlər, dadıma çatın! Hardadır mənim qohumlarım, hardadır imanlılar, həmyerlilərim hardadır? Görəsən ?qəbiləmdən məni qaniçən düşmənin əlindən xilas edə biləcək on nəfər tapılarmı

Görəsən onun səsini kimsə eşitdi? Bu səs çöldəkilərə çata bilərdimi, halbuki qəlblərə) .(qorxu düşmüş, tamah və hərislik vucudlarına hakim olmuşdu

Bəli, müsəlmanların qazısı Şüreyh, İbni Ziyadın əmri ilə Haninin yanına, oradan isə camaatın yanına gedərək Haninin sağ-salamat olmasını onlara çatdırdı. Onlar da arxayınlaşıb evlərinə qayıtdılar. Əfsuslar olsun ki, heç kəs axıra kimi etiraz edib demədi ki, sən nə cürətlə Haniyə kömək lazım olduğunu gizli saxlamısan. Məgər Hani öz qohum-qəbiləsindən kömək istəmirdimi? Şüreyh nə fikirləşirdi? Nə olardı ki, o da haqq-həqiqətin müdafiəsi yolunda canından keçib mömin bir şəxsi quduz muzdurun caynağından



---

Tarixi-Təbəri c. ۶ səh.٢٠۶[٩٢] -١

(Lühüf. (Seyyid ibni Tavus[٩٣] -٢

xilas edəydi. Şüreyh kimi qoca və ölüm ayağında olan bir adamın öz həyatını biabırçı surətdə davam etdirməsinin nə faydası var idi? Bəli, Şüreyh zahirdə dindən dəm vuran, amma xəlvətdə zalım hakimlərlə əlbir olan, qoyun dərisinə girmiş canavar idi. Doğrudan da qəribədir, kufəlilərdən soruşmaq lazımdır ki, qəsri mühasirə etdikdən sonra nə üçün bir nəfərin sözü ilə dağılışdınız? Məgər siz, yalnız onun sağ olub-olmamasını bilmək istəyirdiniz? Sağ olsaydı da belə onu canavarların caynağında qoyub getmək nə dərəcədə doğru bir işdir?! Məgər siz onun azad edilməsi üçün səy ?etməli deyildinizmi

***

Elə ki, Kufə əhli və Əmr ibni Həccac hökumət evini mühasirə etməkdən əl çəkdi, Übeydullah məscidə gəlib camaata dedi:–Allaha və rəhbərlərinizə (!) itaət edin, ixtilaf və ikitirəlilikdən uzaqlaşın. Çünki bu iş məhvə, rüsvaylığa, münaqişə və pərişanlığa .(gətirib çıxaracaq(١

Həmçinin o, Məhəmməd ibni Əşəs, Şibs ibni Ribi, Qəqaə ibni Şur Zühəli, Hüccar ibni Əbcər, Şimr ibni Zilcovşən və Əmr ibni Hərisə əmr etdi ki, aman vermək üçün bayrağını .qaldırıb camaatı mübarizə fikrindən yayındırsınlar

Bəzi qorxaqlar elə ilk andan bu muzdurların çağırışına müsbət cavab verdilər; bəziləri .(isə mal-dövlət tamahı üzündən Həzrət Müslümə kömək etməkdən əl çəkdilər(٢



---

Tarixi-Təbəri, c. ۶ səh.٢٠٧[٩۴] -١

.Kamil ibni Əsir, c. ۴ səh.١٢[٩۵] -٢

Həzrət Müslümün qiyamı əvvəlcədən nəzərdə tutulmuş plan əsasında hazırlanmışdı. Hamı özünü o vaxtın gəlib çatmasını, hərbi qüvvələrin səfərbər edilməsi, döyüş sursatı və taktikası lazımınca hazırlanırdı. Bbu vaxtlar idi ki, Hani gözlənilmədən cəlladlar tərəfindən ələ keçirildi. Bu gözlənilməz iş Həzrət Müslümün planlarını bir-birinə vurdu. Hani Həzrət Müslümün qərargah rəisi və müşaviri idi. Onun evi hökumət müxaliflərinin mərkəzi qərargahı sayılırdı. Buna görə də Həzrət Müslümün işi ağırlaşdı, çünki hər an .ələ keçmək ehtimalı artırdı

Artıq Həzrət Müslüm özünə vacib bilirdi ki, adamlarının xəyanəti nəticəsində ələ keçən Murad qəbiləsinin igid və müdrik pəhləvanını zülmün caynağından xilas etsin. Həzrət Müslüm Əbdüllah ibni Cazimi Hanidən bir xəbər gətirmək üçün Übeydullahın qəsrinə göndərdi. O, Haninin yaralanıb həbs edilməsindən xəbardar olan kimi Əbdullah ibni Cazimə əmr etdi ki ya Mənsurə ümməti(۱)şüarını versin. Çox keçmədi ki, camaat Haninin evinin yanında Müslümün dövrəsinə toplaşıb bu şüarı təkrar etməyə başladı. Bir rəvayətə görə ۴ min nəfər, Məsudinin (Mücucüz-zəhəb kitabında) yazdığına görə isə ۱۸ min nəfər Həzrət Müslümün ətrafına yığışdı. Müslüm ilk növbədə onları nizamlı ordu şəklinə salaraq, bayrağı Übeydullah ibni Əmrə verib Kində və Rəbiə qəbilələrinə, eləcə də süvari qoşuna



---

Mənsur mələklərin sərkərdəsinin adı idi. O, Bədr döyüşündə Peyğəmbərin (s)[۹۶] -۱ .köməyinə gəlmişdi ki, o dövrdə müsəlmanların şüarı belə idi

başçılıq etməyi tapşırdı. Müslüm ibni Osəcə Əsədiyə başqa bir bayraq verib Müzhəc və Əsəd qəbilələrinin, habelə piyada dəstələrinin sərkərdəliyini ona tapşırdı. Əbu Səmamə Əsədini Təmim və Həmdan qəbiləsinin başçısı seçib şəhər qoşun .bölmələrinin sərkərdəliyini isə Abbas ibni Cədənin ixtiyarında qoydu

.Beləliklə, qiyam başlandı, Həzrət Müslüm bir böyük qoşunla qəsrə sarı hərəkət etdi

İbni Ziyad came məscidində çıxış edən zaman keşikçilər təşviş içində yanına gəlib .camaatın qiyam xəbərini ona çatdırdılar

Übeydullahın vəziyyəti ağırlaşdı, cəld qəsrə girib bütün qapıları bağlamağı əmr etdi. Həzrət Müslümün çağırışı ilə camaat qəsrin ətrafını tutdu. Getdikcə onların sayı artır, məscid və bazar adamla dolur, İbni Ziyadın işi daha da ağırlaşırdı. Bu zaman onun köməkçilərinin sayı ۵۰ nəfərdən çox deyildi. Otuz nəfər qəsrin keşikçiləri, iyirmi nəfər .isə Übeydullahın dost-tanışı və Kufənin tanınmış adamları idi

Qoşunun elə ilk anlarda Kufədə Əməvi hökumətinin bünövrəsini darmadağın etməməsinin səbəbi elə indinin özündə də məlum deyildir. Amma üzüqara kufəlilər üçün heç də qəribə bir iş deyildi ki, Həzrət Müslümə kömək etməkdən əl çəkib, .şeytanın qoşununa üz gətirsinlər

## ÜBEYDULLAHIN FƏALİYYƏTİ

İbni Ziyadın göstərişi ilə Məhəmməd ibni Əşəs, Hüccar ibni Əbcər, Şimr ibni Zilcövşən özlərini camaatın içinə salıb onları hökumətin bol bəxşiş və

.hədiyyələri ilə ümidvar edib dedilər ki, Şam ordusu artıq yola düşübdür

Kəsir ibni Şəhab gün batana yaxın camaatın yanına gəlib dedi: Ey camaat, öz qohumlarınıza qoşulun, özünüzü fitnə-fəsada, əzab-əziyyətə salıb ölüm ayağına verməyin. Bilin ki, möminlərin əmiri Yezidin ordusu Şamdan Kufəyə doğru hərəkətdədir. Əli and içibdir ki, əgər mübarizədən əl çəkib evlərinizə qayıtmasanız, övladlarınızı ümumi hüquqlardan məhrum edəcək, müharibədəki üsyançıları Şam ....sərhədlərinə göndərəcək və

Beləliklə də camaatın arasına qorxu, ikitirəlilik düşməyə başladı. Qardaş-qardaşı tapıb, onu müharibədən saxlayır, qadınlar öz ərlərini çağırıb qaytarır, atalar övladlarının cihaddan əl çəkib sülhə üz gətirmələrini istəyirdilər. Bu şəxslər alçaq və rəzil insanlar .olub həqiqətləri başa düşməyə ləyaqətləri yox idi

## HƏZRƏT MÜSLÜM TƏKLƏNİR

Gecə qaranlığı hələ tam çökməmişdi ki, Həzrət Müslümün ətrafında üç yüz nəfərdən çox adam yox idi. İşa namazını məsciddə qılan zaman otuz nəfər ona iqtida etdi. Namazdan sanra Kindəyə doğru yollandı. Bir qədər yol getdikdən sonra artıq onun .arxasında heç kəs qalmamışdı

Həzrət Müslüm tənha idi, yolu tanımırdı, hətta ona bələdçilik etmək üçün bir nəfər olsun belə yox idi. O, yalqız halda atdan yerə endi və dostsuz, köməksiz Kufənin küçələrində sərgərdan halda yola düşdü. Yolun haraya aparıb çıxaracağı məlum ,deyildi

sığınacaq üçün bir yer tapa bilmirdi.(١). Bəli, camaat Həzrət Müslümü tək-tənha və yalqız halda tərk edib getdilər. Kufəlilər Həzrət Müslümü tək qoyub əhdlərini sındırmaqla namərdlik uçurumuna əbədi olaraq yuvarlanıb xəyanət və alçaqlıq .simvoluna çevrildilər

İbni Ziyad sarayın ətrafındakı həyəcan və hay-küyün kəsildiyini görüb başa düşdü ki, camaat artıq aldanaraq evlərinə getmişlər. O, dərhal öz əlaltılarına məscidin ətrafında axtarış aparmağı əmr etdi. Bununla heç kəsin orada gizlənmədiyinə əmin olmaq istəyirdi. Məmurlar çıraq yandırıb hər yeri nəzərdən keçirdilər, məlum oldu ki, məscidin .özündə və ətrafında Müslümün dostlarından bir kəs qalmamışdır

## ÜBEYDULLAHIN ÇIXIŞI

Kufənin qaniçən hakimi camaatın dağılışmasına tam əmin olduqdan sonra namaz qılmaq bəhanəsilə hamını məscidə dəvət etdi. Çox keçmədi, məscid adamla doldu. İbni Ziyad öz mühafizlərinin ciddi nəzarəti altında minbərə çıxıb dedi:–Müslüm ibni Əqil sizin aranıza ixtilaf salmışdır. Müslüm hər kəsin evində tapılsa, o adamın canı və malı təhlükə altına düşəcək. Hər kəs onun gizləndiyi yeri bizə xəbər versə, yaxud onu bizim yanımıza gətirsə Müslümün qan pulunu (diyəsini) ona verəcəyik. Ey Allah



---

Əxbarüt-tüval ,c. ۶ səh.٢٠٨, Şərhül-məqamat, c. ١ səh.١٩٢; Lühuf[٩٧] -١

.bəndələri! Allahın əzabından qorxun, başınızı bəlaya salmayın

## KUFƏDƏ HƏRBİ HÖKUMƏT

Çıxışdan sonra Übeydullah, şəhər polisinin rəisi Hüseyn ibni Nümeyri çağırıb, bütün evləri və küçələri nəzarət altına almağı əmr etdi. Hər bir vasitə ilə Müslümün şəhərdən çıxmasının qarşısını almağı ciddi şəkildə tapşırıq verib dedi ki, Müslüm qaçarsa, onu .ağır cəzalandıracaqdır

Hüseyn ibni Nümeyr dərhal əməliyyata başladı. Keşikçilərə küçələrin nəzarət altına alınmasını əmr edərək Həzrət Müslümə kömək edən tanınmış şəxsiyyətləri axtarıb tapmalarını tapşırdı. Gecənin ilk saatlarında Əbdül-Əla ibni Yəzid Kəlbi və Əmarət ibni .Səlhəb Əzüdini ələ keçirib zindana salaraq qətlə yetirdi

Bundan sonra İbni Ziyad Kufənin görkəmli şəxsiyyətlərini həbs etməyə başladı. Tutulanlar arasında Muxtar Səqəfi və Əbdullah ibni Nofəl də var idi. Bu iki nəfər Həzrət Müslümün köməkçilərindən sayılırdı. Həzrət Müslümün gözlənilməz qiyamı .başlananda Muxtar öz doğma kəndi Ləqfada idi

## HƏZRƏT MÜSLÜM TÖVƏNİN EVİNDƏ

Həzrət Müslüm Kufənin küçələrində yalqız və sərgərdan dolanaraq hara gedəcəyini düşünürdü. Bir qədər gəzdikdən sonra Tövə adlı bir qadının evinin qapısı yanında dayandı. Tövə əvvəllər Əşəs ibni Qeysin kənizi olmuş, ondan da bir oğlu var idi. Əşəs

onu azad etdikdən sonra Üseyd Xəzrəmi adlı bir nəfərə ərə getmiş və ondan Bilal adlı bir oğlu olmuşdu. Bilal da başqaları kimi Həzrət Müslümə qoşulmuşdu. Qadın indi öz oğlunun yolunu gözləyirdi. Həzrət Müslüm onu görcək salam verib, içməyə su istədi. Özü isə qapının astanasında oturdu. Tövə Həzrət Müslümə su gətirdi, bir azdan qayıdıb onu yenə də oradaca oturmuş görüb onun getmək niyyəti olmadığını başa ?düşdü. Odur ki, soruşdu:–Su içmədin

.Həzrət Müslüm həzin bir səslə:–Niyə, içdim

?Tövə–Bəs niyə öz evinə getmirsən

.Həzrət Müslüm sükut etdi. Qadın sualını bir daha təkrarlasa da, yenə cavab eşitmədi

Nəhayət iffət və namus onu məcbur etdi ki, qəlbində olanları açıb desin:–Sənin burada .oturmağına razı deyiləm. Sənə yaraşmaz ki, mənim evimin qarşısında oturasan

Həzrət Müslüm oturduğu yerdən qalxıb dedi: Ey qadın, mənim bu şəhərdə sığınacaq yerim yoxdur. Mümkündürmü ki, mənə öz evində sığınacaq verəsən? İnşallah, .gələcəkdə sənin yaxşılığının əvəzini çıxaram

?Qadın soruşdu:–Sən kimsən

.Həzrət Müslüm özünü ona tanıtdırıb dedi:–Bu camaat bizi aldatdı

?Qadın tam arxayın olsun deyə, yenidən soruşdu:–Sən Müslümsən

!Müslüm cavab verdi:–Bəli

Qadın sevinib dərhal onu evinə apardı. Həzrət Müslüm qadının oğlunun otağından başqa bir otağa daxil oldu. Qadın ona yemək gətirdi, lakin Həzrət Müslüm meyl etmədi. Bu minvalla qadın Həzrət Müslümə xidmət etməyə məşğul idi ki, oğlu Bilal

gəlib çıxdı. Gördü ki, anası tez-tez başqa otağa gedib-gəlir. Bildi ki, təzə bir xəbər vardır. Anasından soruşdu, o cavab verməkistəmədikdə, oğlu israr etdi. Nəhayət, anası Müslümü evinə gətirməsini ona söyləyib ondan bu sirri heç kəsə açmamağını dil-ağız etdi. Bilal isə bütün gecəni Übeydullahdan qiymətli hədiyyə almaq fikri ilə .dəqiqələri sayırdı

## HƏZRƏT MÜSLÜMÜN YUXUSU

Həzrət Müslüm bir anlığa yuxuya daldı. Yuxuda əziz əmisi Əmirəl-mömininini (əleyhis-salam) gördü. İmam ona buyurdu: Sabah mənim yanımda olacaqsan. Elə isə, tələs, !tələs

Həzrət Müslüm şəkk etmirdi ki, səhər sübh çağı şəhadətə çatacaq. Sübh açıldı, Həzrət Müslüm gecənin son anlarını Xaliqlə raz-niyaz edərək, özünü dinsizlər və münafiqlərlə .döyüşə hazırlayırdı

O, qadına xitabən buyurdu:–Sən mənə lazımınca yaxşılıq və ehsan etdin, beləliklə də .Allah Rəsulunun şəfaətindən bəhrələndin

(Öz yuxusunu ona danışdı.(١

## TÖVƏNİN OĞLUNUN XƏYANƏTİ

Bilal sübh çağı İbni Ziyadın sarayına, Məhəmməd ibni Əşəsin oğlu Əbdürrəhmanın yanına gedib, Müslümün onların evində olması xəbərini ona çatdırdı. Bunu eşidən Əbdürrəhman dərhal atasının



---

.Kamil, Şeyx Bəhai[٩٨] -١

yanına gedib, hadisəni ona danışdı. İbni Ziyad bu söhbəti eşitdikdən sonra Bilalı çağırıb boynuna qızıldan bir boyunbağı asdı. Öz adamlarından yetmiş nəfərlə birlikdə .Məhəmməd ibni Əşəsi Həzrət Müslümü tutmaq üçün göndərdi

Həzrət Müslüm atların ayaq səslərini və camaatın hay-küyünü eşidən kimi başa düşdü ki, onu tutmaq üçün gəlmişlər. Bu fəryad və hay-küylər mübarizənin başlanmasından .(xəbər verirdi. O, ayağa qalxıb düşmənə sarı irəlilədi(١

Zirehli paltar geymiş, əllərində iti qılınc olan yetmiş nəfər kiçik bir daxmaya bir nəfərin üstünə hücüm etdilər. Az qalırdı ki, evin divarlarını onun üstünə uçurub töksünlər. Lakin Həzrət Müslüm onların çoxluğundan çəkinmədən var qüvvəsi ilə hücumlarını dəf .edirdi

Elə ilk anlarda yetmiş nəfərdən qırxını həlak etdi. Onun döyüş şücaəti barədə bunu demək kifayətdir ki, düşmənlərin kəmərindən tutaraq evin damın üstündən yerə .(atırdı(٢

İffətli və mehriban bir qadın olan Tövə müntəzəm surətdə onu döyüşə təşviq edirdi. Döyüş şiddətləndi, düşmən muzdurlarında ümidsizlik yaranmağa başladı. Məhəmməd ibni Əşəs bir nəfəri ibni Ziyadın yanına göndərib ondan əlavə qüvvə göndərilməsini tələb edirdi, Übeydullah belə cavab göndərdi: Biz səni bir nəfəri tutmaq üçün göndərmişik, o isə təklikdə sizi bu hala salmışdır. Vay olsun sizə, əgər böyük bir ordu ilə ?qarşılaşsanız necə olar



---

.Riyazül-məsaib, səh.٢۶٥[٩٩] -١

.Nəfəsül-Məhmum[١٠٠] -٢

Məhəmməd ibni Əşəs xəbər göndərdi ki, Ey əmir, sən güman edirsən ki, məni Kufə tacirləri, ya adi adamlarla qarşılaşmaq üçün göndərmisən? Məgər bilmirsənmi ki, mən ?Mühəmməd ibni Əbdullahın ailəsindən olan bir qılıncla üzbəüzəm

Beləliklə, Übeydullah onun köməyinə təzədən ٥٠٠ nəfər döyüşçü göndərdi. Buna baxmayaraq Həzrət Müslüm yenə də döyüşü davam etdirirdi. Düşmən başını itirmişdi, hər an öldürülənlərin sayı artırdı. Onlar məcburiyyət qarşısında qalıb evin damına qalxaraq yanan taxtalarla mühasirəyə aldılar. Yaralar o Həzrət əldən salmışdı. Buna görə də Məhəmməd ibni Əşəs Həzrət Müslümə təslim olmağı təklif etdi. Lakin Həzrət Müslüm bu təklifi qəbul etmədi. Son nəfəsə kimi döyüşdü. Lakin susuzluq onu taqətdən ...salırdı

### HƏZRƏT MÜSLÜMÜN TUTULMASI

Susuzluq o Həzrətin döyüş qüdrətini əlindən almışdı. Bu vaxt namərdlərdən biri evin üstündən bir ox atdı. Həzrət Müslüm yerə yıxıldı. Onu tutub ibni Ziyadın sarayına gətirdilər(١). Bu vaxt Həzrət Müslümün gözündən yaş axmağa başladı. Əmr ibni Übeydullah güman edirdi ki, o Həzrət canının qorxusundan ağlayır. Dedi:–Hakimiyyətə .çatmaq kimi böyük bir arzusu olan şəxs əsir düşsə ağlamamalıdır



---

(Müntəxəb (Tureyhi[١٠١] –١

Həzrət Müslüm dedi:–Mən özümə yox, Hüseyn (əleyhis-salam) və onun övladları üçün .ağlayıram ki, hal-hazırda Kufəyə tərəf hərəkətdədir

Qəsrə çatdıqda, Həzrət Müslüm suzuzluğun şiddətindən divara söykənib dayandı. Gözü sərin su ilə dolu olan qaba sataşdı. Su içmək istədiyini bildirdi. Müslüm ibni Əmr Bahili həyasızcasına dedi:–Görürsən kuzənin suyu necə sərindir? Allaha and olsun ki, bu sudan bir damla olsun belə, içə bilməyəcəksən. Sən cəhənnəmin çirkab və yanar .suyundan içəcəksən

Həzrət Müslüm ondan–Sən kimsən!– deyə sual etdi

Dedi:–Mən elə bir kişinin oğluyam ki, sən haqqı inkar etdiyin vaxt o, haqqı qəbul etdi. Sən öz rəhbərindən üz döndərəndə, o öz rəhbərinə qoşuldu, sən üsyankarlıqla məşğul .olarkən o, öz rəhbərinin sözünü eşitdi. Mən Müslüm ibni Əmr Bahiliyəm

Müslüm ibni Əqil bu namərdin üstünə qəzəblənib dedi:–Anan matəmində otursun, sən nə qədər daş ürək və zalım adamsan! Əlbəttə, cəhənnəmin çirkab suyunu içməyə, .orada əbədi qalmağa məndən çox sən layiqsən

Bu söhbəti eşidən Əmr ibni Hüreys narahat olub özünün Səlim adlı qulamına əmr etdi .ki, Həzrət Müslümə su gətirsin

Suyu gətirdilər. Həzrət Müslüm hər dəfə su içmək istəyəndə ağzından axan qan damcıları su qabına düşürdü. Nəhayət, üçüncü dəfə suyu ağzına yaxınlaşdıranda qabaq dişləri qabın içinə töküldü. Həzrət Müslüm əllərini qaldırıb belə dua etdi: Əgər bu .su mənim qismətimdə olsaydı, ondan içə bilərdim

Nəhayət Həzrət Müslümü Übeydullahın yanına gətirdilər. O, rəyasət kürsüsündə əyləşmiş, Həzrət Müslüm isə onun müqabilində əli bağlı bir əsir kimi durmuşdu. O zalımın əlindən nicat tapmaq ümidi yox idi və bir xilaskar da gözə dəymirdi. Həzrət Müslüm ibni Ziyadın qarşısında nə baş əyib təzim etdi, nə də ona etina etməyib salam verdi. İbni Ziyadın yanındakılardan biri bağıraraq dedi:–Nə üçün əmirə salam ?vermədin

!Həzrət Müslüm qəzəblənib dedi:–Sus! O mənim əmirim deyil

İbni Ziyad ona xitabən dedi:–Sakit ol, ey Müslüm! Sən Kufəyə gəlib burada bir-biri .mehriban və sıx əlaqəsi olan adamların arasında təfriqə salıb, fikirlərini azdırmısan

Həzrət Müslüm dərhal dedi:–Heç də belə deyil. Mən bu niyyətlə Kufəyə gəlməmişəm. Camaatın inamı budur ki, sənin atan onların ata-babalarını qətlə yetirmiş, qanlarını nahaq yerə axıtmış, onların arasında Qeysər, Kəsra üslubu ilə hökmranlıq etmişdir.(١) Məhz buna görə də biz onların yanına gəlmişik ki, ədalət əsasında hökm edib ümməti .Allahın kitabına, Rəsulullahın sünnətinə tərəf dəvət edək

Übeydullah Həzrət Müslümün sözlərinə sona kimi qulaq asa bilməyib nalayiq sözlər –:deməyə başladı



---

Übeydullahın atası Ziyad ibni Übəyyədir ki, əvvəllər Kufənin hakimi olmuş, onun[١٠٢] -١ əli ilə çoxlu cinayətlər baş vermişdir. }oxları ona nifrət edir, eyni halda ondan bərk .qorxurdular

Nə danışırsan, ey bədəməl insan? Məgər bu camaatın işlərini ədalət əsasında təşkil edən biz deyilikmi? Biz bu işləri görəndə sən Mədinədə mey içməklə məşğul ?deyildinmi

Həzrət Müslüm dedi:–Mənə deyirsən? Məgər mən şərab içirəm? Tək olan Allah bilir ki, sən bu sözü düz demirsən, sözlərin nadürüstdür, mən sənin dediyin kimi deyiləm. Sən o adamları mey içməkdə günahlandıra bilərsən ki, müsəlmanların qanını içməkdən ləzzət alır, ehtiram olunması vacib olan şəxsləri qətlə yetirir, ömründə heç kəsi incitməyənləri öldürür, bədgümanlıq, qəzəb və kin-küdurət əsasında kütləvi qırğınlar törədir, gecə-gündüz eyş-işrətlə məşğul olur və bu işlərin heç birini özü üçün cinayət .hesab etmir

Artıq Həzrət Müslümün sözlərinə dözə bilməyən Übeydullah qəzəbli halda Hüseyn ibni Əli (əleyhis-salam), Əliyyibni Əbi Talib və Əqilə qarşı təhqiramiz sözlər deməyə .(başladı. Qəlbində olan bütün murdar sözləri dilinə gətirdi(١

Bu yerdə Həzrət Müslümün səbri tükəndi, fəryad çəkib dedi:–İstədiyini et, ey Allahın !düşməni

Übeydullah şamlı bir kişiyə Həzrət Müslümü qəsrin damına çıxararaq boynunu vurub .baş və bədənini oradan yerə atmasını əmr etdi



---

Bəli, Übeydullah dara düşmüşdü və bu mühasirə halqasından çıxmaq üçün Əlini[١٠٣] -١ (ə) söyməkdən başqa bir yol tapmadı. Halbuki Peyğəmbər (s) Əlinin (ə) barəsində belə buyurmuşdur: -Ey Əli! Allahı məndən və səndən qeyrisi tanımadı, məni Allahdan və səndən qeyrisi tanımadı, səni məndən və Allahdan qeyrisi tanımadı. (Darüssalam c. ٢ (.səh.٣٣٨

Həzrət Müslüm İbni Ziyaddan öz vəsiyyətini qohumlarından birinə demək üçün icazə .istədi. Übeydullah icazə verdi

Həzrət Müslüm bu məqsədlə qəsr əyanlarının içində Ömər ibni Sədi seçib dedi:–Mən səninlə qohumam, indi səndən istəyirəm ki, mənim vəsiyyətlərimi eşidib ona əməl .edəsən. Lakin mənim bu sifarişim gizlindir və onu adamların içində demək istəmirəm

Ömər Səd bu işi qəbul etməkdən imtina etdi, vəsiyyətə qulaq asmağa razı olmadı. Übeydullah ona tənə vurdu ki, öz əmoğlunun təklifini qəbul etməkdən boyun qaçırma. Ömər Səd çarəsiz qalıb, Həzrət Müslümlə birlikdə bir güncə getdi və Übeydullahın müşahidə edə biləcəyi bir yerdə vəsiyyətə qulaq asmağa başladı. Həzrət Müslüm ona dedi ki, qılıncını və zirehli paltarını satıb onun pulu ilə borcunu (təqribən ۶۰۰ dirhəm) ödəsin. (Bu məbləğ Həzrət Müslümün Kufəyə gəldiyi gündən şəxsi ehtiyaclarına xərcləmək üçün aldığı borc pul idi.) İkinci vəsiyyəti onun cənazəsinin ibni Ziyaddan alınıb dəfn edilməsi, üçüncü vəsiyyət isə bu xəbəri İmam Hüseyn (əleyhis-salam)-a .çatdırılması idi

Ömər Səd bu sifarişləri eşidəndən sonra Übeydullahın yanına gedib hamısını ona çatdırdı. İbni Ziyad dedi: Əmanətdar şəxs heç vaxt xəyanət etməz, amma bəzən xain .əmanətdar olur

Sonra şamlı kişi Həzrət Müslümlə birlikdə dama çıxdılar. Yol boyu Həzrət təsbih və təkbir deyib, istiğfar etməklə məşğul idi. Həyatının sonuna bir neçə dəqiqədən artıq vaxt qalmamışdı. Əllərini dua

etmək üçün qaldırıb Allah dərgahına ərz etdi: İlahi, bizə yalan deyib aldadan, xar edən və nəhayət qətlə yetirən milləti mühakimə et. Sonra iki rəkət namaz qılıb üzünü Mədinəyə tərəf tutaraq öz imamına–Həzrət İmam Hüseynə (əleyhis-salam) salam .(göndərdi(۱

Bundan sonra o namərd Həzrət Müslümün boynunu vurdu, bədənini Übeydullahın dediyi qayda ilə yerə atdı, özü isə vahiməli halda aşağı endi. İbni Ziyad onu bu halda görəndə qorxusunun səbəbini soruşdu. O cavab verib dedi: -Müslümü qətlə yetirmək istəyəndə, qəzəəbindən rəngi qaralıb barmaqlarını bir-birinə sıxmış qəzəbli bir kişi .gördüm

.İbni Ziyad dedi:–Yəqin ki, səni qara basıb

## HANİNİN ŞƏHADƏTİ

Həzrət Müslümü şəhadətə yetirəndən sonra Kufənin qaniçən hakimi Haninin gətirilməsini əmr etdi. Məmurlar onun əllərini bağlayıb bazara, qoyun satılan yerə gətirdilər. Hani fəryad çəkib dedi: Ey Müzhəc qəbiləsi, dadıma çatın, vay olsun mənim halıma ki, bu gün mənim yanımda qəbiləmdən heç kim yoxdur. Bu sözü iki dəfə təkrar etdi. Amma cavab eşitmədi, başa düşdü ki, onun köməyinə gələn olmayacaq. Güclü bir təkanla qolundakı ipi qırıb əllərini açdı, yenə fəryad etdi: Bir adam varmı mənə əsa, xəncər, ya ağac, ya da daş versin ki, canımı qoruyam? Məmurlar ona aman verməyib tutdular, dərhal əllərini iplə möhkəm bağladılar. Cəlladlar onu



---

Əsrarüş-şəharət, səh.۲۵۹[۱۰۴] -۱

öldürmək istəyəndə, dedilər ki, boynunu qabağa əysin, amma Hani bu işdən imtina .edib dedi:–Mən özümü öldürməkdə sizə kömək etmərəm

Nəhayət İbni Ziyadın qulamlarından biri olan Rəşid Tərəki ona bir zərbə vurdu, amma bundan da bir şey hasil olmadı. Hani Allahla raz-niyaz etməyə başladı: Bütün bəndələrin qayıdışı Allaha doğrudur. İlahi, sənin rəhmət və rizvanına doğru gəlirəm. «Rəşid ikinci zərbəni endirdikdə Hani şəhadətə çatdı

Übeydullah əmr etdi ki, Həzrət Müslümün və Haninin pak cəsədlərini Kufənin bazarlarında sürüyələr, sonra Kənasə məhəlləsinə aparıb başı aşağı dardan asalar. .Mübarək başlarını isə Yezidə ərməğan göndərələr

Bir neçə müddətdən sonra Übeydullah onların cəsədlərinin Qəsrin yaxınlığında dəfn edilməsi barədə hökm etdi. Bu da ondan ötrü idi ki, onun əlaltıları qəbirləri nəzarət altına alıb heç kəsi onların pak türbətlərini ziyarət etməyə qoymasınlar. Beləliklə, Kufənin qaniçən hakimi onların başlarını Hani ibni əbi Həyyə və Zübeyr ibni Ərvəhin vasitəsilə öz ağası Yezidin yanına göndərib ona xitabən belə yazdı: Allaha şükr olsun ki, o, əmirəl-mömininin (Yezidin) haqqını geri aldı, onun düşmənlər qarşısında təhlükəsizliyini təmin etdi. Əmirəl-mömininə (Allah onu əziz etsin) xəbər verirəm ki, Müslüm ibni Əqil Hani ibni Ürvə Muradinin evinə pənah gətirdi; mən onu və dostlarını tapmaq üçün casus göndərdim. Xüsusi ustalıq və hiylə ilə bu iki şəxsi gizləndikləri yerdən çıxartdım, nəhayət Allah məni onların ikisinə də qalib etdi. Sonra hər ikisinin boynunu vurdum. Onların başlarını iki nəfər–Hani ibni Əbi Həyyə və Zübeyr ibni Ərvəh vasitəsi ilə sənə göndərirəm. Bu qasidlər Əmrə müti olan və nəsihət qəbul edən

adamlardır. Əmirəl-möminin onlardan istədiyi şeyi soruşa bilər; Şübhəsiz bu iki nəfər lazım olan xəbərlərdən agahdırlar, dərrakəli, dözümlü və düz danışandırlar. Vəssalam

## YEZİDİN İBNİ ZİYADA YAZDIĞI CAVAB MƏKTUBU

Sən həmişə mən istəyən kimi olmusan. Kufədəki hərəkətin bir daha sübut etdi ki, sən uzaqgörən və tədbirli adamsan. Sənin coşmağın qorxmaz aslanın qızması kimidir. Sənin bu hərəkətinin müqabilində mənim başqa tədbir görməyimə ehtiyac yoxdur. Sənin barəndəki fikirlərimi əməli olaraq sübuta yetirdin. Mən də sənin göndərdiyin şəxsləri çağırıb sual-cavab etdim. Onların qulağına bəzi sözləri pıçıldadım, gördüm ki, elə sənin dediyin kimi–fəzilətli və düşüncəlidirlər. Belə isə onlara yaxşılıq et. Bir də mənə xəbər çatıb ki, Hüseyn ibni Əli Məkkədən çıxaraq, İrağa tərəf yola düşmüşdür. Sən hərbçi və keşikçiləri pusquda qoy. Şəhərdə hər kəs səninlə müxalifət etsə tutub zindana sal, səninlə vuruşmaq niyyətində olan şəxsləri qətlə yetir. İş və planların .barədə mənə xəbər çatdır Vəssalamu əleyk

(Bunu yazıb əmr etdi ki, o iki başı Dəməşqin darvazaları önündən assınlar.(١)



---

Mənaqib c. ۲ səh.۲۱۲[۱۰۵] -۱

### KUFƏ YOLLARI BAĞLANIR

Übeydullah ibni Ziyad Həzrət Müslüm və Hanini öldürdükdən sonra Kufəni sui-qəsdlər və vəhşət səhnəsinə döndərdi: Əvvəlcə hərbi hökumət elan edib öz əlaltıları vasitəsi ilə camaata iqtisadi cəhətdən təzyiq göstərdi. O, öz məmurlarına əmr etmişdi ki, qərib, qiyamçı, yaxud şübhəli adamların adlarını yazsınlar. Camaatı hədələyərək onları kiçik bir xilaf iş üstə edam edəcəyi, yaxın qohum-əqrəbalarının isə ümumi yardımlardan məhrum olunacağı ilə qorxudurdu. İbni Ziyad həmçinin elan etdi ki, hər kəsin barəsində Hüseyni himayə etməsi ehtimalı olunsa, mühakiməsiz edam olunacaq, evi .yandırılacaq, var-dövləti isə müsadirə ediləcəkdir

Beləliklə, o, Kufəni tam nəzarət altına aldı« Hicazdan Kufəyə gələn yolların hamısını bağladı. Kufəyə giriş-çıxışın qadağan olması barədə hökm çıxartdı. Qadisiyyədə (bu məntəqə Kufəni Hicazla əlaqələndirirdi) hərbi postlar qoydu, bu postu Hüseyn ibni Nümeyrin başçılığı ilə ۴ min nəfər döyüşçü qoruyurdu. Bu qayda ilə digər sərhəd nahiyələri də (Qətqətanə, Lələ və Kəfan ki, bu, Kufəni İraqın Bəsrə şəhəri və başqa bölmələri ilə əlaqələndirirdi) ordu vasitəsilə mühafizə olunurdu. Nəticədə, Kufəyə daxil .olmaq və ya çıxmaq mümkün deyildi

### YEZİDİN HİYLƏSİ

Yezid, Əmr ibni Səid ibni Ası böyük bir ordu ilə Məkkəyə göndərərək məxfi şəkildə İmam Hüseyni (əleyhis-salam) tutmağı ona əmr etdi. Bu iş baş tutmasa, qarışıqlıq salıb .onu ya öldürsün, ya da İmam döyüşə hazır olsa, onunla döyüşsün

səh:۱۶۵

Əmr ibni Səid Zilhiccənin ۸-də böyük bir ordunun müşayiəti ilə Məkkəyə daxil oldu. Elə buna görə də İmam (əleyhis-salam) ehram bağlamış halda dayanmadan Kəbəni təvaf etdi, sonra Səfa-Mərvə arasında səy və təqsir əməlini yerinə yetirərək ehram paltarından çıxdı. O Həzrət Zilhiccənin ۸-də, çərşənbə axşamı (Müslüm və Haninin .şəhadətə çatdığı gün) Məkkədən Kufəyə doğru yola düşdü

Beləliklə Əmr ibni Səid Yezidin İmam (əleyhis-salam) barəsində verdiyi əmri yerinə yetirməkdən məyus oldu. Yezidə bir məktub yazıb İmam (əleyhis-salam)-ın Məkkədən .çıxması xəbərini ona çatdırdı

İmam (əleyhis-salam)-ın uzaqgörənliyi ilə Məkkədə baş verəcək qarışıqlıq aradan götürüldü. Beləliklə də müqəddəs Kəbə evində törədiləcək hörmətsizlik təhlükəsi .sovuşdu

## İMAM HÜSEYN (ƏLEYHİS-SALAM)IN XÜTBƏSİ

Məkkədən çıxmazdan bir gün əvvəl İmam Hüseyn (əleyhis-salam) öz yoldaşlarına :xitabən belə buyurdu

Allahın dərgahına həmd-səna edirik. Allahın istədiyi olmalıdır və İlahi qüvvəyə arxalanmayan heç bir qüvvə mövcud deyildir. Allahın salamı İslam peyğəmbərinə olsun! Biz Əhli-Beyt (əleyhis-salam)-ın razılığı Allahın razılığından başqa bir şey deyildir. İlahi imtahana hazırıq, beləliklə də səbr edənlərə məxsus mükafatı alacağıq. Mən Rəsulullahın ciyərparəsiyəm və onun cigərparəsi heç bir vaxt ondan ayrılmayacaq. Onun gözü övladlarını görməklə

.aydın olub öz vədəsinə vəfa etsin-deyə behiştdə ona qovuşacağıq

Hər kəs öz qanını bu yolda axıtmağa hazırdırsa və özünü Allah ilə görüşə razı edibsə, .bizimlə birgə olsun. Mən, inşallah, sabah sübh çağı yola düşəcəyəm

Bu sözdən sonra o Həzrətin dostlarından bəziləri, o cümlədən İbni Abbas, Əbdüllah .ibni Zübeyr, Əbdüllah ibni Ömər Kufəyə getməməyi ona məsləhət gördülər

İmam (əleyhis-salam) Əbdüllah ibni Ömərlə görüşəndə onu özünə kömək etməyə dəvət etdi. Həzrət ona belə dedi: Allahın əzabından qorx, mənə kömək etməkdən əl .çəkmə

### MƏHƏMMƏD HƏNƏFİYYƏ İMAM HÜSEYN (əleyhis-salam)-IN HÜZURUNDA

İmam Sadiq (əleyhis-salam) buyurmuşdur: İmam Hüseyn (əleyhis-salam) Kufəyə yola düşmək istədiyi gecə Məhəmməd Hənəfiyyə o Həzrətin hüzuruna gəlib dedi: Qardaş, sən əvvəllər kufəlilərin atamıza və qardaşımıza qarşı etdikləri məkr və hiyləni görmüsən. Qorxuram ki, onlar sənə qarşı da belə etsinlər. Əgər Məkkədə, Allahın əmin-amanlıq hərəmində qalsan, möhtərəm, əziz olarsan. Məkkədə heç kimin səninlə .işi olmaz

İmam (əleyhis-salam) buyurdu:-Qorxuram ki, Yezid məni elə Məkkədə şəhid etsin. .İstəmirəm ki, mənə görə Kəbə hərəmində hörmətsizlik olsun

Məhəmməd dedi:–Belə isə Yəmənə, yaxud da səhralara get, bu halda heç kim səni .tapa bilməz

.İmam (əleyhis-salam) buyurdu:–Gərək bu barədə fikirləşəm

.Səhər açılanda Həzrət buyurdu:–Dəvələri yükləyin

Bu xəbər Məhəmməd Hənəfiyyəyə çatanda taqətsiz halda gəlib, qardaşının dəvəsinin yüyənindən yapışaraq dedi:–Qardaş, mənə söz vermişdin ki, bu iş barəsində ?fikirləşəsən, bəs nə üçün səfərə bu tezlikdə çıxırsan

İmam (əleyhis-salam) buyurdu:–Sən gedəndən sonra Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm) mənim yanıma gəlib, buyurdu: Ey Hüseyn, (Məkkədən) çölə çıx, Allah .istəyir ki, səni Öz yolunda şəhid edilmiş görsün

Məhəmməd Hənəfiyyə dedi:–İndi ki, bu məqsədlə gedirsən, onda əhli-əyalı niyə ?özünlə aparırsan

.Həzrət buyurdu:–Allah onları əsir olmuş halda görmək istəyir

.Məhəmməd Hənəfiyyə ağlar halda İmam (əleyhis-salam)-la vidalaşıb qayıtdı

Həmzə ibni Əyən İmam Sadiq (əleyhis-salam)-dan soruşdu: İmam Hüseyn (əleyhis-salam) İraqa tərəf yola düşəndə, hansı səbəbə görə Məhəmməd Hənəfiyyə ondan ?ayrıldı

İmam Sadiq (əleyhis-salam) buyurdu: Mən sənə bir söz deyim, daha bu barədə bir də sual etmə: İmam Hüseyn (əleyhis-salam) İrağa yola düşərkən, bir kağızda belə yazdı: Bismillahir rəhmanir rəhim. Bu məktub Hüseyn ibni Əlidən Haşim övladlarınadır, (bilin ki) həqiqətən hər kəs mənə qoşulsa, şəhid

(olacaq, kim də məndən ayrılsa, nicat tapmayacaq. vəssalam.(١)

İmam (əleyhis-salam) hərəkətə başlamazdan əvvəl, Ümmü-Sələmə (Peyğəmbərin arvadı) onunla görüşüb həzrətə dedi:–Ey Peyğəmbərin nəvəsi, İrağa tərəf yola düşmək barədə qəm-qüssə yemə. Mən sənin cəddin Peyğəmbərdən eşitmişəm ki, buyururdu: Oğlum Hüseyn İraqda, Kərbəla adlı bir yerdə şəhadətə çatacaqdır. Mən şüşədə sənin qətlgahının pak torpağından bir ovuc saxlamışam. Onu Rəsulullah .(səlləllahu əleyhi və alihi və səlləm) mənə vermişdi

İmam Hüseyn (əleyhis-salam) buyurdu:–Mehriban ana! Mən bilirəm ki, öldürüləcəyəm və düşmənlər zülm ilə başımı bədənimdən ayıracaqlar. Allah istəmişdir ki, mənim ailəmi qovulmuş, uşaqlarımı şəhid, ya əsirlik zəncirlərinə giriftar və zülm zəncirləri ilə dartılıb aparılaraq ondan-bundan pənah istəyib heç bir sığınacaq tapmadığı halda .görsün

Ümmü-Sələmə heyrətlə soruşdu:–Əcəb! Öz ölümünü yəqin etdiyin təqdirdə bəs niyə ?İraqa yola düşürsən

İmam (əleyhis-salam) buyurdu:–Anacan! Əgər bu gün getməsəm, sabah getməliyəm; ?sabah getməsəm, gərək birisi gün gedəm. Ölümdən qaçıb qurtarmaq mümkündürmü



---

Kamilüz-ziyarət[١٠۶] -١

Allaha and olsun, mən şəhadətə çatdığım günü, dəqiqəni bilir, dəfn olunduğum yeri görürəm və bu məsələ barədə səni tanıdığım qədər agahlığım vardır. Kərbəla diyarına sənə baxdığım kimi baxıram. Ana, istəyirsənmi özümün və dostlarımın yerini sənə ?göstərim

Ümmü-Sələmə bunları görmək istədiyini bildirdi, İmam (əleyhis-salam) da özünün və dostlarının məzarını ona göstərdi.(١) Sonra öz pak türbətindən bir az götürərək Ümmü-Sələməyə verib buyurdu:–Bunu şüşədə saxla, hər vaxt özünə qan rəngi alıb .qızarsa, bil ki, mən şəhadətə çatmışam

Aşura günü günortadan sonra Ümmü-Sələmə gördü ki, hər iki şüşədəki türbət qana .(dönmüşdür(٢

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM) KUFƏYƏ TƏRƏF HƏRƏKƏT EDİR

İmam (əleyhis-salam) Kufəyə sarı yola düşdü. Səffah mənzilində (yaxud Bəni Amir bostanında) məşhur ərəb şairi Fərəzdəq o Həzrətlə görüşdü. O, özü bu barədə belə deyir: Altmışıncı hicri ilində anamı Həcc üçün Məkkəyə aparmışdım. Hələ karvan yolda ikən İmam Hüseyn (əleyhis-salam)-ı silahlanmış, əllərində qılınc-qalxan, öz dostları ilə Məkkədən çıxan gördüm. Heyrətə gəldim, o Həzrətin hüzuruna gəlib salamdan sonra dedim: Allah işinizi xeyir eləsin, atam-anam sənə fəda olsun, ey



---

.Mədinətül-məaciz, səh ٢۴۴[١٠٧] -١

.Hüseynin möcüzələrzi [١٠٨] -٢

?Rəsulullahın oğlu! Bu qədər tələsməkdə fikriniz nədir

İmam (əleyhis-salam) buyurdu: Əgər Allahın əmin-amanlıq hərəmindən təcili olaraq çıxmasaydım, ələ keçəcəkdim. (Sonra buyurdu:) Fərəzdəq, Kufə əhli barədə nə bilirsən? Dedim:–Hal-hazırda onların qəlbləri sizinlə,qılıncları isə əleyhinizədir. Allahın .hökmü və qəza-qədəri həmişə cərəyan edir, Allah nə istəsə onu da edər

Həzrət buyurdu:–Düz deyirsən, hər şey Allahın əlindədir. Allah hər zaman, hər bir yerdə vardır. Allaha verdiyi nemətlərə görə sitayiş edirik və Ondan nemətlərin şükrünü yerinə yetirmək üçün kömək istəyirik. Onun hökmü bizim ümidimizə uyğun şəkildə cərəyan etsə də, etməsə də, əksinə olsa belə, yenə də bizim məqsədimiz haqqa itaət etməkdir. Bizim məqsəd təqva əsasında qurulduğu üçün həqiqət sərhədlərindən yayınmırıq. Mən İmama (əleyhis-salam) dedim:–Bəli, belədir, İnşallah, Allah sizi öz .istədiyinizə çatdırsın, uzaq gəzdiyiniz şeylərdən hifz etsin

Sonra Həcc əməlləri barəsində bir neçə sual verdim, cavabını verdikdən sonra karvan .öz yoluna davam etdi

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN KUFƏLİLƏRƏ YAZDIĞI MƏKTUB

İmam Hüseyn (əleyhis-salam) Hacər adlı bir yerə çatdığı zaman (ora Zatür-rimmənin bir hissəsidir) oradan Kufə əhalisinə və onların tanınmış şəxsiyyətlərindən sayılan ,Süleyman ibni Surəd Xüzai

Müseyyib ibni Nəcbə, Rəfaət ibni Şəddada məktub yazıb Qeys ibni Müshir Seydavinin vasitəsi ilə Kufəyə göndərdi. (Əlbəttə, hələ Həzrət Müslümün şəhadət xəbəri ona :çatmamışdı), məktubun məzmunu belə idi

.Bismillahir-Rəhmanir-Rəhim

Bu məktub) Hüseyn ibni Əlidən mömin və müsəlman qardaşlara(dır) Salam olsun sizə.) Mən sizin barənizdə misilsiz Allahın dərgahına həmd-səna edirəm. Müslüm ibni Əqilin məktubunu aldım. O məktubda sizin bizə kömək etmək, bizim haqqımızı qaytarmaq yolunda birlik və vəhdətinizin müqdəsini oxudum. Tək Allahdan diləyirəm ki, öz ehsanını bizə tamamlasın və sizə bu gözəl işlər xatirinə böyük əcr versin. Mən zilhiccənin ٨-də çərşənbə axşamı Məkkədən çıxdım. İndi mənim nümayəndəm sizin yanınıza çatan kimi kəmərlərinizi bərkidib, hazırlaşın. Mən, inşallah, yaxın günlərdə .sizlərə qoşulacağam. Allahın salam və rəhməti sizə olsun

## QEYSİN TUTULMASI

Qeys məktubu alıb təcili olaraq Kufəyə yola düşdü. Digər tərəfdən də İbni Ziyad İmam Hüseyn (əleyhis-salam)-ın Məkkədən çıxmasından xəbər tutduğu üçün ordusunun baş sərkərdəsi Hüseyn ibni Nümeyri İmam (əleyhis-salam)-ın karvanı ilə qarşılaşmaq üçün göndərdi. O, öz böyük ordusu ilə Qadisiyyəyə gəlirdi ki, Qadisiyyəni, Həffanı, Qatəqtanəni, Lolonu nəzarət altına alsın. Qeys Qadisiyyəyə çatanda Hüseyn ibni Nümeyr onu tutub yoxlanmasını, əmr etdi. Qeys də dərhal məktubu

çıxartdı və cırıb yerə tökdü. Hüseyn də onu Übeydullahın yanına göndərdi. Übeydullah ?ondan soruşdu:–Sən kimsən

Qeys:–Mən Əmirəl-möminin Əliyyibni Əbitalibin və onun oğlu Hüseyn ibni Əlinin .şiələrindənəm

?Übeydullah:–Nə üçün məktubu cırdın

.Qeys:–Cırdım ki, sən onun məzmunundan agah olmayasan

?Übeydullah:–Məktubu kim və kimə yazmışdı

Qeys dedi:–Bu məktubu Həzrət İmam Hüseyn (əleyhis-salam) Kufə camaatının bir .qrupuna yazmışdı. Mən də onların adlarını bilmirəm

İbni Ziyad qəzəblə onu hədələyib dedi:–Allaha and olsun, onların adlarını mənə deməmiş, yaxud minbərə çıxıb Hüseyn ibni Əlini və ata-anasını aşkar şəkildə söyməyincə əlimdən qurtarmayacaqsan. Bu işi görməsən səni tikə-tikə .doğrayacağam

.Qeys dedi:–Onların adı barəsində bir şey gözləmə, amma, ikinci işə hazıram

Qeys minbərə çıxdı, Qadir və Mütəal Allahın dərgahına həmd-səna etdikdən, Peyğəmbərə salavat göndərəndən sonra haqq İmamı-Həzrət Hüseyn ibni Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam) onun anasını və qardaşını ehtiramla yad .etdi; Übeydullahı, onun anasını və bütün Əməvi cəlladlarını lənətlədi

Qeys dedi:–Ey camaat, Bu Hüseyn ibni Əli–Allahın yaratdıqlarının ən üstünü, Rəsulullahın (səlləllahu əleyhi və alihi və səlləm) qızının oğludur. Mən də onun nümayəndəsiyəm. O, hal-hazırda Hacər məntəqəsində mənzil salmışdır. Siz ona .qoşulun, çağırışına ləbbeyk deyin

Aldandığını görən İbni Ziyadın qaniçənlik xisləti cuşa gəldi, dərhal əmr etdi ki, Qeysi «qəsrin üstündən aşağı tullasınlar

Bəli, qəhrəman Qeys haqq rəhbəri İmam Hüseyn (əleyhis-salam)-ın tərəfdarı olmaq günahı ilə canilərin əli ilə şəhadətə yetişdi. Onun şəhadət xəbəri İmam Hüseynə(əleyhis-salam) çatanda yaşını saxlaya bilmədi, bu ayəni oxudu:

Onlardan biz qismi öz əhdlərinə vəfa etdilər, bəziləri də öz əhdlərinə vəfa etmək intizarındadırlar. Və heç vaxt öz əhdlərini dəyişməyi rəva görməzlər(۱)

Sonra buyurdu:–Allah behişti ona nəsib etsin; İlahi, özün bizə və şiələrimizə yüksək məqam ver, bizi onlarla birlikdə öz rəhmət dərgahında bir yerdə qərar ver! Öz bol mükafatlarını bizə nazil et, Sən hər şeyə qadirsən.

Übeydullah var-qüvvəsi ilə yolları bağlamışdı. Kufəni Şam, İran, Bəsrə ilə əlaqələndirən yolları bərkitdi. Belə ki, heç kəs Kufədən çıxmağa, yaxud ora gəlməyə cürət etmirdi. Buna görə də İmam (əleyhis-salam)-a Kufənin daxilində baş verən hadisələrdən heç bir xəbər yetişmirdi.

Həzrət məntəqələrdən bir-birinin ardınca ötürdü. Bir məntəqədə bədəvi ərəblərlə rastlaşdı, onlardan bəzi şeylər haqqında xəbər alırdı. Onlar cavab



---

۱- [۱۰۹] Əhzab surəsi, ۲۳

verdilər ki, biz heç nə bilmirik, yalnız bunu bilirik ki, yollar bağlanıb, gediş-gəliş qeyri-mümkündür.

İmam (əleyhis-salam) bu xəbəri eşidəndən sonra öz yoluna davam etdi. Bu hadisədən sonra o Həzrət Züheyr ibni Qinlə rastlaşdı, onu özünə qoşulmağa dəvət etdi. Nəticədə, Züheyr İmam Hüseyn (əleyhis-salam)-ın qoşununa qoşuldu. Karvan yenə də hərəkət edib Xüzəymiyyə adlı yerə çatdı. Orada bir gecə-gündüz qalıb yenidən hərəkət edərək Sələbiyyəyə qədər yol gedib orada mənzil saldılar. Gecə ötüb keçdi, sübh çağı kufəlilərdən Əbu Həyyərə Əzdi adlı birisi İmam (əleyhis-salam)-ın hüzuruna gəlib soruşdu:–Ey Rəsulullahın oğlu, siz hansı səbəbə görə Allahın əmin-amanlıq hərəmini (Kəbəni) və cəddiniz Rəsulullahın hərəmini tərk etdiniz?

İmam (əleyhis-salam) cavabında belə buyurdu:–Ey Əbu Həyyərə! Bəni-Üməyyə malımızı çapıb-talan etdikdə səbr etdim; heysiyyətimə toxundular, səbr etdim. İndi də istəyirdilər qanımı axıtsınlar, qaçıb gəldim. Allaha and olsun, məni zülmkarlar öldürəcəklər. Allah da onlara xarlıq, zillət paltarı geyindirəcək. İti qılıncları onlara hakim edəcək. Elə bir adamı hakim edəcək ki, onları Səba Tayfasından da zəlil edəcək. (Səba Tayfasına bir arvad hökmranlıq edirdi, onların mal-dövlətlərinə, qanlarına fərman verirdi.)

## HƏZRƏT MÜSLÜMÜN VƏ HANİNİN ŞƏHADƏT XƏBƏRİ

Hər ikisi Bəni Əsəd qəbiləsindən olan Əbdullah ibni Səlim, Münzər ibni Müşməl deyirlər: Biz Həcc

mərasimi bitdikdən sonra sürətlə İrağa doğru hərəkət etdik, məqsədimiz yalnız İmam (əleyhis-salam)-ın karvanına qoşulmaq idi. Öz dəvələrimiz ilə gəlib Sələbiyyənin .yaxınlığındakı Zərud məntəqəsində İmam (əleyhis-salam)-ın karvanına çatdıq

Hələ İmam (əleyhis-salam)-ın çadırlarına çatmamışdıq ki, kufəli bir kişi gördük. O, İmamla üzləşməsin deyə səhra ilə hərəkət edirdi. Əgər İmam (əleyhis-salam) onun Kufə istiqamətindən gəldiyini hiss etsəydi, ondan bəzi şeylər soruşacaqdı. (O iki nəfər deyir:) Biz öz-özümüzə dedik ki, yaxşı olar onun yanına gedib Kufənin daxili vəziyyəti barədə maraqlanaq. Bu niyyətlə ona tərəf getdik, soruşduq:–Kufədə nə kimi xəbərlər ?var

Dedi:–Mən Kufədən gələndə öz gözlərimlə gördüm ki, Müslüm və Hani öldürülmüşdür, onların cəsədlərini küçə və bazarlarda yerlə sürüyürdülər. Bu sual-cavabdan sonra biz İmam Hüseyn (əleyhis-salam)-ın hüzuruna gəldik. Axşam düşdü. Karvan Sələbiyyədə .mənzil saldı

İmam (əleyhis-salam)-ın yanına gedib dedik:–Allah sizə rəhmət göndərsin. Biz bir xəbər eşitmişik, xəlvət istəyirsənsə, xəlvətdə deyək, aşkar istəyirsənsə, aşkarda .deyək

.Həzrət öz dostlarına baxıb dedi:–Mən bunlardan heç nəyi gizlətməmişəm

?Biz dedik:–Dünən gecə o kişini gördünüzmü

.Buyurdu:–Bəli, istəyirdim ondan bəzi xəbərlər soruşam

Dedik:–O kişi ağıllı, düzgün fikirli və düzdanışandır. O bizə xəbər verdi ki, Kufədə olanda Müslümün və Haninin öldürülməsini görmüşdür. Öz gözləri ilə bu iki şəhidin pak .cəsədlərini Kufə bazarlarında yerlə sürüdüklərinin şahidi olub

Sonra biz İmama (əleyhis-salam) xitabən dedik:–Sizi öz canınıza və ailənizin canına and veririk ki, geri qayıdasınız; Yəqin bilin ki, Kufədə heç kim sizə kömək etməyəcək. .Hətta gözlənilir ki, kufəlilər sizin əleyhinizə qiyam etməkdən belə çəkinməsinlər

İmam (əleyhis-salam) Əqilin oğlanlarına baxıb soruşdu:–Siz nə deyirsiniz? Qardaşınız .Müslüm şəhadətə çatıbdır

Hamısı bir ağızdan dedilər:–Allaha and olsun ki, biz qardaşımızın intiqamını almayınca .və bu yolda şəhid olmayınca geri dönməyəcəyik

Sonra Həzrət üzünü bizə tutub buyurdu:–Bu əzizlərin şəhadətindən sonra yaşamağın .heç bir mənası yoxdur

Biz başa düşdük ki, Həzrət getməyi qərara almışdır. Onlar üçün dua etdik, İmam (əleyhis-salam) da bizi dua etdilər. Həzrət gecəni Sələbiyyədə qaldı. Həzrət Müslümün matəmində göz yaşı axıtdılar. Sübh açılanda cavan yoldaşlarına əmr etdi ki,çox su .götürsünlər

Onlar da əmrə itaət edib çox su götürdülər. Sonra hərəkət edib Zubalənin evinə yetişdilər. Bu məntəqəyə çatdıqda Qeys ibni Müshərin(١) şəhadət xəbərini aldılar. Bu xəbər İmama (əleyhis-salam) çatanda hamının bir yerə yığılmasını əmr etdi. Hamı bir yerə yığıldıqdan sonra buyurdu: -Mən Müslüm ibni Əqilin, Hani ibni Ürvənin və Qeysin şəhadət



---

.Bəzi tarixlərdə Əbdüllah ibni Yəstər kimi qeyd olunub[١١٠]-١

xəbərlərini almışam. Şiələrimiz Kufədə bizə kömək etmək fikrindən dönüblər. İndi, hər .kəs istəyirsə qayıda bilər və kimsə bu işdə məzəmmət olunmayacaq

Bu, İmam Hüseyn (əleyhis-salam)-ın hərəkatında dönüş nöqtəsi sayılır. Hamıya qabaqkı günlərin necə olacağı aşkar oldu və başa düşdülər ki, bu karvanın axırı hara .gedib çıxacaq

Məkkədə, yaxud yol boyu bu karvana qoşulanlar, əksəriyyəti də qənimət toplamaq fikrində olanlar dağılışdılar, İmam (əleyhis-salam) ilə azsaylı, sədaqətli dostları qaldı. O Həzrət bilirdi ki, karvanda olan camaatın çoxu öz qarınlarını doyurmaq, dünya arzularına çatmaq məqsədi ilə bu karvana qoşulmuşdur. Çünki, onlar eşitmişdilər ki, İmam (əleyhis-salam) Kufəyə gedir, və Kufə əhalisi də ona çox hörmət bəsləyib .qədəmlərini mübarək sayırlar

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN HÜRR İLƏ QARŞILAŞMASI

İmam yol boyunca Kəraf adlı bir yerə çatıb elə orada da gecələdi. Sübh İmam (əleyhis-salam)-ın göstərişi ilə çoxlu su götürüb hərəkət etdilər. Günortaya yaxın o Həzrətin köməkçilərindən biri gözlənilmədən təkbir dedi. İmam (əleyhis-salam) da təkbir deyib soruşdu:–Nə gördün ki, təkbir dedin? –Gözüm xurma ağaclarına düşdü. İmamın başqa yoldaşları da dedilər:–Allaha and olsun, biz bu diyarda heç vaxt xurma ağacı .görməmişdik. İmam (əleyhis-salam) buyurdu:–Elə isə yaxşı-yaxşı baxın, görün nədir

Bir az da diqqətlə baxdıqdan sonra dedilər:–Allaha and olsun, o qaraltılar nizələrin ucu, .atların başlarından başqa bir şey deyildir

.İmam (əleyhis-salam) buyurdu:–Vallah, elə mən də onları görürəm

Beləliklə də əməvi ordusu görünməyə başladı. Onlar min nəfər atlıdan ibarət bir qoşun olub, başçıları da Hürr ibni Yəzid Riyahi idi, İmam Hüseyn (əleyhis-salam)-ın karvanı ilə .qarşılaşmaq üçün Kufədən gəlirdilər

Kufə ordusu elə ki, İmam Hüseyn (əleyhis-salam)-ın dayandığı yerə çatdı, qızmar günün altındaca o Həzrətin qarşısında atdan yerə endilər. İmam (əleyhis-salam) və onun köməkçiləri qılınclarını siyirib qoşunun qarşısında özlərinə mövqe tutdular. İmam əvvəlcə əmr etdi ki, o səhranın ən yaxşı töhfəsi olan su ilə düşmən tərəfin döyüşçü və .atlarını suvarsınlar

İmamın karvanında olan fədakar cavanlar dərhal su qablarını doldurub atların yanına .apardılar və bütün atlara su verdilər

Sonra İmam (əleyhis-salam) üzünü Hürrə tutub dedi:–Sən bizi müdafiə etmək niyyəti ?ilə bura gəlmisən, yoxsa bizimlə qarşılaşmaq məqsədin var

.Hürr dedi:–Məqsədimiz sizinlə vuruşmaqdır

İmam (əleyhis-salam) buyurdu

ÕÓË‰Ó†ËÓ†‰«†‚ÔËÒÓ:Ó†≈·†»«†«‰ÚŸÓ‰ÍÒ†«‰ÚŸÿÍÂ†»‰

## İMAM (ƏLEYHİS–SALAM)–IN HÜRRÜN QOŞUNU QARŞISINDAKI XÜTBƏSİ

Günorta yaxınlaşdı. İmam Hüseyn (əleyhis-salam) Həccac ibni Məsruqa dedi ki, iki ordunun arasında dayanıb azan desin. Azandan sonra Həzrət iki qoşunun arasında :dayanıb xütbəyə başladı. Əvvəlcə Allaha həmd-səna etdi, sonra buyurdu

Ey camaat, Kufəyə doğru hərəkət etməyimin səbəbini sizə demək istəyirəm ki, bununla da Allah dərgahında üzrlü, sizə isə höccəti tamam etmiş olam. Mənim Kufəyə doğru hərəkətim yalnız sizin məktublarınız və nümayəndələriniz gələndən sonra

olmuşdur. Sizin nümayəndələr brəhbərlərinin olmamasını söyləyib sən gəl bizə rəhbər olmağı qəbul et ki, Allah sənin rəhbərliyin sayəsində bizi haqqa, düzlüyə çıxartsın. dedilər, mən də gəldim. Əgər siz elə həmin əqidədə qalıb mənə kömək etməyə əhd bağlayırsınızsa, bu halda sizin şəhərinizə gələrəm; yox əgər əhd bağlamırsınızsa və mənim gəlməyimdən narahasınızsa, elə buradan da qayıdaram. Hürr və onun ordusu İmama (əleyhis-salam) cavab verməyib susdular. Sonra müəzzin İmam (əleyhis-salam)-ın əmri ilə iqaməni dedi. Həzrət Hürrə dedi:–Öz dostlarınla birlikdə namaz ?qılmaq istəyirsən

.Hürr dedi:–Yox, hamımız sənə iqtida edəcəyik

Namazdan sonra İmam (əleyhis-salam) öz yerinə, Hürr də öz düşərgə saldığı yerə qayıtdı və onun üçün hazırlanmış xeymədə bəzi səhabələri ilə istirahət etməyə başladı, amma əsgərlər döyüşə hazırlı vəziyyətdə qaldılar, Hər kəs öz atının cilovundan yapışıb atın kölgəsində oturdu. Elə ki, əsr oldu, müəzzin əsr azanını verdi. İmam (əleyhis-salam) namaz qıldı, hər iki qoşun ona iqtida etdi, namaz

:qurtarandan sonra İmam (əleyhis-salam) yenidən ayağa qalxıb belə bir xütbə söylədi

Ey camaat! Əgər ilahi əzabdan uzaq olsanız, haqqı və haqq əhlini tanısanız, Allah– sizdən daha çox razı olar. Biz Peyğəmbər Əhli-Beyti sizə rəhbərlik etməyə yalandan rəhbərlik iddiası edənlərdən daha çox ləyaqətliyik. Bunlar (Yezid və onun adamları) nahaqdan İsla hökumətinin iddiaçıları olmuşlar. İndi əgər siz bizim gəlişimizdən narazı olub öz nadanlığınız üstündə durmuşsunuzsa, onda heç eybi yoxdur, mən elə buradan .qayıdaram

Hürr dedi:–Allaha and olsun, mənim nə bu məktublardan xəbərim var, nə də .göndərilən nümayəndələrdən

İmam Hüseyn (əleyhis-salam) Əqəbət ibni Səmana buyurdu ki, kufəlilərin yazdıqları .məktubları Hürrün qabağına töksün

Hürr dedi:–Biz məktub yazanlardan deyilik, bizə əmr olunub ki, sizi Əli Übeydullahın .yanına aparaq

Həzrət qəzəblənib dedi:–Sənin ölümün başında olan fikirlərin həyata keçməsindən !daha yaxındır

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM) İLƏ HÜRR ARASINDAKI SÖHBƏT

Bu sözdən sonra İmam (əleyhis-salam) əmr etdi ki, hərəkət etsinlər. Səhabələr dərhal dəvələri yüklədilər, arvad-uşaqları dəvələrə mindirib Hicaza tərəf hərəkət etmək üçün hazır oldular. Lakin Hürrün ordusu yolu kəsdi, karvanın geri qayıtmasına icazə .vermədi

?İmam (əleyhis-salam) dedi:–Ey Hürr! Anan matəmində otursun, bizdən nə istəyirsən

Hürr dedi:-Sizdən qeyrisi mənim anamın adını çəksəydi, cavabını elə olduğu kimi .qaytarardım. Amma Sizin ananız barədə ehtiramdan başqa bir söz söyləyə bilmərəm

Bu sözdən sonra aralarındakı söhypbət davam etdi. İmam (əleyhis-salam) soruşdu:- ?Məqsədin nədir

Dedi:–Səni Əli Übeydullahın yanına aparmaq istəyirəm. İmam (əleyhis-salam) .buyurdu:–Mən dediklərinə əməl etməyəcəyəm

.Hürr dedi:–Allaha and olsun, mən də sizdən əl çəkməyəcəyəm

Bu söhbət üç dəfə təkrar oldu, nəhayət Hürr dedi:–Mənə sizinlə vuruşmaq əmr olunmamışdır. İşim yalnız budur ki, Kufəyə çatana kimi sizdən ayrılmayam. İndi ki, Kufəyə getməkdən imtina edirsiniz, təklif edirəm elə yollarla hərəkət edin ki, nə Kufəyə gedib çıxsın, nə də sizi Mədinəyə aparsın. Mən də əmirə bir məktub yazım və ondan göstəriş alım. İnşallah Allah elə bir şərait yaratsın ki, sizinlə vuruşmayım. İndi .isə siz sol tərəfə dönüb Qadisiyyə–Əzib səmtində hərəkət edin

İmam Hüseyn (əleyhis-salam) bu təklifi qəbul etdi, Hürr də o Həzrətin qoşunu ilə .birlikdə hərəkət etməyə başladı

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–ıN HÜRRƏ BUYURDUĞU SÖZLƏR

:Yolda İmam Hüseyn (əleyhis-salam) Hürrə buyurdu

Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm) buyurmuşdur ki, hər kəs Allahın haramlarını halal

edən, ilahi əhd-peymanı pozan, Peyğəmbərin sünnəti ilə müxalifət edən, əməlinin əsası günah, düşmənçilik olan zülmkar bir hakimi görüb əməldə, yaxud sözdə onunla müxalifətə qalxmazsa, Allah onu həmin zülmkarın aparıldığı yerə aparar. Bu camaat Rəhman Allaha itaət etməkdən boyun qaçırır, şeytana itaət edir, aşkar şəkildə fəsad törədirlər. İlahi qanunları, hüdudları kənara qoymuş, beytül-malı qarət etmişlər; Allahın haram buyurduğunu halal, halal buyurduğunu isə haram etmişlər. Bəli, mən İslam ümmətinə rəhbərlik etmək üçün daha layiqəm. Sizin tərəfinizdən çoxlu nümayəndə və məktublar gəlmişdir ki, onların hamısı yekdilliklə mənimlə birgə olmağa .vəd vermişlər. İndi əgər siz əhdinizə vəfa etsəniz, bəhrənizi aparacaqsınız

Mən Əlinin oğlu, Peyğəmbərin nəvəsi Hüseynəm. Özüm sizlərlə, övladlarım, əhli-əyalım isə sizin ailələrinizlə bir yerdə olacaqlar. Davranışım da hamı üçün nümunə və .ülgüdür

Əgər öz əhdinizi pozsanız, mənə kömək etməkdən boyun qaçırsanız, öz canıma and içirəm ki, heç də qəribə iş görmüş olmazsınız; çünki atam, qardaşım və əmioğlum Müslüm ibni Əqilə qarşı da rəftarınız elə bu cür olmuşdur. Aldanan şəxs odur ki, sizə ürək bağlayaraq məftun olmuşdur. Nəticədə isə istədiyiniz nəticəyə çatmamış öz nəsiblərinizi puç etmisiniz. Bəli, hər kəs əhdini sındırsa, özünə cəfa etmişdir. Allah heç .vaxt bizi sizə möhtac etməz. Vəssalam

Kufə ordusunun sərkərdəsi Hürr ibni Yəzid Riyahi İmam Hüseynə (əleyhis-salam) kobud surətdə belə dedi:–Ey Hüseyn ibni Əli, səni Allaha and verirəm ki, özünə rəhm .edəsən. Bir daha xatırladıram ki, əgər döyüşə başlasan, özün həlak olacaqsan

İmam (əleyhis-salam) ona buyurdu:–Məni ölümlə hədələyirsən? Yəni həddini bu qədər aşmısan ki, məni qətlə yetirəsən? Mənim sənə verəcəyim cavab elə həmin cavabdır ki, Rəsulullahın dostlarından biri öz əmioğlusuna demişdi. O, Peyğəmbərə kömək etmək istəyirdi, əmioğlusu isə onu öldürməklə hədələyirdi. O, işi belə gördükdə aşağıdakı şeri .oxudu: Tezliklə gedəcəyəm və ölümü ağuşa almaqdan heç bir qorxum yoxdur

Çünki, əgər mərd adam haqqı axtarmağa və İslam yolunda cihad etməyə məşğul olsa, heç vaxt öldürülməkdən qorxmaz. Mən öz canımı fəda edirəm, onun qalmasını da istəmirəm. Çox keçməz ki döyüş meydanında öz ordumla birlikdə döyüşə girişəcəyəm. Əgər sağ qalsam, peşiman olmaram, yox əgər öldürülsəm, ürəyimdə heç bir həsrətim qalmaz, halbuki sən həmişə xarlıq hiss edirsən, Allah yolunda fədakarlıq etmədiyinə .görə peşmansan

İmam Hüseyn (əleyhis-salam)-ın qəti mövqe seçdiyini görən Hürr daha heç nə .deməyib Həzrətdən bir az aralı, karvanın yanınca yoluna davam etdi

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN GÖRDÜYÜ YUXU

Karvan bu minvalla irəliləyərək Bəni Müqatil qəsrinə gəlib çatdı. Orada düşərgə saldılar. Gecə yarısı İmam (əleyhis-salam) cavanlara buyurdu ki, tez su götürsünlər, .sonra elə gecə ikən oranı tərk etdilər

Əqəbət ibni Səman deyir İmam (əleyhis-salam) Bəni Müqatil qəsrində sübh çağı bizə əmr etdi ki, su götürək. Daha sonra yolumuza davam etdik. Çox

getməmişdik ki, Həzrət elə at üstündə azacıq yuxuya daldı. Yuxudan ayılandan sonra

.Biz Allahdanıq və ona tərəfdə qayıdacağıq

.dedi və bunu üç dəfə təkrar etdi

Oğlu Əli Əkbər özünü ona çatdırıb dedi:–Sənə qurban olum, bu ayəni oxuyub Allaha ?şükr etməyinin səbəbi nə idi

İmam Hüseyn (əleyhis-salam) buyurdu:–Qısa müddətli yuxuya daldım. Yuxuda bir atlını gördüm. O, mənim yolumu kəsib dedi: Bunlar gedir və öz arxalarınca ölümü də .aparırlar Başa düşdüm ki, sağ qalmaq üçün daha heç bir ümid yoxdur

?Əli Əkbər dedi:–Ata, məgər biz haqq deyilikmi

İmam (əleyhis-salam) buyurdu:–Bəli, and olsun Allaha, bəndələrin ona tərəf qayıtdığı !Allaha

.Əli Əkbər dedi:–Bir halda ki, haqq bizimlədir, ölümdən qorxumuz yoxdur

Həzrət buyurdu:–Allah-taala bir atanın öz oğluna verdiyi ən yaxşı mükafatı sənə (versin.(١

.Karvan hərəkət edərək Neynəva çölünə çatdı

### ÜBEYDULLAHIN QASİDİ HÜRRÜN YANINDA

Bu zaman Kufə tərəfdən kamanını çiyninə atmış qaçaraq gələn bir atlı göründü. O, Malik ibni Nəsr



---

.Təkbir yəni, Allah-u Əkbər şüarı vermək[١١١] -١

Kindi idi. Hər iki qoşun bu süvarini gözlədilər. O yaxınlaşdıqda Hürrə və tərəfdarlarına salam verdi, amma İmam (əleyhis-salam)-a isə salam vermədi. Dərhal bir məktub çıxarıb Hürrə verdi. Bu məktub Übeydullah tərəfindən yazılmışdı. Hürr məktubu açıb :oxudu

Hüseynin işini müşkülə sal. Mənim məktubum sənə çatan kimi, onu susuz bir səhrada saxla. Mən göndərdiyim qasidə tapşırmışam ki, səndən ayrılmayıb gördüyün işlər .barədə mənə xəbər versin

Hürr İmam (əleyhis-salam)-ın yanına gedib dedi:–Gərək elə burada atlardan .düşəsiniz, daha getməyə icazə vermirəm

?İmam (əleyhis-salam) buyurdu:–Məgər sən bizə demədinmi ki, dolayısı yolla gedin

Hürr dedi:–Bəli, dedim. Amma Übeydullahdan məktub almışam. Mənə sənin işini çətinləşdirməyi əmr etmişdir. Bu işə nəzarət üçün bir nəfəri də (qasid) təyin etmişdir. .Qasid mənim gördüyüm işləri İbni Ziyada xəbər verəcəkdir

İmam (əleyhis-salam) buyurdu:–İcazə ver, bu yaxın kəndlərin birində enək. Amma Hürr bildirdi ki, mən əmirin fərmanından çıxa bilmərəm. Çünki, o mənim üstümdə .nəzarətçi qoymuşdur

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN XÜTBƏSİ

Bu hadisədən sonra İmam (əleyhis-salam) öz silahdaşları üçün bir xütbə oxuyub Allaha həmd və səna etdikdən sonra buyurdu: Görürsünüz ki, bizim işimiz hara ,çatmışdır. Dünya bizdən üz döndərmiş

onun yaxşılıqları bizə arxa çevirərək hələ də bizdən uzaqlaşmaqdadır. Həyat sona .çatmış, sonuna bir şey qalmamışdır

Görmürsünüzmü camaat haqdan üz çevirərək batilin dövrəsinə yığılmışlar. Allaha, qiyamət gününə imanı olan hər bir şəxs dünyadan üz çevirməyi, öz Allahının görüşünü arzulamalıdır. Mən haqq yolda ölməyi səadət, zülmkarlar və azğınlarla birgə yaşamağı .isə zillət və baladan başqa bir şey bilmirəm

Söz buraya yetişəndə Züheyr ayağa qalxıb dedi:–Yəbnə Rəsulillah, sözlərini eşitdik. Bizim mövqeyimiz belədir: sənin yanında qalaraq qiyam edib şəhid olmağı dünyada .əbədi qalmaqdan daha üstün sanırıq

Sonra Büreyr ibni Xüzeyr dedi:–Yəbnə Rəsulillah, Allah bizə minnət qoymuşdur ki, hazırda sənin tərəfindəyik və sənin gözünün önündə cihad edirik. Ümidvarıq ki, bədənlərimiz sənin yolunda tikə-tikə olsun, təki qiyamətdə əziz cəddin bizə şəfaət .etsin

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN KƏRBƏLAYA DAXİL OLMASI

İmam Hüseyn (əleyhis-salam) cümə axşamı, məhərrəm ayının ٢-də Kərbəlaya daxil ?olub buyurdu:–Bu yerin adı nədir

Ona Buranın adı Kərbəladır. dedilər. Həzrət buyurdu:–İlahi, Sənə kərb və baladan pənah səh:١٨٧

aparıram. Bu yer kərb və bəla (qəm-qüssə və bəla) diyarıdır. Atlardan düşün, bura bizim qanlarımızın axan yeridir. Cəddim Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm) .bu xəbəri mənə vermişdir

Hamısı atdan yerə düşdülər, Hürr də öz qoşunu ilə onlardan aralı bir yerdə düşərgə .saldı

İmam (əleyhis-salam) öz övladlarını, qardaşlarını və ailəsini bir yerə yığdı, onlara baxıb belə buyurdu:–Camaat dünya quludur, din isə sadəcə dillərində gəzir. Nə qədər ki, ruziləri hazırdır, din ilə məşğuldurlar. Amma elə ki, imtahan olundular, dindarların sayı .çox az olur

## ÜBEYDULLAHIN İMAM HÜSEYN (ƏLEYHİS-SALAM)–A TƏKLİFİ

Kufə əmirinin fərmanını gözəl və lazımi şəkildə icra edən Hürr Übeydullaha bir məktub yazıb macəranı ona xəbər verdi. Übeydullah da İmam Hüseyn (əleyhis-salam)-a bir :məktub yazıb göndərdi. Onun məzunu belə idi

Sənin Kərbəlaya gəlişindən xəbərim var. Müsəlmanların hökmdarı (yəni Yəzid) mənə əmr etmişdir ki, səni qətlə yetirməyincə, yaxud mənim və Yezidin əmrinə tabe olmayınca yatağa baş qoymayam, şərabdan doymayam. Vəssalam

İmam Hüseyn (əleyhis-salam) məktubu oxuyandan sonra qəzəblənib onu yerə tullayaraq belə buyurdu:–Məxluqun razılığını xaliqin qəzəbindan üstün sayan millət heç vaxt nicat tapmaz. İbni Ziyadın nümayəndəsi İmama (əleyhis-salam) ərz etdi:–Bu ?məktuba yazacağınız cavab nədir

İmam (əleyhis-salam) buyurdu:–Mənim bu məktuba heç bir cavabım yoxdur. Qasid .Kufəyə qayıdıb hadisəni olduğu kimi ibni Ziyada çatdırdı

İbni Ziyad qəzəblənib böyük bir qoşun yığdı və camaatı məscidə çağırıb onların qarşısında çıxış edərək sözlərində Yezidi, Müaviyəni tərifləyib bu iki şəxsin yaxşılığından, gözəl keçmişindən (!) söz açdı. Xalqa maddi yardım etmək vədəsi verərək hamının maaşını ikiqat artıracağını bildirdi və əmr etdi ki, İmam Hüseynlə .(əleyhis-salam) vuruşa getmək üçün hazırlaşsınlar

## ÜBEYDULLAHIN ÖMƏR SƏDƏ TƏKLİFİ

İbni Ziyad İmam Hüseyn (əleyhis-salam) kimi bir şəxs ilə döyüşmək üçün elə bir qoşun sərkərdəsi axtarırdı ki, avam xalq kütlələri içərisində hörmət və izzət sahibi olsun. Ömər Səd tülkü simalı bir şəxs idi ki, atası Səd İranın fatehi idi. Buna görə də .Übeydullah Ömər Sədi çağırıb qoşuna sərkərdəlik etməyi ona tapşırdı

Ömər Səd əvvəllər ۴ min nəfərdən ibarət qoşuna sərkərdəlik edərək İrana ezam olmunmuşdu. Rey vilayətinin hökmranlıq hökmü ona verilmişdi. Ömər Səd tərəddüddə qalaraq nə edəcəyini bilmirdi. O, Übeydullahın yanına gəlib Kərbəlaya getməkdən boyun qaçırmaq istədi. Übeydullah onun cavabında dedi:–Eybi yoxdur, amma o zaman sənin üçün Rey mülkünün hakimiyyətindən əsər-əlamət belə qalmayacaq. Ömər Səd tərəddüd içində qalıb möhlət istədi. Ətrafındakılar ona nəsihət edərək belə bir cinayəti ,törətməkdən çəkindirmək istədilər. O

Kərbəlada əməvi qoşunlarına sərkərdəlik etmək təklifini eşitdiyi gecə bu şeri :zümzümə edirdi

Allaha and olsun, bilmirəm nə edim; öz işim üçün fikirləşirəm ki, iki yol ayrıcında sərgərdan qalmışam. Rey mülkünə hakimiyyəti buraxımmı? halbuki, ona ürəkdən bağlanmışam; yoxsa Hüseyn ibni Əli ilə döyüşə qalxıb əbədi olaraq məzəmmətlə ?qınanım

Əgər Hüseyn ibni Əlini qətlə yetirsəm, cəhənnəm odunu özümə hazırlamış olaram. (Amma nə edim ki, Rey mülkünə hakim olmaq bütün arzu və ümidlərimdir!(١)

**İBNİ SƏDİN KEÇMİŞİ**

:Günlərin birində Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam) minbərdə buyurdu

Məni əldən verməmiş hər nə istəyirsinizsə məndən soruşun. Allaha and olsun, keçmişdə baş vermiş, gələcəkdə baş verəcək hər şeydən sizə xəbər verərəm. Elə şey .yoxdur ki, ondan sizə xəbər verə bilməyim

Bu vaxt Səd yerindən qalxıb dedi:–Ey Əmirəl-Möminin! Xəbər ver görüm mənim üz və ?başımda nə qədər tük var

İmam (əleyhis-salam) buyurdu:–Sənin soruşduğun məsələni Rəsuli-Əkrəm mənə xəbər verib buyurmuşdur ki, sən bu sualı məndən soruşacaqsan. Bil ki, sənin baş və üzündə elə bir tük yoxdur ki, onun dibində bir şeytan oturmamış olsun. Eləcə də



---

Kamil ibni Əsir, c. ۴ səh.۲۲[۱۱۲]-۱

.sənin evində südəmər bir uşaq vardır ki, oğlum Hüseyni qətlə yetirəcəkdir

(O vaxt Ömər ibni Səd balaca bir uşaq idi.(١)

Sədin İmam (əleyhis-salam)-dan soruşduğu sual həqiqəti öyrənmək üçün deyil, yalnız məsxərə üçün idi; Qəlblərin sirr və niyyətinə agah olan Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam) bilirdi ki, Sədin başında nə kimi planlar var. Məhz buna görə Həzrət elə bir cavab verdi ki, bu alçaq və yaramaz kişi camaat içində xar olub alnına əbədi olaraq rüsvayçılıq damğası vuruldu. Xüsusilə, Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam) bu sözləri Rəsulullahın mübarək dilindən .nəql etmişdi

Beləliklə, belə bir alçaq və rəzil bir ünsürdən Ömər Səd kimi birisinin törənməsi heç də .təəccüb doğurmur

O, özündən çoxlu yaramaz sifətlər büruzə vermiş, haqq ilə müxalifət edərək batilə kömək etmiş, vəhy ailəsi qarşısında böyük bir qoşun yaratmış və s. kimi müxtəlif çirkin, .alçaq işlərə əl atmışdır

Bəli, təkcə Səd Rəsulullahın məzlum canişininə məsxərə etmirdi; onun oğlu Ömər də behişt cavanlarının sərvəri İmam Hüseyn (əleyhissalam)-a Kərbəla səhrasında istehza .edirdi

Döyüş şiddətlənməzdən qabaq İmam Hüseyn (əleyhis-salam) Ömər Sədə xitab edib buyurdu:–Ey Ömər, mənimlə vuruşursan? Allahdan, qorxmursan? Sən ki bilirsən, mən kimin oğluyam. Elə isə gəl bu qoşunu burax, mənə qoşul. O zaman Allaha daha yaxın .olarsan



---

Kamilüz-ziyarət, səh.٧۴[١١٣] -١

Ömər Səd İmam Hüseyn (əleyhis-salam)-ın qarşısında bəhanə gətirməyə başlayıb, elə sözlər danışdı ki, Allah onun gətirdiyi üzrlərdən razı deyildi. O dedi:–Qorxuram evim .viran ola. İmam (əleyhis-salam) buyurdu:–Mən sənin evini yenidən quraram

.O dedi:–Qorxuram əmlakım, bağ-bostanım tarac ola

İmam (əleyhis-salam) buyurdu:–Mən bunların əvəzində Hicazdakı mal-dövlətimdən sənə bağışlaram, Bəğm-bəğə məntəqəsini sənə verərəm. (Orada böyük bir çeşmə var idi ki, geniş əraziyə məxsus xurmalıqları, əkin sahələrini əhatə edirdi). İbni Sədin .üçüncü bəhanəsi isə bu oldu:–Qorxuram ibni Ziyad övladlarımı qətlə yetirsin

Elə ki, İmam Hüseyn (əleyhis-salam) bu aldanmış adamdan məyus oldu, ona müraciət edərək buyurdu:–Nə güman edirsən? Çox keçməz ki, Allah səni öz yatağındaca öldürüb məhşər günündə səni bağışlamayacaq. İnşallah, İraq buğdasını az bir .müddətdən sonra yeməyəcəksən

(İbni Səd istehza ilə dedi:–Buğda yerinə arpa yeyərəm!(١

Kərbəla hadisəsindən sonra ibni Ziyad Ömər Sədi çağırıb Rey mülkünün hökmünün yazıldığı qəbzi istədi. İbni Səd bildirdi ki, onu itirmişdir. Lakin ibni Ziyad bunu qəbul etməyərək ona qarşı sərt mövqe tutdu. İbni Səd dedi:–Mən bu məktubu Qüreyşin qoca arvadlarına verdim ki, oxuyub mənim haqlı olduğumu bilsinlər. Allaha and olsun ki, mən Hüseyn ibni Əli barədə sənə çoxlu nəsihət etdim və inanıram



---

Təhzibül-əsma vəl-lüğat[١١۴] -١

ki, əgər atam Səd əbi Vəqqasa bu qədər nəsihət etsəydim, onun atalıq haqqını əda .(etmiş olardım(۱

Ömər Səd Yezidə məktub yazıb Müslümün Kufəyə gəlməsini, camaatın onun ətrafına yığışmasını, Nöman Bəşirin onun qarşısında səhlənkarlıq etməsini ona xəbər verənlərdən idi idi. O, Yezidi Kufə camaatının qiyamını yatırmaq üçün təşviq edir, süstlüyə yol verməsini isə camaatın daha da qızışması üçün zəminə yaradacağını zənn .edirdi

Ömər Səd ömrünün son anlarını Kufədə keçirdi, nə dünya səltənətinə–Rey mülkünə sahib oldu, nə də Rəsulullahın (səlləllahu əleyhi və alihi və səlləm) bərəkətli şəfaətindən bəhrələndi. Nəhayət Muxtar onu və oğlu Həfsi faciəli surətdə qətlə yetirdi. .Bu qətl ۶۶-cı ilin zihiccə ayında baş verdi. Əlbəttə, Allahın əzabı daha şiddətli və ağırdır

Əmirəl-mömin (əleyhis-salam)-ın ona demişdi kibehiştlə cəhənnəmi seçməkdə ixtiyar sahibi olan vaxtda cəhənnəmi seçəcəksən?(۲) Əmirəl-mömininin Əliyyibni Əbitalib (əleyhis-salam) Sədə xəbər vermişdi ki, oğlu Ömər İmam Hüseyni (əleyhis-salam) .(öldürəcəkdir(۳

Əbdullah ibni Şərik deyir: Bəziləri Ömər Sədə baxıb deyirdilər: Bu İmam Hüseyn (əleyhis-salam)-ın qatilidir. Bütün bu hadisələr Kərbəla hadisəsindən qabaq baş (vermişdi.(۴

Ömər Sədin özü də İmam Hüseyn (əleyhis-salam)-a dedi:–Səfehlər məni sənin qatilin .hesab edirlər



---

Tarixi-Təbəri, c ۶ səh ۱۹۹[۱۱۵] -۱

Kamil ibni Əsir, c. ۴ səh.۹۴[۱۱۶] -۲

Kamilüz-ziyarət, səh ۷۴[۱۱۷] -۳

Tarixi ibni Əsir, c. ۴ səh.۹۴[۱۱۸] -۴

.İmam (əleyhis-salam) buyurdu:–Onlar səfeh deyildirlər

## ÖMƏR SƏDİN KƏRBƏLAYA GƏLİŞİ

Ömər Səd məhərrəmin ٣-cü günü Neynəva çölünə gəlib çatdıqdan sonra düşmən ordusunun sayı ٥٠٠٠ nəfəri ötüb keçirdi. Hürr də o zamandan onun tabeçiliyinə keçdi. Bir müddətdən sonra Şimr (Şümür) daha ٤-min nəfər əsgərlə birlikdə oraya gəldi. İbni Ziyadın əmri ilə Yezid ibni Rikab Kəlbinin sərkərdəliyi ilə, ٢ min nəfərlik bir qoşun, ٤ min nəfərlik bir qoşun Hüseyn ibni Nümeyrin sərkərdəliyi ilə, ٢ min nəfər əsgər isə Nəsrin .sərkərdəliyi ilə Kərbəlaya gəlmişdilər

Übeydullah ardıcıl olaraq Kərbəlaya qoşun bölmələrini göndərməkdə davam edirdi: ٣ min nəfəri Kəb ibni Təlhənin, min nəfəri Şibs ibni Rəbii Riyahinin, min nəfəri də Hüccar ibni Əbhərin sərkərdəliyi ilə Kərbəlaya göndərdi. Nəhayət əməvi ordusunun sayı ٣٠ min .nəfərə (atlı-piyada) yetişdi

Übeydullah ibni Sədə xəbər göndərdi ki, mən əsgər, təchizat cəhətindən sənin üçün !bəhanə yeri qoymamışam. Hər an sənin xəbərini gözləyirəm. Mərd ol, yubanma

## ÖMƏR SƏDİN NÜMAYƏNDƏSİ İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN YANINDA

İbni Səd əvvəlcə qərara aldı ki, bir nəfəri İmam (əleyhis-salam)-ın yanına göndərib o Həzrətin Kufəyə tərəf hərəkət etməsinin səbəbini xəbər alsın. Bu fikri

ordu başçıları ilə müzakirə etdikdə onların heç biri İmam (əleyhis-salam)-ın yanına getmək istəmədiyini bildirdi. Onlar İmam Hüseyndən (əleyhis-salam) xəcalət çəkirdilər, çünki özləri məktub yazıb onu Kufəyə dəvət etmiş, hal-hazırda isə onunla döyüşə gəlmişdilər. Axırda Ömər Səd Qürrət ibni Eys Hənzəlini İmam (əleyhis-salam)-ın yanına göndərdi. İmam (əleyhis-salam) onun gəlməsini uzaqdan gördükdə .ətrafındakılardan Bu kişini tanıyırsınızmı? deyə soruşdu

Həbib ibni Məzahir dedi:–Bəli. O, Hənzələ qəbiləsindəndir, özü də mənim bacım oğludur. Mən onu ağıllı bir adam hesab edirdim, güman edə bilməzdim ki, o da bu .qoşunla birlikdə gəlsin

.Qürrət ibni Qeys irəli gəldi, salam verib Ömər Sədin istəyini Həzrətə çatdırdı

İmam Hüseyn (əleyhis-salam) buyurdu:–Sizin şəhər əhalisi çoxlu məktub yazıb məni .bura dəvət etdilər. Əgər mənim gəlməyimdən narazısınızsa, qayıdım

Həbib ibni Məzahir Qürrətə dedi:–Vay olsun sənə! Necə oldu ki, zülmkarların içinə düşdün? Bu kişinin köməyinə gəl. Bu elə bir adamdır ki, biz onun atalarının hesabına .hidayət yolunu tapmışıq

Qürrət ibni Qeys dedi:–Qoy əvvəlcə Ömər Sədin yanına gedib İmamın cavabını ona .deyim, sonra öz barəmdə fikirləşib, bir qərara gələrəm

İbni Səd İmam Hüseyn (əleyhis-salam)-ın fikrindən agah olduqdan sonra dedi:– .Ümidvaram ki, Allah mənə onunla döyüşməkdən nicat verəcək

Sonra bu hadisəni İbni Ziyada xəbər verdi, amma İbni Ziyad onun məktubunu oxuyandan sonra öz-özünə dedi: (?) Caynaqlarımızın İmam Hüseynin üstündə bənd olmasına baxmayaraq, onu boşlamağa

yer var, amma artıq gecdir. Bunu deyib dərhal Ömər Sədə yazdı: Hüseyni və onun dostlarını Yezidə beyət etməyə dəvət et, əgər beyət etsələr mənə xəbər ver ki, bu barədə öz fikrimi deyim

O, bundan sonra ikinci bir məktub yazıb əmr etdi ki, İmam Hüseyn (əleyhis-salam)-ın qoşunu ilə suyun arasında fasilə salsınlar, bu karvanın su götürməsinə (hətta bir .damla olsa belə ) icazə verməsinlər

## FƏRATIN MÜHASİRƏ EDİLMƏSİ

Ömər Səd dərhal Əmr ibni Həccacı beş yüz nəfər süvari ilə birlikdə bu işə başçı təyin etdi. Onlar çayın yanına gəlib oranı nəzarət altına aldılar ki, İmam Hüseyn (əleyhis-salam)-ın adamlarından birinin belə əli suya çatmasın. Bu cərəyan məhərrəmin .yeddisində baş vermişdi

.Haqq rəhbərlər, ilahi şəriət sahibləri suyu hətta öz düşməninə belə əsirgəməmişlər

Siffeyn müharibəsində Müaviyə su yolunu ələ keçirdikdən sonra Əmirəl-möminin (əleyhis-salam)-ın qoşununa su vermədi. Lakin Həzrət su yolunu onlardan azad .etdikdə dost-düşmənin üzünə açıq qoydu

İmam Hüseyn (əleyhis-salam) da Kərbəlada Hürr və onun min nəfər atlısı ilə birlikdə qarşılaşdıqda özünün su tuluqlarını içmək üçün onlara verir. Təkcə onlara yox, üstəlik atlarına da su verir. Həm də bu hadisə İmam (əleyhis-salam)-ın su cəhətindən çox təhlükəli bir vəziyyətə düşdüyü, suyun onlar üçün hər şeydən qiymətli olduğu bir .vaxtda baş vermişdi

Lakin İmam Hüseyn (əleyhis-salam)-ın pak nəfəsi, onun vücudunu başdan-ayağa əhatə edən nübuvvət kərəmi, saf təbiəti icazə vermirdi ki, özünün ən nəfis ehtiyatını-suyu onlara verməkdən boyun qaçırsın. Amma nə fayda! İmam (əleyhis-salam)-ın bu cür ehsan və bəxşişindən bəhrələnən, bir damla su belə tapılmayan yanar bir səhrada İmam (əleyhis-salam)-ın lütfündən sirab olan bu qövm, hətta bütün heyvanların .istifadə etdiyi suyu Ali-Mühəmmədin şərəf və ehsan ocağına çox gördülər

İmam Sadiqdən (əleyhis-salam) rəvayət olunan bir hədisdə deyilir: Seyyidüşşühəda (əleyhis-salam) məhərrəmin səkkizinci günü Əli-Əkbəri otuz nəfər atlı ilə birlikdə su gətirmək üçün düşmən tərəfə göndərdi. Onlar özlərini düşmən ordusuna vurdular. .Suya çatıb tuluqları dolduraraq xeymələrə qayıtdılar

### HƏZRƏT ABBASA AMANNAMƏ GƏTİRİLİR

Məhərrəmin ٩-da axşamüstü Şimr İmam Hüseyn (əleyhis-salam)-ın xeymələrinə tərəf gəlib belə səslədi:–Mənim bacım oğlanları–Abbas, Cəfər, Əbdullah və Osman (hardadırlar?(١

İmam Hüseyn (əleyhis-salam) öz qardaşlarına buyurdu:–Ona cavab verin, .baxmayaraq ki, fasiq bir adamdır, amma sizinlə qohumluq əlaqəsi var

?Qardaşlar Şimrə dedilər:–Nə istəyirsən



---

Bu dörd nəfər, Əli (ə) oğlanları idilər və ana tərəfdən Şimrin qəbiləsi ilə qohum[١١٩] -١ .idilər

Şimr dedi:–Ey mənim bacım oğlanları, sizin üçün amannamə gətirmişəm. Canınızı təhlükəyə salıb qardaşınız Hüseynə görə özünüzü ölüm ayağına verməyin. Yezidə .tabe olun

Onlar bir ağızdan dedilər:–Allah sənə və sənin gətirdiyin amannaməyə lənət etsin. ?Rəsulullahın oğlunun amanda olmadığı halda bizə aman verirsən

Həzrət Abbas buyurdu:–Əllərin qırılsın, gətirdiyin amannaməyə lənət olsun, ey Allah düşməni! Sən bizə aman verirsənmi ki, qardaşımız, sərvərimiz və Fatimən (əleyha salam)-ın oğlu Hüseyni tək qoyaq, məlunların və onların övladlarının əmrinə tabe ?olaq

.Şimr qəzəblənərək öz qoşununa sarı qayıtdı

## ƏLİ ƏKBƏR ÜÇÜN AMANNAMƏ

Əli Əkbər üçün də amannamə gətirdilər. Çünki onun anası Leyla Əbi Mərrət ibni Ürvət ibni Məsud Səqəfinin qızı idi. Leylanın da anası Məymunə Əbu Süfyan Səxr ibni Hərb ibni Üməyyənin qızı idi. Məymunə Əbu Süfyanın qızı Leylanın nənəsi (ata tərəfdən) idi, Ürvə onunla evlənmiş, Əbu Mərrət dünyaya gəlmişdi. İmam Hüseyn (əleyhissalam)-ın .həyat yoldaşı Leyla da Əbu Mərrənin qızı sayılırdı

Leylanın Məymunə ilə olan qohumluğuna görə düşmən Kərbəlada Əli Əkbərə hörmət .əlaməti olaraq belə dedi: Sən Əmirəl-möminin Yezidlə qohumusan

Bu sözlərlə onu küfr ordusuna tərəf çəkmək istəyirdilər. Lakin o Həzrət bu təklifləri rədd edərək dedi:–Ciyər yeyən Hindin oğlu ilə qohumluqdansa, Allahın Rəsulu ilə qohumluq əlaqəsinin qorunub

(saxlanılması daha gözəl və müqayisə olunası deyildir!(١)

## KUFƏ ORDUSU İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN XEYMƏSİNƏ HÜCUM EDİR

Hər şey həll oldu, İbni Səd öz-özlüyündə qərara gələrək döyüşə hazırlıq əmrini verdi. Qoşun hücuma hazır vəziyyətə sıraya düzüldü. İbni Səd onlara behişt vədəsi verdi və beləliklə hücum başlandı. Kufəlilər heç bir xəbərdarlıq etmədən hücuma keçdilər. İmam Hüseyn (əleyhis-salam) qardaşı Abbasa buyurdu ki, kufəlilərin yanına gedib bu gözlənilməz hücumun səbəbini soruşsun. Həzrət Abbas (əleyhis-salam) iyirmi nəfər süvari ilə birlikdə irəli gəlib hücumun səbəbini soruşdu. Onlar dedilər:–Əmirin fərmanıdır. Ya gərək sizi onun təbeçiliyinə gətirək, ya da döyüşə başlayaq.

Həzrət Abbas dedi:–Elə isə bir az səbr edin, mən bu məsələni Əba Əbdillaha (əleyhis-salam) çatdırım.

Onlar bu təklifi qəbul etdilər. Həzrət Abbas İmam Hüseyn (əleyhis-salam)-ın yanına gəldi. Bu vaxt İmam (əleyhis-salam)-ın dostları düşmənlə danışığa girdi, onlara nəsihət edib Həzrəti öldürməkdən əl çəkmələrini istədilər.

Həzrət Abbas hadisəni İmam Hüseyn (əleyhis-salam)-a danışdıqda Həzrət buyurdu:–Mümkün olsa, bu gecəni bizim üçün möhlət al, sabah döyüşə başlayaq. Bu gecəni namaz qılmaqla keçirək, öz



---

١- [١٢٠] Sirrüs-silsilətil-ələviyyə

Allahımızla raz-niyaz edib Onun dərgahında istiğfar edək. Allah bilir ki, mən namaz !qılmağı, Quran oxumağı, raz-niyaz və istiğfar etməyi necə çox sevirəm

Həzrət Abbas İmam Hüseyn (əleyhis-salam)-ın istəyini onlara çatdıranda Ömər Səd heç nə demədi. Qoşun başçılarından biri sayılan və su yolunun bağlanmasının məsulu Əmr ibni Həccac ona tənə vurub dedi:–Sübhanəllah! Allaha and olsun, əgər bunlar türk və deyləm (Gilan tərəfində yaşamış qədim bir tayfadır) olsaydılar və belə bir şey istəsəydilər, biz qəbul edərdik. Necə ola bilər ki, Rəsulullahın övladlarına möhlət ?verməyək

Bundan sonra ibni Səd İmam Hüseyn (əleyhis-salam)-ın təklifini qəbul edib hücumu .saxladı

Beləliklə, İmam Hüseyn (əleyhissalam) məhərrəmin ۹-cu gecəsini möhlət aldı. İmam Hüseyn (əleyhis-salam) Aşura gecəsi ibni Sədlə görüşəndə buyurmuşdu: Həzrət Abbas və Əli Əkbərdən başqa hamı dağılışsın. Düşmən tərəfdən isə İbni Səd, onun qulamı Həfs və oğlu orada qalmışdın

## İMAM HÜSEYN (ƏLEYHİS–SALAM)–IN AŞURA GECƏSİNDƏKİ BƏYANATI

İmam Hüseyn (əleyhis-salam) Aşura gecəsi öz dostlarının arasında durub beyətini götürdü və onlara getmək icazəsini verib dedi:–Gecə öz pərdəsini çəkmişdir. Ayağa qalxıb gedin. Hər biriniz də mənim tayfamdan olan bir nəfərin əlindən tutub gecənin

qaranlığında dağılışın. Bunların işi mənimlədir. Əgər məni öldürsələr, daha heç kimlə .işləri yoxdur

Həzrət Əbülfəzl, Əli Əkbər, yerlərindən qalxıb dedilər:–Nə üçün belə edək? Allah səndən sonra bizi sağ qoymasın. Bunlardan sonra başqaları da-haşimilər, səhabələr .durub bu məzmunda sözlər dedilər

O Həzrətin övladlarını, qardaşlarını, qardaşoğlanlarını, əmioğlanlarını əhdə vəfalı qalmaq, azadlıq, şücaət, mərdanəlik, yüksək ideal, ruhi şərafət və yorulmazlıq cəhətindən yer üzünün seçilmiş şəxsiyyətləri hesab etməliyik. Onlar öz rəhbərlərindən heç vaxt ayrılmadılar, Həzrətin onlara, getmələrinə icazə verməsinə baxmayaraq, pak canlarını onun yolunda fəda etdilər, müqəddəs qanları ilə İslamın cavan ağacını .suladılar

İmam Hüseyn (əleyhis-salam) öz dostlarını, ailə üzvlərini yığıb siz gedə bilərsiniz deyəndə fəryad qoparıb dedilər: Biz heç vaxt səndən ayrılmarıq!Heç yaraşarmı ki, biz .sağ qalaq, sizi isə öldürsünlər? Allah belə günü bizə nəsib etməsin

İmam (əleyhis-salam) sonra üzünü Əqilin övladarına tutub buyurdu:–Mən sizə məsləhət görürəm ki, Kərbəla diyarını tərk edəsiniz. Sizin üçün Müslümün şəhadəti .kifayətdir

Lakin Əqil övladlarının sözləri bu oldu: Sübhanəllah! Bu halda camaat bizə nə deyər? Biz onlara nə cavab verərik? Deyə bilərikmi ki, biz öz ağamızı, rəhbər və əmoğlumuzu düşmənin əlində qoyduq, onlarla birgə döyüşmədik, düşmənə tərəf nə ox atdıq, nə də nizə, nə də ki, qılıncla onların murdar cəsədlərinə yara vurduq, və bilmirik ki, düşmən ?bizim qohumların başına nə müsibət gətirdi

Yox! Biz heç vaxt bu işi görmərik. Canımızı sənin yolunda fəda edəcəyik, var-yoxumuzu bəxşiş edəcək, əhli-əyalımızdan keçəcəyik. Ey əziz Hüseyn, səninlə çiyin-çiyinə vuruşacağıq, bir an da olsun belə səni tək qoymayacağıq! Axı səndən sonra !yaşamağın nə mənası

Müharibə odu şölələnəndə, müsibət hər tərəfdən onlara hücum edəndə İmamın gözəl, mələkuti səsi eşidildi: Ey əmoğlanlarım, səbrli olun; Allaha and olsun, bu gündən .sonra daha heç vaxt əzab-əziyyət görməyəcəksiniz

## İMAM (əleyhis–salam)–IN DOSTLARININ VERDİYİ CAVAB

İmam (əleyhis-salam)-ın yolunda fədakarlıq edən, onun önündə rəşadət göstərən və mərd-mərdanə şəhid olan kişilər ilahi şəxsiyyətlərin ən yaxşı dostları idi; onlar əhli-əyallarını buraxmış, Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm)-in nəvəsinə qoşulmuş, onun yolunda qəhrəmanlıqla vuruşuraq, döyüş meydanına getməkdə bir-birindən irəli geçirdilər. Bu fədakar insanların öz imamı, rəhbəri ilə olan sözləri bu idi ki: Biz özümüzü sənə fəda edib səni düşməndən mühafizə edəcəyik. Aşura gecəsi onların dodaqlarında təbəssüm var idi, qəlblərində ölümdən zərrə qədər də olsun belə qorxu yox idi. Tezliklə şəhadətin yüksək mərtəbəsinə nail olacaqlarından, öz Allahları ilə görüşəcəklərindən sevinirdilər. İmam Hüseyn (əleyhis-salam) onlara siz azadsınız, döyüş meydanından uzaqlaşa bilərsiniz-buyuranda, narahat olub Biz heç vaxt səni tək qoymayacaq və bu

diyardan geri dönməyəcəyik. Düşmənlər sənin canına daraşdığı halda, biz səni necə .buraxıb gedə bilərik? Bu halda Allah yanında nə cavab verərik?–dedilər

Onlardan biri dedi: Allaha and olsun ki, mən belə bir iş görmərəm; mən bu zalım tayfalar qarşısında nizəmi onların sinələrində sındırana, qılıncımla, dəstəyi ondan ayrılana qədər müqavimət göstərəcək, onlara yara vuracağam, bununla belə, yenə də susmayacaq, düşmənə daşla həmlə edəcəyəm. Öz rəhbərimin gözləri önündə .ölməyincə ondan ayrılmayacağam

Başqa birisi dedi: Tək olan Allaha and olsun, əgər bilsəydim ki, sizin gözləriniz önündə ölüb sonra diriləcəyəm, sonra yenidən öləcəyəm və cəsədimi odda yandıracaqlar, bu halda dirilərdim və öldürülüb odda yandırılardım. Bu iş yetmiş dəfə belə təkrar .olunsaydı, yenə də sizdən ayrılmazdım

Üçüncüsü dedi: Əgər min dəfə öldürülüb sonra dirilsəm, beləliklə də düşmənin şərini .siz və ailənizdən dəf edə bilsəydim, bunu edərdim

Dördüncüsü dedi: Əgər mən sizdən ayrılsam, daha yaşamağın mənası olmaz. Yaxşı .olardı ki, vəhşi heyvanlar məni diri-diri parçalasınlar

Aşura günü sübh İmam (əleyhis-salam) və dostları sübh namazını qılıb döyüşə .hazırlaşdılar

### AŞURA GÜNÜ SÜBH DÖYÜŞ HAZIRLIĞI

İmam Hüseyn (əleyhis-salam) ۷۲ nəfərdən ibarət olan kiçik qoşunu xeymələrin qarşısına gətirdi. Bu qoşun ۳۲ süvari, ۴۰ nəfər piyadadan ibarət idi. Qoşunda ۷۰ yaşlı Müslüm ibni Ovsəcədən tutmuş, ۱۴

yaşlı Qasim ibnil-Həsənə kimi müxtəlif yaş qruplarına mənsub olan döyüşçülər var idi. Çadırların arxasında yığılmış odun komalarına, qamışlara od vurmaqla düşməndən qorunurdu. Sağ cinahın sərkərdəliyi Züheyr ibni Qinə, sol cinahınkı isə Həbib ibni .Məzahirə, süvarlərin bayrağı Həzrət Abbas (əleyhissalam)-a tapşırılmışdı

## AŞURA GÜNÜ İMAM (əleyhis-salam)-IN XİTABI

Özünü həlledici bir döyüşə hazırlayan İmam Hüseyn (əleyhis-salam) cəddi Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in əbasını geyərək, müşk ilə ətirləndi, ata minib yuxarı qaldırdığı Quranla birlikdə atını düşmənə sarı çapdı. Allahın dərgahından pənah diləyən halda düşmənə xitab edərək dedi:-Pərvərdigara, Sən hər bir çətinlikdə mənim arxam, ümidimsən. İlahi, Sən qəlblərin zəif, əməllərin süst olduğu, insanın dostları onu tək qoyub düşmənləri bədxahlıq üzündən bu (kimi) giriftarçılıqlarda şadlıq, şənlik etdiyi anda narahatlıq və pərişanlıqda yeganə arxasan. Ey Allahım, mən özümü Sənə tapşırıram. Düşmənlərimdən yalnız Sənə şikayət edirəm. Yeganə arzum Sənə tərəf (gəlmək)dir. Səndən başqa kim məni qəm-qüssədən qurtara bilər? Yalnız Sən hər .rəhmətin keşikçisi, hər fəzilətin sərvəri, hər bir arzu edənin son pənahısan

İmam (əleyhis-salam) qılıncının qəbzəsinə söykənmiş vəziyyətdə uca səslə kufəlilərə müraciət edərək buyurdu:-Ey Kufə camaatı, sizi and verirəm Allaha, deyin görüm ?məni tanıyırsınızmı

.Camaat:–Bəli, sən Rəsulullahın nəvəsisən

İmam (əleyhis-salam):–Sizi and verirəm Allaha, deyin görüm cəddimin Allahın ?Peyğəmbəri olmasına inanırsınızmı

.Camaat:–Bəli, Allahı bu işdə şahid tuturuq

?Həzrət:–Bilirsinizmi ki, mənim anam Fatimə, Peyğəmbərin qızıdır

.Camaat:–Bəli, bilirik

Həzrət:–İnanırsınızmı ki, mənim cəddəm (nənəm) Xədicə bu ümmət qadınları ?içərisində ilk müsəlmandır

.Camaat:–Bəli

?Həzrət:–Bilirsinizmi ki, əlimdəki bu qılınc Rəsulullahın qılıncıdır

.Camaat:–Bəli

?Həzrət:–Bilirsinizmi ki başımdakı əmmamə Rəsulullahın əmmaməsidir

.Camaat:–Bəli

Həzrət:–Bilirsinizmi ki, atam Əli İslamı qəbul edən ilk şəxsdir və onun elmi, biliyi ?hamıdan artıq, səbri hamıdan çoxdur. O, hər bir imanlı şəxsin mövlası (rəhbəri) sayılır

.Camaat:–Bunların hamısını qəbul edirik

?Həzrət:–Belədirsə, bəs nə üçün mənim qanımı tökməyi halal hesab edirsiniz

.Camaat:–Bütün bu sözləri qəbul edirik, amma səni öldürməyincə, əl çəkən deyilik

İmam Hüseyn (əleyhis-salam) bu sözləri buyuranda qızları və bacıları eşidib ağlayırdılar. Onların naləsi İmam (əleyhis-salam)-ın qulağına çatdı, Həzrət Abbası, Əli Əkbəri çağırıb dedi:–Onları sakitləşdirin, canıma and olsun, bundan sonra çox !ağlayacaqlar

## İMAM HÜSEYN (ƏLEYHIS–SALAM) KUFƏLİLƏRƏ HÖCCƏTİ TAMAM EDİR

İmam Hüseyn (əleyhis-salam) müdam çalışırdı ki, müharibə odu mümkün olduqca gec qızışsın və kufəlilərə höccəti tamam etsin. Məhz bu səbəbə görə də özü Şam qoşununa tərəf irəliləyib, onların qarşısında dayandı və bu böyük cəmiyyətə və ibni Sədə bir nəzər saldı. O, Kufənin adlı-sanlı adamlarının içində idi. İmam (əleyhis-salam) buyurdu:–Dünyanı yaradan, onu məhv olmaq yeri qərar verən Allaha şükür olsun! Aldananlar məhz dünyaya aldananlar, bədbəxtlər isə dünya tələsinə giriftar olanlardır. Ey camaat! Dünya sizi aldatmasın. Dünya, ona ümid bağlayan hər kəsi məyus edər; ona tamah salan hər kəsin arzusunu ürəyində qoyar. Bu gün mən görürəm ki, siz elə bir iş üçün yığışmısınız ki, Allah onun səbəbi ilə sizə qəzəblənmiş, üzünü sizdən çevirmişdir; Öz əzabını sizlərə nazil etmmiş, geniş rəhmətini sizdən götürmüşdür. Doğrudan da bizim necə də mehriban Allahımız var! Sizlər necə də nankor insanlarsınız! Siz özünüz mənə itaət etməyinizi, Rəsulullaha iman gətirməyinizi etiraf etmişdiniz. Amma indi o Həzrətin ailəsinə qarşı müharibə etmək üçün qollarınızı .çırmalamış, onları öldürmək niyyətindəsiniz

Şeytan sizə qələbə çalmış, Allahı yadınızdan çıxarmışdır. Sizə və sizin istəklərinizə lənət olsun. Biz hamımız Allahınıq və ona tərəf qayıdacağıq. Siz iman gətirib, sonra kafir .olanlardansınız. Ölüm olsun zülmkarlara

İbni Səd özünü itirmiş halda qışqırdı:–Vay olsun sizə, nə üçün susub cavabını vermirsiniz? Allaha and

olsun, o Əliyyibni Əbi Talibin oğludur. Əgər bu minvalla axşama kimi sizin içinizdə qalıb .söz desə, heç vaxt ələ keçməz, mühasirə də sona yetər

Şimr irəli çıxıb həyasızcasına dedi:–Ey Hüseyn ibni Əli, nə istəyirsən? İstədiklərini bizə .başa sal, sənin məqsədini dərk edək

İmam Hüseyn (əleyhis-salam) öz xitabəsini davam etdirdi:–Ey camaat, Allahdan qorxun və məni qətlə yetirməkdən əl çəkin. Bilin ki, mənim qanım sizə halal deyildir. Mənim hörmətimi sındırmaq rəva deyildir. Mən sizin Peyğəmbərin qızının oğluyam. Mənim nənəm Xədicə Peyğəmbərin arvadıdır. Siz o Həzrətin ki buyuruduğu Həsən və .Hüseyn behişt cavanlarının sərvəridirlər sözlərini eşitmişdiniz

Şeyx Müfid yazır: Sonra İmam Hüseyn (əleyhis-salam) öz atına minib qoşunun hamısı, yaxud əksəriyyətinin eşidə biləcəyi uca səslə buyurdu: Ey camaat! Mənim sözümü eşidin, məni öldürməyə tələsməyin. İmkan verin, mən sizi vəzifəli olduğum şeylərə nəsihət edim və sizə höccəti tamam edim. Əgər insaflı olsanız, xoşbəxtliyə çatarsınız, yox əgər insanlıqdan əl çəkib məni təsdiq etməsəniz, ziyanını özünüz görəcəksiniz. Belə isə, öz məqsədiniz üçün bir yerə yığılın, ta ki, gələcəkdə peşman olmayasınız). Sonra mənim barəmdə qəzavət edin və daha mənə möhlət verməyin. Şübhəsiz, .mənim ixtiyar sahibim tək olan Allahdır ki O, yaxşı insanları himayə edəndir

Bunu deyib Allah dərgahına şükr etdi, öz Allahına layiqincə həmd və sitayiş, Onun Peyğəmbərinə, mələklərinə və sair peyğəmbərlərə salam göndərdikdən sonra buyurdu:–Ey camaat, yaxşı-yaxşı baxın, görün mən kiməm, kimlə qohumam, sonra .ağlınızı başınıza yığıb özünüzü məzəmmət edin

Baxın görün məni öldürmək sizin üçün rəvadırmı? Məni qətlə yetirmək etmək halaldırmı? Məgər mən sizin Peyğəmbərinizin qızının oğlu, onun canişini və əmoğlusunun oğlu deyiləmmi? Məgər mənim atam ilk mömin, Rəsulullahın peyğəmbərliyinə şəhadət verən ilk şəxs deyildimi? Məgər seyyidüş-şühəda Həmzə mənim əmim deyildirmi? Məgər behiştdə iki qanadlı pərvaz edən Cəfər mənim əmim deyilmi? Peyğəmbərdən eşitdiyiniz Həsən və Hüseyn behişt cavanlarının sərvəridir kəlamı mənim və qardaşımın barəsində deyilmi? Əgər məni düzdanışan bilsəniz elə–həqiqətdə belədir və Allaha and olsun ki, Onun yalan danışanlarla düşmən olduğunu eşitdiyim gündən, heç vaxt yalan danışmamışam–sözümü eşidin; yox əgər məni yalançı hesab etsəniz, onda sizin aranızda elə adamlar var ki, Peyğəmbərin bu sözü barəsində sizə xəbər verə bilər; Cabir ibni Əbdüllah Ənsari, Əbu Səid Xidri, Səhl ibni Səd Saidi, Zeyd ibni Ərqəm, Ənəs ibni Malikdən soruşsanız, sizə deyərlər ki, onlar mənim və qardaşım barədə Peyğəmbərdən belə bir şey eşidiblər. İndi görün, bu qədər ?dəlil sizə, mənim qanımı tökməkdən əl çəkməyiniz üçün kifayət etmirmi

Şimr yenə də dedi:–Əgər sənin nə dediyini bildimsə, qoy Allaha şəkk əsasında ibadət edim. (Demək istəyirdi ki, sizin sözləriniz bizim üçün dərk olunmazdır, nə dediyini dərk (.etmirik

Həbib ibni Məzahir ona belə cavab verdi:–Ey Şimr! Allaha and olsun ki, sən Allaha ۷۰ dolayısı yolla ibadət edirsən. Şəhadət verirəm ki, sən düz deyirsən və İmam Hüseyn (əleyhis-salam)-ın dediyini dərk etmirsən. Çünki sənin qəlbinə möhür vurulmuşdur, .buna görə də qəlbində haqqa yer yoxdur

İmam Hüseyn (əleyhis-salam) sözlərini davam etdirərək dedi:–Ey Camaat! Dediklərimdə şəkkiniz olsa belə, deyin görüm mənim Peyğəmbərin qızının oğlu olmağımda da şəkkiniz var? Allaha and olsun, məşriqlə məğrib arasında məndən başqa heç kim Peyğəmbərin oğlu deyildir; istər sizin aranızda olsun, istərsə də qeyrisində. Vay olsun sizə, məgər mən sizdən bir kəsi öldürmüşəm ki, onun qisasını məndən almaq istəyirsiniz? Yoxsa sizin mal-dövlətinizi məhv etmişəm ki, onun əvəzində mənimlə vuruşursunuz? Yaxud bir kəsi yaralamışam qisasını məndən ?alırsınız

Sizinləyəm ey Şibs, ey Həccar, ey Qeys və ey Yəzid! Məgər siz məktubda mənə yazmamışdınız ki, Meyvələr yetişmiş, bostanlar yaşıllaşmışdır. Əgər sən bizə tərəf ?gəlsən, biz sənin intizarındayıq

Qeysə aşkar şəkildə xitab olunduqda, onun namərdliyi, vəfasızlığı hamının hüzurunda ifşa olunduqda tab gətirə bilmədi, İmam Hüseyn (əleyhis-salam) a dedi:–Biz sənin nə dediyini bimirik və sözlərini başa düşmürük. Sizin yalnız bir yolunuz var: Əmioğlun .Yezid ibni Müaviyəyə tabe olun, o da sizə qarşı xoşagəlməz rəftar etməsin

İmam Hüseyn (əleyhis-salam) buyurdu:–Yox! Heç vaxt belə bir iş görmərəm! Allaha and olsun, mən heç vaxt zilləti, xarlığı qəbul etməz, sizdən isə qulların öz sahiblərindən (qaçdığı kimi qaçmaram!(۱

səh:۲۰۹

---

Şeyx Müfid, İrşad[۱۲۱] -۱

## İMAM HÜSEYN (əleyhis–salam)–ın KUFƏLİLƏRƏ XİTABI

İmam Hüseyn (əleyhis-salam) bir daha öz atına mindi, Kufə ordusuna doğru hərəkət edib onlara dedi ki, bir neçə anlığa sakit olsunlar. Kufəlilər səs-küy, qarma-qarışıqlıq salaraq o Həzrətin danışmasına imkan vermədilər. İş o yerə çatdı ki, İmam (əleyhis-salam) onlara qarşı qəzəblənib dedi:–Vay olsun sizə! Sizə nə olub ki, mənim sözlərimə qulaq asmaq istəmirsiniz? Mən sizi aydın hidayət yoluna çağırıram, hər kəs mənə itaət etsə, düz yolu tapar; hər kim də mənə qarşı üsyana qalxsa, fəlakətə düçar olacaq. Və siz, ey camaat! Hamınız üsyankarsınız, haqq sözü eşitməkdən acığınız gəlir. Ürəkləriniz haramla dolmuş, qəlbləriniz möhürlənmişdir. Vay olsun sizə, niyə sakit olmursunsuz? ?Niyə sözlərimə qulaq asmırsınız

Tülkü sifət kufəlilər azacıq özlərinə gəldilər, bir-birini danlayıb sakit oldular, İmam (əleyhis-salam)-ın sözlərinə qulaq asmağa başladılar. İmam (əleyhis-salam) əvvəlcə Allaha həmd-səna etdikdən Həzrət Peyğəmbərə, mələklərə və sair peyğəmbərlərə salam göndərdikdən sonra buyurdu:–Həlak olasınız, ey camaat! Bu kişilikdəndir ki, bizi özünüzə tərəf çağırıb bizdən kömək istədiniz, biz də sizin dəvəti qəbul edib özümüzü təcili olaraq sizə çatdırdıq, indi isə üzümüzə qılınc çəkib od yandırmısınız? Halbuki, bu odu biz özümüzün və sizin düşmənlərinizə qarşı hazırlamışdıq. Bu gün siz öz dostlarınıza qarşı kin bəsləyir, düşmənlərinizlə əlbir olmusunuz. Halbuki, onlar sizin aranızda ədaləti bərqərar etməmiş, dünya malından tamah gözü dikdiyiniz dəyərsiz həyatdan

başqa bir şeyə ümid bağlamamısınız. Halbuki, bizim üçün nə bir hadisə baş vermiş, nə zəifliyə, nə də süstlüyə düçar olmuşuq. Vay olsun sizə ki, bizə kömək etməkdən əl çəkdiniz, bizə kömək etməyi xoşlamadınız, halbuki qılınclar qınında, qəlblər aram, düşüncələr möhkəm və qüvvətli idi. Amma siz fitnə odunu şölələndirib, çəyirtkələrin, kəpənəklərin o yana bu yana uçması kimi ona doğru tələsdiniz. Allahın rəhmətindən uzaq olasınız, ey ümmətin düşmənləri, ey cəmiyyəti tərk edənlər, ey Quranı özlərindən uzaqlaşdıranlar, ey şeytanın vəsvəsələrinə uyanlar, ey günahkarlar, ey Peyğəmbər sünnəsinin nurunu söndürənlər, ey Peyğəmbərin övladlarının qatilləri, ey ilahi xilafət ailəsini məhv edənlər, ey zinakarların dəstəsinə qoşulanlar, ey möminlərə əziyyət verənlər, ey Quranı parça-parça edib ayaq altına salanlar, zalım hökmdarlara kömək edənlər! Necə də pis bir qədəm götürmüsünüz, necə də şiddətli əzab sizin intizarınızdadır! Doğrudan da zalımlarla əlbir olmaqdan, bizə kömək etməkdən əl çəkməyinizdən həya etmirsiniz? Bəli, Allaha and olsun ki, sizdə hiyləgərlik qədimdən vardır. Vücudunuzun kökləri hiylə ilə qarışmış, onun çirkin paltarı sizin əməllərinizin, rəftarlarınızın əndamına geydirilmişdir, qəlbləriniz onunla üns bağlamış, sinələriniz onunla doldurulmuşdur. Bəli, siz tamaşaçılar üçün ən pis meyvə, qəsbkar üçün ən dəyərsiz bir tikəsiniz. Allahın lənəti ilahi əhdi bağladıqdan sonra pozub ayaq altına salanlara olsun. Siz özünüz Allahı öz işinizə ixtiyar sahibi seçdiniz, əhd bağladınız, amma onu pozdunuz. Siz elə əhd-peymanı pozanlarsınız. Ey camaat, agah olun ki, zinakar oğlu zinakar (Yezid) məni iki işin arasında qoymuşdur: ya qılınclarla doğranmaq, ya da xarlığı, zilləti qəbul etmək. Zillət

bizdən uzaqdır. Allah, Onun Peyğəmbəri və möminlər bizi zilləti qəbul etməkdən çəkindirmişlər. Çünki bizim nəslimiz pak-pakizə, qəlblərimiz mənəvi inkişafdadır. Heç vaxt alçaq, yaramaz və murdar adamlara tabe olmağı mərd-mərdanə şəhid olmaqdan üstün saymırıq. İlahi, mən höccəti tamam etdim, bunları pis aqibətdən çəkindirdim və indi öz azsaylı dostlarımla bu saysız düşmən qarşısında dayanıb .vuruşacağam

Bu vaxt İmam (əleyhis-salam) Fərvət ibni Müsəyk Muradinin şerindən bir neçə beyt oxudu: Əgər qələbə qazansaq, elə qədimdən belə olmuşdur və əgər məğlub olsaq, yenə də qələbə bizimkidir. Qorxu, zəlalət və alçaqlıq bizim adətimiz deyildir, lakin alnımızda yazılıb ki, şəhadətə çataq və başqaları bizdən sonra hökumətə çatsınlar. Əcəl mənim tayfamın böyüklərini qətlə yetirdi, necə ki, əvvəlkilərlə də belə etmişdi. Bəli, əgər padşahlar əbədi olaraq dünyada qalsaydılar, biz də ölümdən xilas olardıq; və əgər böyük insanlar əbədi olsaydılar, biz də əbədi olaraq dünyada qalardıq. Belə isə sarsaq danışanlara de: Ayıq olun ki, siz də bizim ona tərəf tələsdiyimizlə .görüşəcəksiniz

Sonra İmam (əleyhis-salam) sözünə belə davam etdi: Allaha and olsun, siz (məni öldürəndən sonra) çox yaşamayacaqsınız, bir piyadanın ata minməsi müddətindən çox öz arzunuza çatmayacaqsınız və bunun ardınca zəmanənin çarxı tərsinə fırlanacaq, dəyirman daşının oxu kimi əbədi olaraq nigaranlıq və iztirabda qalacaqsınız. Belə isə öz fikirlərinizi bir yerə yığıb bir-birinizlə məşvərət edin ki, bu iş sizə gizli qalmasın. Sonra isə məni öldürün və bir an da olsa, möhlət verməyin. Mən öz Allahıma, sizin Allahınıza ümid bağlamışam və bilirəm ki, hər şey

Onun qüdrəti dairəsindədir. Mehriban Allahın istəyi düzgün, ədalətli yolda möhkəm .qərar tutmuşdur

İmam (əleyhis-salam)-ın sözləri sona çatdı, Kufə qoşunu Rəsulullahın nəvəsinin son kəlamlarını –daş qəlbləri əridib suya döndərən sözləri eşitdilər, amma bu sözlər .kufəlilərin qəsavət bağlamış qəlblərində əsla təsir buraxmadı

## ZÜHEYR KUFƏLİLƏRİN QARŞISINDA

Bundan sonra Züheyr ibni Qin uzunquyruq bir ata minib başdan-ayağa yaraqlanmış halda düşmən qoşununa tərəf getdi, onlara nəsihət verdi. Amma kufəlilər ona nalayiq .sözlər deməyə, Übeydullahı tərifləməyə başladılar

Züheyr dedi:–Ey Allahın bəndələri! Şəksiz Fatimənin övladları dosta arxa olmaq üçün Süməyyənin oğlundan daha ləyaqətlidirlər. İndi əgər siz ona kömək etməsəniz də, pak .və Allahısevər insanları öldürməkdən Allaha pənah aparın

Şimr dərhal ona tərəf bir ox atdı. Nalayiq sözlər danışaraq dedi:–Bir neçə dəqiqədən .sonra sən də, rəhbərin də qüdrətli Allahın əli ilə öldürüləcəksiniz

Züheyr dedi:–Məni ölümlə qorxudursanmı? Allaha and olsun ki, ölüm sizinlə yanaşı .yaşamaqdan qat-qat üstündür

Bu vaxt İmam (əleyhis-salam) Züheyri səslədi. O da əmrə tabe olaraq xeymələrə tərəf .qayıtdı

Hürr bu mübahisəni müşahidə edib Hürr dərk etmişdi ki, bu qoşun İmam Hüseyn (əleyhis-salam)-ı öldürmək barədə qəti qərara gəlmişdir. Buna görə də Ömər Sədlə danışıqdan sonra döyüş meydanından uzaqlaşdı, yavaş-yavaş İmam (əleyhis-salam)-ın xeymələrinə doğru hərəkət etdi. Mühacir onu görüb elə bildi ki, o, Həzrətin qoşununa hücum etmək istəyir, ondan soruşdu:–Hücum etmək istəyirsənmi? Lakin cavab eşitmədi, yalnız görürdü ki, Hürrün bədəni lərzəyə düşmüşdür, dedi:–Mən sənin işindən təəccüb edirəm, sənin barəndə şəkkə düşmüşəm. Allaha and olsun, indiyə kimi səni heç vaxt bu halda görməmişdim. Məndən Kufənin ən şücaətli pəhləvanı barədə ?soruşsaydılar, yalnız sənin adını deyərdim. Bu nə haldır

Hürr dedi:–Mən elə bu andan etibarən behiştlə cəhənnəmin arasındayam, amma Allaha and olsun ki, hətta məni tikə-tikə doğrayıb odda yandırsalar belə, heç nəyi behiştdən üstün tutmayacağam. Bunu deyib atını çapdı; əllərini başına qoyan halda İmam Hüseyn (əleyhis-salam)-a tərəf getdi. Gözlərindən yaş axırdı. Öz-özünə İlahi, Sənə tərəf qayıdıram, ümidvaram ki, tövbəmi qəbul edəsən. İlahi, mən sənin dostlarının və peyğəmbərinin övladlarının qəlblərini qorxuya salmışam. Bu böyük .günahımı bağışla deyə zümzümə edirdi

Elə ki, gəlib İmam (əleyhis-salam)-ın hüzuruna çatdı, dedi:–Mən həmin şəxsəm ki, sizin Mədinəyə qayıtmağınıza mane oldum, yolunuzu bağladım və sizi çöl-biyabanlarda dolandırdıb, bu diyara gətirdim. Mən heç də təsəvvür etmirdim ki, bu qövm sizə qarşı belə rəftar etsin, sizin təklifinizi rədd edərək sizə

qarşı hörmətsizlik etsinlər. Allaha and olsun, əgər bilsəydim ki, onlar işi bu mərhələyə gətirib çıxaracaqlar, heç vaxt bu tədbirə əl atmazdım. İndi isə öz əməlimdən peşman olmuşam; Allahın dərgahına tövbə edirəm, sizin yolunuzda canımdan keçməyə, gözünüzün önündə şəhadət feyzinə çatmağa hazıram. Görəsən mənim tövbəm qəbul ?olunacaqmı

İmam Hüseyn (əleyhis-salam) buyurdu:–Bəli, mehriban Allah tövbələri qəbul edəndir, .atdan düş

Hürr dedi:–Əgər mən sizin yolunuzda at üstündə vuruşsam, piyada vuruşmaqdan .daha yaxşıdır, baxmayaraq ki axırda işim atdan enməklə nəticələnəcək

İmam Hüseyn (əleyhis-salam) buyurdu:–Necə istəyirsənsə, o cür də et. Allah öz .rəhmətini sənə göndərsin

Hürr o Həzrətin gözləri önündə üzünü kufəlilərə tutdu, onlara nəsihət edib danladı. Kufənin namərdləri onun sözlərini eşitməyə tab gətirmədilər, ona ox atdılar. Hürr .İmam (əleyhis-salam)-ın yanına qayıtdı

## DÖYÜŞ BAŞLANIR

Döyüş Ömər Sədin hazır ol! əmri ilə başlandı. Əvvəlcə ordunun bayrağı qaldırıldı. Sonra Ömər Sədin özü kamana bir ox qoydu, İmam (əleyhis-salam)-ın qoşununa tərəf atıb .qışqırdı: Ey qoşun, əmirin yanında şahid olun ki, ilk oxu mən atdım

Bundan sonra oxlar dalbadal İmam (əleyhis-salam) və onun köməkçilərinə tərəf .yağdırılmağa başladı. Atılan oxlar yağışa bənzəyirdi

İmam Hüseyn (əleyhis-salam) sakit bir nida verdi, dostlarını düşmənlə qarşılaşmağa səslədi:–Qalxın ayağa, Allah sizə rəhmət etsin. Ölümə, can qurtarmağa heç bir yolu olmayan bir ölümə doğru irəliləyin! Bu oxlar düşmənin sizi döyüşə çağırmaq üçün .göndərdiyi peyğamlardır

Şəhadət aşiqləri, Allahın görüşünə vurğun olanlar şiddətli döyüşə girişdilər. Döyüş bir müddət davam etdi. Bir-birinin ardınca həmlələr baş verirdi. Hər dəfə bir şəhidin pak cəsədi yerə düşürdü. Nəhayət, döyüş alovu sakitləşdi, Quran məktəbinin aşiqlərindən .çoxu şəhadət şərbətini içib, əbədi həyata qovuşdular

**ƏLİ ƏKBƏR (əleyhis–salam) MEYDANA GEDİR**

Bəni Haşim tayfasından döyüş üçün icazə alan ilk şəxs İmam Hüseyn (əleyhis-salam)-ın oğlu cənab Əli Əkbər idi. İmam Hüseyn (əleyhis-salam) ona döyüş icazəsi verdi. Əziz oğlunu meydana yola saldı. Bu əziz şəhidə Əli Əkbər (ən böyük Əli) ləqəbi verilmişdi, çünki onun yaşı İmam Səccad (əleyhis-salam)-dan çox idi. Bunu İmam Zeynül Abidin (əleyhis-salam)-ın özü buyurmuşdur: İbni Ziyad o Həzrətə məgər Allah Əlini (Kərbəla hadisəsində) öldürmədi? deyəndə, İmam Səccad (əleyhis-salam) buyurdu: Mənim özümdən böyük bir qardaşım var idi, siz onu öldürdünüz. İbni Ziyad dedi: Yox, onu :Allah öldürdü. İmam Səccad (əleyhis-salam) buyurdu

(Allah, ölüm vaxtı gəlib çatanda canları alar. (Zümər surəsi, ۴۲

Məlumdur ki, bu mübahisə, Əhli-beyt və İsmət hərəminin qadınlarını darül-imarəyə .gətirdikdən sonra baş vermişdi

Bəli, İmam Hüseyn (əleyhis-salam) görürdü ki, əziz oğlu meydana yola düşür, əcəl isə başı üstündə dolanır. Belə olan halda gözlərindən qan-yaş axıtmaqdan başqa bir çıxış yolu görmədi. (Rəvayətdə deyildiyi kimi, gözləri yaşla doldu) İmam Hüseyn (əleyhis-:salam) əllərini göyə qaldırıb dedi

İlahi, şahid ol ki, camaat arasında xilqət, əxlaq və danışıq cəhətindən Sənin Rəsulun Mühəmməd (səlləllahu əleyhi və alihi və səlləm)-ə ən çox oxşayan bir şəxs onlara (düşmənlərə) tərəf gedir. Hər vaxt Sənin Rəsulun yadımıza düşəndə, ona baxardıq. İlahi, yerin bərəkətini onlaradan al, onların arasındakı birliyi təfriqəyə, ittifaqlarını pərakəndəliyə döndər. Onları müxtəlif yollara sal, heç vaxt əmirləri onlardan razı salma, çünki onlar bizi kömək etmək üçün dəvət etmiş, indi isə bizə qarşı çıxıb bizimlə vuruşurlar. øSonra isə Ali İmran surəsinin ۳۳-۳۴-cü ayələrini tilavət etdi:п Həqiqətən Allah Adəmi, Nuhu, İbrahim və İmran övladlarını aləmlərə seçdi. (Bunlar) bir .zürriyyədirlər ki, bir-birindən törənmişlər. Allah çox eşidən və biləndir

Əli Əkbər at üstündə meydana atıldı. O, meydana girəndə düşmənlər fikirlərinə belə gətirə bilməzdilər ki, qəlblərinə sancılacaq ölüm caynağı, yaxud varlıqlarını məhv edən bir ildırımdır ki, qılıncından od tökülür. O, hamını öz şücaəti ilə heyran qoymuşdu. Bəziləri qorxusundan yerində donub

qalmışdı. Allahu Əkbər, təbarəkəllah təkbirləri göyə ucalır, hər tərəfə həmlə edəndə düşmən qaçmağa üz qoyur, onunla qarşılaşmağa cürət etmirdilər. Sağ cinaha hücum edəndə ordakıları sol tərəfə qovur, sonra qoşunun mərkəzinə irəliləyirdi. Beləliklə düşmən qoşunlarından ١٢٠ nəfəri öz qanına qəltan etdi. Əfsus ki aldığı çoxlu zərbələr, axan qanlar və suzuzluq döyüşü davam etdirmək üçün onda güc və taqət qoymamışdı. Son nəfəsdə öz atasının mübarək camalından bir az mənəvi azuqə götürüb Müqəddəs Dərgaha pərvaz etmək istəyirdi, odur ki, gileylənib bədəninə dəymiş ox-qılınc :yaralarından, bu yaraların yaratdığı susuzluqdan şikayət etdi, dedi

Susuzluq məni öldürür, zirehin ağırlığı taqətimi kəsir. Görəsən bir qurtum su varmı ki, !?onu içib qüvvət tapım və düşmənə həmlə edim

İmam Hüseyn (əleyhis-salam) ona bir müqdə verib sakitləşdirdi: Sən ilahi rəhmətin sonsuz dəryasına daxil olmaq ərəfəsindəsən, onun gəmiçisi də cəddin Rəsulullahdır, .səni öz saf canı ilə sirab edəcək ki, bir daha susamayacaqsan

Bunu deyib öz barmağını onun ağzına qoydu. Əli Əkbər yenidən meydana atıldı. Bütün vücudu sadiqanə nur və sevinclə dolmuşdu. Qılıncı ölum quşu kimi düşmən başına enirdi. Nəhayət öldürdüyü kafirlərin sayı ٢٠٠ nəfərə çatdı. İntizar sona çatır, ağ şəhadət göyərçini mübarək başı üstündə pərvaza başlamışdı. Mərrət ibni Mənqəz Əbdi onun başını qılınca hədəf edərək arxadan da kürəyini nizə ilə parçaladı. Əli Əkbər qanına qəltan olmuş halda atın boynundan asılı qaldı. At onu düşmən qoşununun içinə apardı. Allah düşmənlər onun pak bədənini tikə-tikə doğradılar. Son nəfəsdə öz İmamı ilə vidalaşmağı

unutmadı, düşmənin ağır zərbələri altında atasını çağırdı, onun verdiyi vədənin :həqiqətə çevrildiyini söylədi

Bu mənim cəddimdir ki, sizə salam göndərir; o, şərbət badəsi ilə mənə elə bir şərbət içirtdi ki, bir daha susuzmaram. O (cəddim) buyurdu: Sizin üçün də bir cam hazırdır Bu sözü eşidən İmam Hüseyn (əleyhis-salam) şahin kimi oğlunun üstünə gəldi: Peyğəmbər ailəsinin ümidini torpağa düşmüş, qan içində qərq olmuş halda gördü. Atalıq məhəbbəti cuşa gəldi, özünü oğlunun tikə-tikə doğranmış bədəninin üstünə saldı, üzünü onun üzünə qoydu «Həyatının son anları idi, vidalaşmaq üçün fürsət :qalmamışdı. İmam Hüseyn (əleyhis-salam) buyurdu

Bu dünyanın başına səndən sonra kül olsun! Onları mehriban Allaha Rəsulullahın ?hörmətini pozmaqda hansı şey cürətləndirmişdir

Sənin atan, əmin və cəddinə çox ağırdır ki onları çağırasan, onlar da sənə cavab .verməyələr, köməyə çağırasan, fəryadına yetişməyələr

Əli Əkbərin şəhadətindən sonra İmam Hüseyn (əleyhis-salam) Ömər Sədin üstünə :nərə çəkib buyurdu

Allah nəslini kəssin, necə ki mənim nəslimi kəsdin, mənim Rəsulullah ilə olan qohumluğuma baxmadın. Allah səndə bərəkət qoymasın, səni elə

(bir adamın əlinə salsın ki, o sənin başını yatağında kəssin![1]

Sonra İmam Hüseyn (əleyhis-salam) ürəyinin parəsinin–Əli Əkbərin tikə-tikə doğranmış bədənini xeymələrə aparmaq üçün taqəti kəsildi, Bəni-haşim cavanlarını çağırdı ki, onu şəhidlərin xeyməgahına aparsınlar.

## HƏZRƏT ABBAS (əleyhis–salam) DÖYÜŞ MEYDANINDA

Mübarizə bayrağını çiyninə alan axırıncı kəs İmam Hüseyn (əleyhis-salam)-ın qardaşları idi ki, onlardan axıra qalanı təkcə Həzrət Abbas (əleyhis-salam) oldu. O, ucaboylu, gözəl surətli bir kişi idi ki, ata minəndə ayaqları yerə çatırdı. Onun künyəsi Əbülfəzl, ləqəbləri Səqqa, Qəməri bəni Haşim idi və Kərbəla bayraqdarı hesab olunurdu. Qəməri bəni-Haşim şücaət nümunəsi, həmlə və döyüş aslanı idi. Onun heybətliliyi, qorxmazlığı üzündən sezilirdi. Həzrət Abbas uşaqların susuzluqdan çəkdikləri nalələri eşidib İmam (əleyhis-salam)-ın düşmənin dərya kimi ordusu arasında tək qaldığını görəndə səbir kasası doldu, yaralı bir aslan kimi irəli atılaraq, Həzrətin qarşısında durub meydana getmək üçün izn istədi. Seyyidüş-şühəda onun şəhadət bağına pərvaz etmək istədiyini görəndə, izn verib buyurdu:



---

۱- Lühuf, səh.۶۳; Təzəllümüz-Zəhra, səh.۱۱۶. Əbil-fidanın tarixi kitabında ۶۶-cı ilin[۱۲۲] hadisələrində qeyd olunur ki, Muxtar Ömər Sədi və onun oğlu Həfsənin başını (Ömər Sədin başını yatağında ikən) kəsmişdir.

.Sən mənim bayraqdarımsan, lakin bu uşaqlar üçün bir az su tap

Həzrət Abbas (əleyhis-salam) su məşkini əlinə alıb, ata minərək Fərata sarı yola düşdü. O, qoşundan heç də qorxmurdu. Suyun yanındakı mühafizəçiləri dağıdıb suya yaxınlaşdı. Suyun sərinliyini hiss edib ovcunu su ilə doldurdu. Amma içmək istəyəndə, İmam (əleyhis-salam)-ın və uşaqların susuzluğunu gözləri önündə canlandırdı. Suyu ovcundan yerə tökməyi özünə vacib bildi. Səy etdi ki, tez bir zamanda suyu susuzluqdan ciyərləri yanan, dodaqları quruyan uşaqlara çatdırsın. Bu zaman düşmən qoşunu ona həmlə etdi. Buna baxmayaraq o, qılınc zərbələri ilə düşməni yolun üstündən qovurdu. Bu vaxt Yəzid ibni Rəca Cühəni, Hükeym ibni Nofəlin köməyi ilə Əbülfəzl (əleyhis-salam)-ın yolu üstündə pusqu qurub, qəfildən ona həmlə etdi və sağ qolunu vurdu. Əbülfəzl (əleyhis-salam) qılıncı sol əlinə alıb yenidən döyüşə girişdi, :buyurdu

And ona Allaha, sağ qolumu vursanız da, yenə sizdən əl çəkməyəcəyəm; öz dinimi, həqiqətən yəqinə çatmış İmamımı, doğruçu və əmin Peyğəmbərin nəvəsini himayə .edəcəyəm

Bu vaxt Hükeym ibni Tüfeyl xurma ağacının arxasında pusquda idi, yerindən atılıb Əbülfəzl (əleyhis-salam)-ın sol qolunu da qılıncla vurub saldı. Həzrət bayrağı və su məşkini sinəsinə yapışdırdı. Düşmən ona hücum etdi, yağış kimi yağdırdılan oxlar o Həzrətin kürəyinə sancılırdı. Bu vaxt bir ox su məşkinə, bir ox mübarək sinəsinə, bir ox isə sağ gözünə sancıldı«. Namərdlərdən biri həmlə edib əmudla onun mübarək başına zərbə endirərək başını

:qana qəltan etdi« Daha tab gətirə bilməyib uca səslə fəryad etdi

(Məndən sənə salam olsun, ya Əba Əbdillah!(١)

Seyyidüş-şühəda (əleyhis-salam) qardaşının səsini eşidəndə, şahin kimi başının :üstünü alıb buyurdu

Bax indi belim sındı, çarəm azaldı, düşmənim mənə şəmatət etməyə başladı« Sonra (sınıq qəlb, qəm-qüssə qonmuş üz, göz yaşı dolmuş gözlə xeymələrə qayıtdı(٢)

## ƏLİ ƏSĞƏRİN ŞƏHADƏTİ

Əli Əsğər (Əbdüllah) südəmər çağında Kərbəlada şəhid oldu. İmam Hüseyn (əleyhis-salam)-ın dostları, köməkçiləri şəhid oldu. Həzrət tək qalıb ilahi təqdirə (qəzavü-qədərə) razı oldu və özünün məzlumcasına, faciəli şəkildə susuz öləcəyini bir daha dərk etdi. Əhli-hərəmin yanına gəlib onlarla vidalaşdı. Buyurdu ki:–Bəla və müsibət paltarını geyin, səbir paltarını yırtmayın. Allah sizin aqibətinizi xeyir, gözəl edərək, .düşmənlərinizi (dünya və axirətdə) cürbəcür əzablara düçar edəcəkdir

İmam Əli Əsğərlə vidalaşmaq istədikdə Həzrət Zeynəb (əleyha-salam) uşağı gətirdi, :İmam (əleyhis-salam) onu qucağına alıb üzündən öpdü, buyurdu

!Cəddin Mustəfanın düşməni olan bu qövm Allah rəhmətindən uzaq olsun



---

Təzəllümüz-Zəhra, səh.١٢٠[١٢٣] -١

Kibriti-əhmər, ١-ci cibd, səh.١٥٩[١٢٤] -٢

Sonra onu qoşununun qarşısına gətirdi ki, bəlkə uşağa rəhm edib ona içməyə su verələr. Amma məlun Hərmələ boğazının altını nişan alıb oxu atdı, ox Əli Əsğərin boğazına sancıldı. İmam (əleyhis-salam) əlini onun boğazından axan qanın altına tutaraq, ovcunu qanla doldurub göyləyə səpdi, bir qətrə olsun belə, o qandan yerə :qayıtmadı(۱). Bu halda İmam (əleyhis-salam) buyurdu

.Bu müsibəti mənə asan edəcək şey budur ki, (bu iş) Allahın gözü qarşısında olmuşdur

İlahi, bunu Öz yanında anasından ayrı düşmüş bala dəvədən heç də az sayma! İlahi, əgər (Öz) köməyini bizdən kəsmisənsə, onda onu, daha da yaxşı olan bir şeyin əvəzi et !və bizim intiqamımızı zalımlardan al

.Bu fani dünyada bizə nazil etdiklərini axirətimiz üçün zəxirə et

Bu anda qeybdən səs gəldi: Hüseyn! Onu yerə qoy, behiştdə onun üçün dayə (hazırdır.(۲



---

Bu, İmam Baqir (əleyhis-salam)-ın buyurduğudur. İmam Zaman (əleyhis-[۱۲۵] -۱ salam) da onun ziyarətnaməsində belə buyurmuşdur: Salam olsun Əbdullaha (Əli Əsğərə) ki, onu oxa hədəf etdilər və atasının ağuşunda qətlə yetirdilər. Allah lənət eləsin Hərmələ ibni Kahil Əsədiyə ki, ona ox atdı; Allah onun qohum-əqrəbasına da lənət etsin

Lühuf, (İbni Tavus); Bihar, ۱۰-cu cild; Mənaqib, ۲-ci cild; Məsirül-əhzan,[۱۲۶] -۲ Təzəllümüz-Zəhra, Müntəxəbi-ibni-Hərir, Təzkirətül-xəvass və Təbərsinin Ehticac .kitablarından istifadə olunub

## DÜNYA MÖMİNƏ ZİNDANDIR

İbni Babəveyh İmam Baqir (əleyhis-salam)-dan rəvayət etmişdir ki, İmam Zeynəl-Abid (əleyhis-salam)-ın buyurub: Aşura günü düşmən qoşunu çox qorxurdu, halbuki sayları İmamın qoşununun sayından qat-qat çox idi və onları tam mühasirədə saxlamışdılar. Amma qəlbləri çox qorxaq, rəngləri qaçmış, ayaqları lərzəyə düşmüşdü. Lakin İmam Hüseyn (əleyhis-salam) və onun silahdaşlarının üzü sevinclə dolu idi, rəngləri qparlamış, qəlblərində xatircəmlik, aramlıq daha da çoxalmışdı. Səhabələrdən bəziləri deyirdilər ki, İmam Hüseynə (əleyhis-salam) baxın, ölümdən qorxusu yoxdur və şəhadəti arzulayır. İmam Hüseyn (əleyhis-salam) onların sözlərini eşidib xitabən buyurdu:–Səbr edin, ey əziz övladlarım! Ölüm sizin üçün bir körpü köimidir, ondan keçib pis vəziyyətdən əbədi nemətlərə, əbədi behiştə yollanacaqsınız, Sizlərdən kimdir ki zindandan qəsrlərə köçmək istəməsin? Ölüm sizin düşmənləriniz üçün isə qəsrlərdən zindana, əzaba getmək kimidir. Atam mənə xəbər vermişdir ki, Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm) belə buyurmuşdur: Dünya möminin zindanı, kafirlərin cənnətidir. Ölüm möminlərin behiştə, kafirlərin isə öz əzablarına doğru uzanan körpüsüdür. Mən heç vaxt yalan deməmişəm və ata-babalarımdan da yalan .eşitməmişəm

səh:۲۲۴

## İMAM HÜSEYN (əleyhis–salam)–IN SƏHABƏLƏRİ BEHİŞTDƏ ÖZ YERLƏRİNİ GÖRMÜŞDÜLƏR

İbni Babəveyh yazır: Bir nəfər İmam Sadiq (əleyhis-salam)-dan soruşdu:–Yəbnə Rəsulillah, İmam Hüseyn (əleyhis-salam)-ın səhabələri öləcəklərini bildikləri halda nə ?üçün cihada başlayıb qorxusuz olaraq özlərini döyüş dəryasına vururdular

İmam Sadiq (əleyhis-salam) buyurdu:–Çünki, onların gözlərindən pərdə götürülmüş, behiştdəki mənzil və məqamlarını görmüşdülər, buna görə də döyüşə getməkdə bir-.birindən qabağa keçirdilər ki, şəhadətə yetərək öz mənzillərənə çatsınlar

Qütb Rəvəndi Əbu Həmzə Somalidan nəql etmişdir ki, İmam Səccad (əleyhis-salam) belə buyurub: O gecə (ki, onun sabahı atam şəhid oldu) atamın yanında idim. İmam həmin gecə öz səhabələrinə buyurdu:–Gecə düşmüş, geri dönmək yolu sizin üçün açılmışdır. Bu gecəni qənimət sayıb gedin. Bu zalımlar məni tələb edirlər, başqa heç kimlə işləri yoxdur. Əgər məni öldürsələr, sizin dalınızca gəlməyəcəklər. Mən öz .beyətimi sizin boynunuzdan götürdüm

İmam Hüseyn (əleyhis-salam)-ın səhabələri dedilər:–Allaha and olsun, bu olası bir iş !deyildir

İmam (əleyhis-salam) buyurdu:–Sabah hamınız öldürüləcəksiniz və heç biriniz canını .qurtara bilməyəcəkdir

Hamılıqla dedilər:–Allaha şükr edirik ki, bizə səninilə şəhid olmaq kimi böyük bir neməti !kəramət etmişdir

İmam (əleyhis-salam) onlara dua edib buyurdu:–Başınızı göyə qaldırıb yuxarı baxın. Elə ki, başlarını qaldırdılar, öz dərəcə və mənzillərini görüb tanıdılar, onlar üçün hazırlanmış huri, qəsr və nemətləri müşahidə etdilər. Elə bu səbəbə görəə onlar Aşura günü nizə və şəmşirlərə doğru gedirdilər ki, öz mənzillərinə daha tez çatıb əbədi nemətlərdən bəhrələnsinlər. Əbu Həmzə Somali deyir ki, İmam Səccad (əleyhis-salam) buyurdu: İmam Hüseyn (əleyhis-salam)-ın o günü kimi gün bir daha gəlməz: bu ümmətdən olduqlarını iddia edən otuz min namərd o məzlum İmamı araya aldılar, hər biri onun qanını axıtmaqla Allaha yaxınlaşmaq istəyirdi (yəni onu qürbətən iləllah niyyəti ilə öldürmək istəyirdilər). İmam Hüseyn (əleyhis-salam) onlara movizə etdi və Allahı onların yadına saldı, lakin onlar nəsihəti qəbul etməyərək həzrətdən əl .çəkmədilər, nəhayət onu zülm ilə öldürdülər

İmam Səccad (əleyhis-salam) sonra buyurdu:–Allah rəhmət etsin əmim Abbasa, canfəşanlıq etdi, igidlik göstərdi və canını öz qardaşına qurban etdi, nəhayət qollarını qılıncla vurdular. Sonra Allah onun qollarının əvəzində ona iki qanad kəramət etdi, o qanadlarla məlaikələrlə birlikdə behiştdə pərvaz edir. Necə ki, Allah Cəfəri Təyyara iki qanad vermişdi. Həqiqətən Abbas (əleyhis-salam)-ın Allah yanında elə böyük mənziləti .vardır ki, bütün şəhidlər qiyamət günü o məqamı arzu edəcəklər

Tarixçilər qeyd etmişlər ki, İmam Hüseyn (əleyhis-salam) döyüş meydanından kənarda bir xeymə qurmuşdu ki, səhabə və Əhli-beytdən olan şəhidləri oraya aparırdı, :hər şəhidi ora gətirəndə buyururdu

(Bu cür ölüm Peyğəmbərlərin və onların övladlarının ölümünə bənzər.(١)

Təkcə qardaşı Abbası atdan düşdüyü yerdə, Fəratın yaxınlığında qoymuşdu ki, şərif qəbri də elə oradadır. Bunun bir sirri vardırsa, o da bəsirəti olanlara gizli deyil: Qəməri-Bəni Haşimin məzarının ayrı olmasının səbəbi budur ki, ziyarətçilər onu ziyarət etməyə tələssinlər, hacətləri olanlar ora pənah aparsınlar və onun kəramətlərini görməklə ümmət onun Allah yanında olan qədir-qiymətini, məqam və mənzilətini dərk etsinlər. Burada Allahın vəlisi, höccəti istəmişdir ki, Əbülfəzl (əleyhis-salam)-ın zahiri məqam-mənziləti elə onun mənəvi və axirət məqamı səviyyəsində olsun. Əgər İmam Hüseyn (əleyhis-salam) onu sair şəhidlər kimi müqəddəs evə (öz hərəminin yanına) aparsaydı, bu parlaq ulduz İmam (əleyhis-salam)-ın günəş nurlu vücudunun nurunda qərq .olacaqdı

### İMAM HÜSEYN (əleyhis–salam)–IN VİDALAŞMASI

:İmam Hüseyn (əleyhis-salam) son vidalasında hərəmdəki xanımlara buyurdu

Qəm paltarı geyib bəlalar üçün hazırlaşın. Bilin ki, Allah sizin hamınızın mühafizəçisidir. O, sizə düşmənlərin şərrindən nicat verəcək, işlərinizin aqibətini xeyir, gözəl edərək, düşmənlərinizi cürbəcür əzablara mübtəla edəcəkdir. Bunların müqabilində sizə cürbəcür nemətlər, kəramətlər



---

.Biharül-ənvar, ١٠-cu cild[١٢٧] -١

əta ediləcəkdir. Elə isə şikayətlənərək qədir-qiymətinizi azaldacaq sözləri dilinizə (gətirməyin.(١)

Düşmənlərin yırtıcılıq xislətindən tam agah olan İmam Hüseyn (əleyhis-salam) mübarizənin son dəqiqələrində xeymələrə qayıdıb, buyurdu:–Mənə nimdaş və köhnə bir paltar verin, paltarlarımın altından geyinim. Mən öləndən sonra heç kim ona tamah .gözü dikməsin

İmam (əleyhis-salam) meydana sarı yola düşüb düşmənlə qəhrəmancasına döyüşdü, .onlardan o qədər qırdı ki, hamısı qaçmağa məcbur oldular

**İMAM HÜSEYN (əleyhis–salam)–IN ŞƏHADƏTİ**

Nəhayət Şimrin əmri ilə qoşun kütləvi şəkildə İmam Hüseyn (əleyhis-salam)-a tərəf hücum çəkib onu mühasirəyə saldılar. Oxçular hər tərəfdən o Həzrətə ox yağdırmağa başladılar. O qədər ox vurdular ki, İmamın müqəddəs cismi oxların çoxluğundan görünmürdü. Şimr öz qoşunu ilə İmamı (əleyhis-salam) xeymələrdən ayırdı, amma o Həzrətin azadlıqsevər ruhu heç də icazə vermirdi ki, öz sağlığında övladlarına, :xanımlara və xeymədəkilərə bir zərər yetişsin. Buna görə də uca səslə fəryad etdi

Vay olsun sizə, ey Əbu Süfyan övladlarına tabe olanlar! Əgər dininiz yoxdursa və qiyamat günündən qoxmursunuzsa, heç olmasa bu dünyada azad insan olun, öz milli keçmişinizə



---

(Cəlaül-üyun (Əllamə Məclisi[١٢٨] -١

.hörmət qoyun; özünüzü ərəb tayfasından hesab edirsinizsə

Bu kəskin fəryad çəkic kimi düşmənlərin başına dəydi. Şimr əmr etdi ki, geri qayıtsınlar. Yaralar bir-birinin ardınca İmamın mübarək cisminə endirilirdi, qan o Həzrətin bədənindən fəvvarə kimi axırdı. Həzrətin həyatının son anları idi. Bu dəmdə Saleh ibni Vəhəb nizə ilə İmam (əleyhis-salam)-a həmlə edib o Həzrətin bel sümüyünü sındırdı. İmam (əleyhis-salam) atdan yerə yıxıldı. Bu hadisəni görən Həzrət Zeynəb (əleyha-salam) özünü Ömər Sədə yetirib dedi:–Ey Ömər, sənə yaraşarmı ki, Əbu Əbdillahı ?öldürsünlər, sən də durub baxasan

Ömər Səd heç nə demədi. Bu halda Həzrət Zeynəb fəryad edib dedi:–Sizin aranızda bir ?müsəlman yoxdurmu

İmam Hüseyn (əleyhis-salam) piyada döyüşü davam etdirir, özünü nizə və oxlardan qoruyaraq yenidən düşmənə həmlə edirdi. Bu zaman Kufə qoşununa xitab edərək son sözlərini buyurdu:–Məni öldürmək üçün yığışmısınızmı? Allaha and olsun, məndən sonra Allah bəndələrindən heç birini öldürməyəcəksiniz. Allah məni öldürdüyünüzə görə sizə qzəblənəcəkdir. Aləmlərin Allahına and olsun, mən ümidvaram ki sizin namərdliklərinizin qarşısında Allah məni əziz edəcək, mənim intiqamımı sizdən elə alacaqdır ki, özünüz də dərk etməyəcəksiniz. Agah olun, mənim öldürülməyim səbəbi ilə içərinizdə qan axıdılması çoxalacaq, mütəal Allah Öz qəzəbini sizə artıracaq, .nəhayət ağır, kəskin axirət əzabına düçar olcaqsınız

Yazırlar ki, İmam (əleyhis-salam)-ın bədəninə ٧٢ yara vurmuşdular. Zəiflik o Həzrətə qələbə çalırdı. O, bir anlığa dincini almaq üçün dayandı. Bu anda

uzaqdan ona tərəf bir daş atdılar. Daş mübarək alnını yardı, qan üzünə axdı, İmam (əleyhis-salam) köynəyini qaldırıb alnının qanını silmək istəyirdi ki, bu vaxt üç şöbəli bir ox o Həzrətin qəlbinə sancıldı. Həzrət döyüşdən dayandı, üzünü göyə qaldırıb dedi: İlahi, Sən bilirsən ki, bunlar elə bir şəxsi öldürürlər ki, yer üzündə ondan başqa .Peyğəmbərin heç bir oğlu yoxdur

İmam (əleyhis-salam) oxu qəlbindən çıxartdı, qan fəvvarə kimi axmağa başladı. Heç kim o Həzrətə yaxınlaşmağa cürət etmirdi. Çünki İmam Hüseyn (əleyhis-salam)-ın qatili kimi Allah dərgahında sorğu-suala tutulmaqdan qorxurdular. Şimr nərə çəkdi:– Vay olsun sizə, nə üçün durmusunuz? Analarınız matəminizdə otursun. İrəli gedib işi !birdəfəlik qurtarın

Atlılar, piyadalar hər tərəfdən o Həzrətə hücuma başladılar. İrəli gələn ilk şəxs İmam (əleyhis-salam)-ın zərbəsi ilə həlak oldu. İkinci şəxs onun çənəsini yaraladı. Sənan ibni Ənəs həyasızcasına irəli çıxıb nizəsi ilə İmam (əleyhis-salam)-ın sinəsini yardı. Sonra bir ox atdı, ox Həzrətin mübarək boğazına sancıldı. İmam Hüseyn (əleyhis-salam) yerə oturdu, əlləri ilə qanını üzünə yaxıb buyurdu: Bu halda Pərvərdigarımın körüşünə !gedəcəyəm, halbuki, bunlar mənim haqqımı qəsb etmişlər

Hilal ibni Nafe deyir: Mən Ömər Sədin ləşkərində idim ki, birdən belə bir səs eşitdim: Ey !əmir, muştuluğumu ver, Şimr Hüseyni qətlə yetirdi

O əzizlər qan içində çabalayırdılar, Kufə yırtıcıları onların bədənlərinnin bəndlərini bir-birindən ayırırdılar Seyyidüş-şühədanın mübarək bədənində ox, qılınc zərbəsindən sağ yer qalmamışdı, qanlı Kərbəla elə şəhidlər oylağı idi ki, nə bir peyğəmbərə, nə də peyğəmər canişininə nəsib olmamışdı və ilahi qəzavü-qədərdə yalnız şəhidlər sərvəri (İmam Hüseyn (əleyhis-salam) bu oylağın ləyaqətinə nail oldu. Kərbəla elə bir yer idi ki, təkcə yer sakinləri deyil, həm də səma əhlini, mələkləri də heyrətə salmışdı. İmam Riza (əleyhis-salam)-ın buyurduğu kimi, bu gün (Aşura) elə bir gün idi ki, İmam əbədi (olaraq gözləri yaralı, ağlar qəlbləri qanlı etmişdir(١)

:Rəsuli Əkrəm (səlləllahu əleyhi və alihi və səlləm) bu barədə belə buyurmuşdur

Həqiqətən İmam Hüseyn (əleyhis-salam)-ın qətli səbəbilə möminlərin qəlbində bir (hərarət (iman odu) vardır ki, heç vaxt sönməz.(٢)

İmam Hüseyn (əleyhis-salam)-ın qızı xanım Səkinə deyir: Düşmən şəhidlərin arvad-uşaqlarını cənazələrin arasından çıxaran vaxt, özümü atamın cənazəsi üstünə atıb :bağrıma basdım. Bu vaxt müqəddəs hülqumundan bu səsi eşitdim

Şiələrim! Hər vaxt sərin su içəndə, məni yad edin; bir qərib, yaxud şəhid barəsində (eşidəndə mənə ağlayın.(٣)

İmam Hüseyn (əleyhis-salam)-ın müqəddəs qiyamının hədəflərindən biri bu idi ki, əməvilərin İslam Peyğəmbərinin adı altında camaata hökmranlıq



---

Əl-İsabə (Şeyx Səduq) səh ٧۶[١٢٩] -١

Müstədrəkül-vəsail c.٢ səh ٢١٧[١٣٠] -٢

.Misbahü-Kəfəmi, səh ٣٧۶[١٣١] -٣

edən rüsvayçı işgəncələrinə son qoyulsun, onların müsəlmanlara rəhbərlik üçün ləyaqətsz olduqlarını, bu iş üçün azacıq olsa belə insani və ürfi nişanələrə malik olmadıqlarını isbat etsin. Bu hədəflər onların son dərəcədə daşürəkli, qəsavətli olmalarını, onların törətdikləri cinayət və faciələrini açıb göstərməklə mümkün olacaqdı. Heç kim hətta adi bir şəxsə belə bu cür faciə və cinayətləri rəva görməzdi, o ki qala Peyğəmbər camalının aynası, böyük Əhmədi xülqünün nişanəsi! İmam Hüseyn (əleyhis-salam) isbat etdi ki, belə faciələrə əl atmaq ilahi namus məcralarından inhirafa yuvarlanmaqdır ki, bu iş fəzilət mələkələri dairəsindən uzaqdır. Onların hətta heyvanlarda da müşahidə olunmayan bu əməlləri göstərir ki, heç bir dəlillə İslam .ümmətinə hakim olmaq ləyaqətləri olmamışdır

## ŞƏHİDLƏRİ İMAM SƏCCAD (əleyhis–salam) DƏFN EDİR

Məhərrəm ayının ١٣-də Həzrət Səccad (əleyhis-salam) şəhid olmuş atasını dəfn etmək üçün Kərbəlaya tələsdi. Buna görə ki, hər İmamın qüsl və kəfənini İmamdan başqası .öhdəsinə ala bilməz

Bu sözümüzün şahidi İmam Riza (əleyhis-salam)-ın Əliyyibni Əli Həmzə Bətainini söhbətidir. İmam Riza (əleyhis-salam) ona dedi:–De görüm Hüseyn ibni Əli İmam ?idimi

.Həmzə:–Bəli

İmam Riza (əleyhis-salam) buyurdu:–O şəhid olandan sonra (onun qüslü, kəfəni, ?dəfni) kimin öhdəsinə idi

.Həmzə:–Həzrət Səccad (əleyhis-salam)-ın

?İmam Riza (əleyhis-salam):–O vaxt Həzrət Səccad harada idi

Həmzə:–İbni Ziyadın zindanında idi, amma o xəbər tutmadan oradan çıxdı, gedib .atasını dəfn etdikdən sonra yenidiən ziyndana qayıtdı

İmam Riza (əleyhis-salam) soruşdu:–Əliyyibni Hüseynin Kərbəlaya gəlməsinə, atasını dəfn edib yenidən qayıtmasına qüdrət verən øAllahп bu zamanın da İmamına qüdrət verər ki, Bağdada gedib atasının (İmam Museyi Kazimin) dəfn işini yerinə yetirə. (Halbuki o (zamanın İmamı) nə həbsdə, nə də əsirlikdə deyildi.(١)

İmam Səccad (əleyhis-salam) Kərbəlaya çatdıqda Bəni Əsəd qəbiləsinin sərgərdan, .bədənlərdə baş olmadığı üçün, donub qaldıqlarının şahidi oldu

Həzrət Səccad (əleyhis-salam) şəhidləri adbaad tanıtdırdı. Ah-nalə, ağlaşma səsləri ucaldı. Bəni Əsəd qəbiləsinin arvadları saçlarını yolaraq sinələrinə döyürdülər. Sonra Həzrət o məzlum atasının pak cənazəsinə tərəf gedib onu bağrına basdı və hönkür-hönkür ağlamağa başladı. Cənazəni qəbir qazılacaq yerə gətirdi. Bir az torpaq götürdü ki, nagəhan hazır edilmiş bir qəbir açıldı ki, üstündə də üstü açıq zərih görünürdü. Həzrət

.cənazənni təklikdə qəbrə qoydu



---

.İsbatül-vəsiyyət, (Məsudi) səh ١١٣[١٣٢] -١

Bəni Əsəddən heç kim bu işdə İmam Səccada kömək etmirdi) Sonra buyurdu:) .Yanımda bir kəs (mələk) var ki, mənə kömək edir

Cənazəni qəbrə qoyandan sonra dodaqlarını atasının kəsilmiş damarlarına :yaxınlaşdırıb, buyurdu

Xoş o yerin halına ki, sənin pak cəsədini ağuşuna alıb. Sənə nədən deyim: Yuxusuz gecələrdənmi? Yoxsa axırı görünməyən qəm-qüssəmdənmi? Məndən sənə salam !olsun, ey Rəsulullahın oğlu, Allahın rəhmət və bərəkəti olsun sənə

:O, İmam Hüseyn (əleyhis-salam)-ın qəbri üstündə belə yazdı

.Bu, Hüseyn ibni Əliyyibni Əbitalibin qəbridir. Onu susuz və qərib öldürdülər

Sonra əmisi Abbas (əleyhis-salam)-a tərəf gedərək onu, vəziyyətindən asimanda mələkləri dəhşətdə bürümüş, behişt hurilərini ağlar etmiş halda gördü. Əyilərək :əmisinin boğazının kəsilmiş damarlarını öpüb, dedi

Ey Qəməri Bəni Haşim, səndən sonra kül olsun bu dünyanın başına! Məndən sənə xalis !salam olsun, ey şəhid! Allahın rəhməti olsun sənə

Sonra Həzrət Abbas (əleyhis-salam) üçün də bir qəbir qazıb buyurdu: Mənim yanımda .köməkçilərim var

O Həzrət bəni Əsəd qəbiləsinə buyurdu ki, iki böyük qəbir qazsınlar: birində Bəni .(Haşimin, digərində isə səhabələri dəfn etsinlər(۱

səh:۲۳۴

---

Seyyid Nemətullah Cəzairi Əl-ənvarün-nömaniyyə kitabında (səh.۳۴۵) qeyd[۱۳۳] -۱ etmişdir ki, Şah İsmayıl Səfəvi (Xətai) Bağdadı fəth edəndən sonra İmam Hüseyn (əleyhis-salam)-ın ziyarətinə gedir. Ona xəbər çatır ki, alimlərdən bəzisi Hürrün tövbəsi məqaləsini qəbul etmirlər. Əmr edir ki, qəbri açsınlar. Qəbri açanda görürlər ki, elə bil indicə şəhid olmuş, bədəni də çürüməmişdir. Onun başında bir parça olduğunu görürlər. Şah İsmayıl onu təbərrük üçün açıb götürmək istəyirdi. Elə ki açır, yaradan

qan axmağa başlayır. Nə qədər çalışırlarsa və başqa parçalarla bağlayırlarsa, qanı saxlaya bilmirlər. Yalnız İmamın (əleyhis-salam) bağladığı parça ilə bağladıqdan sonra .qanı dayanır

Hürr şəhadətə yetişdikdən sonra qohumları onu döyüş meydanından çıxararaq indiki qəbri olan yerə gətirmişlər. Yazıblar ki, Hürrün anası döyüş meydanında imiş, görəndə ki düşmənlər şəhidlərin başlarını kəsib bədənlərini tapdalayırlar oğlunu bu yerə gətirmişdi.(١)

## İMAMLAR ALLAH ƏMRİNƏ TABEDİRLƏR

Səffar deyir: Bir gün İmam Baqir (əleyhis-salam)-ın səhabələri onun hüzurunda olduqları vaxt Həzrət buyurdu: Bizim vilayətimizi (rəhbərlik haqqımızı) qəbul edib bizi İmam bilərək bizə itaət etməyi Allaha itaət etmək kimi özlərinə vacib edən, lakin öz əməllərində süstlük, səhlənkarlıq etməklə bizim məqamımızı alçaldan, məqamımızı bilib tanıyanlara, bizim fəzilətimizi bəyan edənlərə irad tutub onlara mübaliğə nisbəti verənlərə təəccüb edirəm. Güman edirsiniz ki, aləmlərin Allahı Öz dostlarına itaət etməyi, tabe olmağı xalqa vacib edib asimanların və



---

١- Əsrarüş-şəhadət[١٣۴]

yerin xəbərlərini (İmamlardan) gizli saxlayıb baş verəcək hadisələri onlara xəbər ?verməsin

Həmran dedi:–Canım sənə fəda olsun, mənə xəbər ver görüm Əliyyibni Əbitalib, Həsən və Hüseyn (əleyhimüs-salam) Allah dini yolunda qiyam etdilər, halbuki, zülm, ?tüğyan əhli onlara zəfər çaldı. Bu necə olan işdir

Həzrət Baqir (əleyhis-salam) buyurdu:–Ey Həmran! İlahi elmdə belə yazılmış, qəzavü-qədərdə belə qərar qoyulmuşdu. Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm)-in buyurduğuna görə Bizdən (İmamlardan) xüruc (qiyam) edən və sakit olan şəxs elm və agahlıq üzündən xüruc etmiş, elm və agahlıq üzündən sakit olmuşlar. Ey Həmran, bəla nazil olanda və zülm əhli onlara (İmamlara) qələbə çalanda, əgər onlar Allahdan tüğyançıların səltənətini məhv etməsini istəsəydilər, hökmən qəbul edər və bəlaları onlardan dəf edər, tüğyançıların səltənətini təsbehin ipinin qırılıb dənələrinin bir-birindən ayrılmasından daha tez bir zamanda məhv edərdi. Amma İmamlar (əleyhimüs-salam) təslim olaraq razılıq məqamında idilər və Allahın onlar üçün məsləhət gördüyü işlərdən qeyrisini istəmirdilər. Ey Həmran, onlara üz verən (müsibətlər) günah üzündən deyildi ki, o günahı görmüş olalar, yaxud Allahla müxalifət etməmişdilər ki, onun cəzasına çatmış olaydılar. Lakin bu müsibətlərin səbəbi bu idi: Allah istəyirdi ki, onlar müxtəlif çətinliklər vasitəsi ilə behiştdə yüksək (mənəvi) məqamlara çatsınlar. Ey Həmran, onların barəsində pis fikirləşmə, Aşura günü İmam Hüseyn (əleyhis-salam)-ın dostları, köməkçiləri qılınc və nizə zərbələrindən özlərində :heç bir dərd, ağrı hiss etmirdilər. Bu barədə İmam Baqir (əleyhis-salam) buyurdu

Cəddim Hüseyn (əleyhis-salam)-ın fədakar köməkçiləri düşmənin qılınc və nizə .zərbələri altında ağrı hiss etmirdilər

## ƏHLİ–BEYT KUFƏYƏ DAXİL OLUR

ci ilin məhərrəm ayının ١١-ci günü, İbni Səd öz ölülərinin cəsədlərini kəfənə bükdü,-٦١ onlara meyit namazı qılıb hamısını bir yerdə basdırdı. Lakin şəhidlərin parça-parça olmuş bədənlərini gün altında qoyaraq öz qoşunla birlikdə Kufəyə sarı yollandı. Kufə darvazasına çatanda, İbni Ziyadın tərəfindən göndərilən qasid ona dedi:–Bu gün !əsirləri şəhərdən kənarda saxla

Übeydullahın bu işdən məqsədi bu idi ki, əsirlərin şəhərə girməsi üçün lazım olan şəraiti tənzim etsin. Məhərrəmin ١٢-də Əhli-beyt əsirləri Kufəyə gətirildi, əsirlərin .qabağında ٧٢ kəsik baş nizələrə vurulmuş halda aparılırdı

Şimr ibni Zilcövşən sevinc, şadlıq bürümüş halda hamıdan qabaq atını çapır, öz ətrafındakılara əmr edirdi ki, camaatı nəzarət altında saxlasınlar. Arvad-kişi, böyük-.kiçik hamı əsirlərə tamaşa etmək üçün yol ətrafında durmuşdular

Əsirlər şəhərə daxil olanda camaat nizələrdə İmam Hüseyn (əleyhis-salam)-ın, Həbib ibni Məzahirin, Müslüm ibni Ovsəcənin başlarını görüb tanıdılar. Sonra Əhli-beyt arvad-uşaqlarını, Həzrət Zeynəbi, Ümmü-Gülsümü gördülər. Camaatın gözündən .həsrət və peşmançılıq yaşı axırdı

Tamaşaçılardan bəziləri deyirdilər:–Lənət olsun sizə, ey alçaq yırtıcılar! Rəsulullahın ciyərinin

parəsini dəvət etdiniz, sonra öldürdünüz, arvad-uşağını Roma əsirləri kimi özünüzlə .gətirdiniz

.Ağlaşma səsi hər tərəfi bürümüşdü»

## HƏZRƏT ZEYNƏB (əleyha-salam)-IN XÜTBƏSİ

Nagəhan əsirlərin içərisindən Zeynəbi Kübra (əleyha-salam) əli ilə onların sakit olmalarını işarə etdi. Hamı onu tanıyırdı. O, Əmirəl-möminin (əleyhis-salam)-ın qızıdır, uzun illər Kufədə elə bu camaatın yanında yaşamışdı. Hamı onun ehtiramına sakit oldu, hətta dəvələrin zınqırovlarının səsi də kəsildi, qorxunc bir sükut hər yeri :bürümüşdü. Birdən o alimə xanım sözə başladı

Həmd olsun Mütəal Allaha, salam olsun Mühəmməd Rəsulullah (səlləllahu əleyhi və .alihi və səlləm)-ə, onun övladlarına, yaxşı və pak insanlara

Ey kufəlilər! Ey hiyləgər və riyakar camaat, ey vəfasızlar və əhd-peyman pozanlar! Bizə görəmi ağlayır, göz yaşı axıdırsınız? Bizə təəssüflənirsinizmi? Həmişə göz yaşınız axar olsun, nalələriniz kəsilməsin. Bizim gözlərimizi ağlar qoyub, qəlbimizə əbədi dağ vurdunuz. Siz saçlarını qəşəng darayan, sonra isə hörüklərinin hamısını açıb bir-birinə qarışdıran dəli arvadlara oxşayırsınız. Siz əvvəl də məkr və hiylə ilə saçlarınızı möhkəm hördünüz, sonra isə açdınız. İçinizdə yalandan, xudbinlikdən, fitnə-fəsaddan, .düşmənçilikdən başqa bir şey yoxdur

Siz kənizlər kimi yaltaq, düşmənlər təki hiyləgərsiniz. Siz eynilə zibillikdə köyərən .bitgiyə, qəbrə zinət verən gümüşə bənzəyirsiniz

Doğrudan da axirətiniz üçün nə qədər də pis azuqə toplamısınız! Çünki Allahı qəzəbləndirmiş, özünüz üçün əbədi əzab hazırlamısınız. Bizi öldürəndən sonra halımıza ağlayırsınız? Allaha and olsun ki, ağlamağa layiqsiniz; çox ağlayıb, az gülün; çünki siz adınıza elə əbədi rüsvayçılıq damğası vurmusunuz ki, su belə onu pak edə bilməz. Xatəmən-nəbinin ciyər parəsini, behişt əhlinin cavanlarının ağasını, öz əməlisaleh adamlarınızın pənahgahı olan bir insanı öldürməyi necə cübran edəcəksiniz? Hər işdə və əməlinizdə ona pənah aparırdınız, o sizin qanunlarınızı icra edirdi, düşmənlərlə höcətləşədə sizə yol göstərirdi. O sizin böyüyünüz idi, şəriət hökmlərini ondan öyrənirdiniz. Ey camaat! Çox pis günaha batıb qiyamətiniz üçün çox pis zəxirə hazırlamısınız. Ölüm olsun sizə, məhv olasınız! Sizin səyləriniz daha fayda verməyəcək. Əlləriniz qırılsın. Özünüz üçün ziyanla dolu olan zərər yığmısınız. Dünya və axirət ziyanına düçar, ilahi əzaba layiqsiniz. Xarlıq və yoxsulluq sizə qələbə çaldı. Vay olsun sizə, ey Kufə camaatı! Heç bilirsinizmi ki, Allah Peyğəmbərinin hansı ciyərini parçalamısınız? Onun hansı qanını yerə tökmüsünüz? Peyğəmbərin hansı hörmətini tapdalamısınız? Və necə ismət hərəmlərini pərdəsiz çölə salıb, əsir etmisiniz? Ey camaat, böyük zülm, son dərəcədə çirkin bir işə əl atmısınız. Az qalır sizin bəd əməllərinizdən asimanlar yarılsın, yer parçalansın, dağlar uçsun. Sizin iyrənc işləriniz, rüsvayçı, yaramaz hərəkətləriniz yeri-göyü bürümüşdür. Göydən qan yağmasına təəccüb edirsinizmi? Amma bilin ki, axirət əzabınız ən

şiddətli tərzdə, xaredici və rüsvayedici olacaqdır. Heç kəs sizə kömək etməyəcək. Allahın sizə verdiyi bu möhlət əzabı heç də yüngülləşməyəcək. Çünki O, günahkarları cəzalandırmaqda heç vaxt tələsməz; O, intiqam vaxtının keçib getməsindən heç də qorxmur. Bilin ki, Allah günahkarların intizarındadır.(١)

Həzrət Zeynəb (əleyha-salam) əli ilə işarə etdikdə onlar yenidən sakit oldular. Onlar səslərini elə kəsdilər ki, sanki, nəfəslər sinələrdə həbs edilmişdi. Çoxları belə bir kütləni sakitləşdirməyə, səs-küyü yatırtmağa qadir deyildi, lakin Zeynəbin peyğəmbərcəsinə olan ilahi heybəti, onların dillərini qurutmuşdu. Sonra Həzrət Əlinin qızı özünün ildırım kimi gurultulu xütbəsini xatircəmliklə, sonsuz şücaət və vüqarla axıra yetirdi.

Həzrət Zeynəb (əleyha-salam) o böyük izdihamın içərisində, daha doğrusu, düşmən nizələrinin arasında Bəni Üməyyənin yaramaz əməllərini ifşa etməklə, onları əbədi rüsvay edib onlarda azacıq da olsa belə, izzət və şövkət qoymadı. Ravi deyir: Camaat pərişanlıq və peşmançılığın şiddətindən xəcalətli halda başlarını aşağı salıb hönkür-hönkür ağlayırdılar. Nübüvvət sülaləsinin, risalət mədəninin, behişt cavanlarının sərvərinin qətlə yetirilməsi kimi qara ləkəni özlərindən necə siləcəklərini bilmirdilər. Artıq iş-işdən keçmişdi; əbədi ziyankarlıq və ilahi qəzəbi özləri üçün satın almış, dünya rüsvayçılığını üzərlərində götürmüşdülər. Bəli, axirət əzabı daha çətin, daha üzücüdür. Əgər bunu bilsəydilər!



---

١- [١٣۵] Lühuf, səh.٩٠

## İMAM HÜSEYN (əleyhis–salam)–IN QIZI HƏZRƏT FATİMƏ (salamullahi əleyha)–NIN XÜTBƏSİ

### İMAM HÜSEYN (Ə)–IN QIZI HƏZRƏT FATİMƏ (Ə)–IN XÜTBƏSİ

Həzrət Zeynəb (əleyha-salam)-ın xütbəsindən sonra İmam Hüseyn (əleyhis-salam)-ın qızı Fatimə bir xütbə söyləyərək, kufəlilərin hiylərinin üstündən pərdələri götürdü. O xütbənin bir hissəsində belə deyilir: Ey Kufə camaatı! Ey hiyləgər hoqqabazlar! Bilin ki, Allah təbarək və təala bizi sizin, sizi isə bizim vasitəmizlə imtahan etdi. Bizim imtahanımızın nəticəsi çox yaxşı oldu–Allah bizə Öz lütfünü bağışladı. Lakin siz Allahın yer üzündəki höccətini, elm və hikmət xəzinəsini nahaq yerə şəhid etdiniz, Böyük Allah Öz Peyğəmbəri Həzrət Mühəmməd (səlləllahu əleyhi və alihi və səlləm)-in vasitəsi ilə bizim ailəmizə lütf etdi, bizi Öz məxluqlarından üstün etdi. Amma siz nankor camaat, bizi təkzib edib kafir oldunuz, qanımızı nahaq yerə axıtdınız, əmlakımızı qarət etdiniz, elə təsəvvür etdiniz ki biz qeyri-müsəlman övladıyıq. Siz bundan bir az qabaq cəddim Həzrət Əmirəl-möminin Əliyyibni Əbitalib (əleyhis-salam)-ni, dünən isə atam Hüseyni şəhid etdiniz. Qanımız sizin əllərinizdən damır ki bu damcılar da ürəklərinizdə bizə qarşı bəslədiyiniz keçmiş kin-küdurətdən irəli gəlmişdi. İndi gözləriniz aydın, qəlbləriniz şad olsun. Siz Allaha qarşı hiylə işlətdiniz, amma O, ən yaxşı tədbir tökəndir. Allah sizi öz cəzanıza çatdıracaq, Onun əzabının intizarında olun. Allah sizi bir-birinizin canına salacaq. Əlinizdən çıxanlara təəssüflənməyiniz faydasızdır. Baş verən hadisəyə şadlıq etməyiniz də səmərəsizdir. Əlləriniz kəsilsin, Allahın əzabının intizarında olun!

Bu dünyada bir-birinizin canına düşəcək, axirət əzabında da əbədi qalacaqsınız. Allah zülmkarlara lənət etsin. Ey kufəlilər, vay olsun sizə, heç bilirsinizmi ki, hansı əllərlə bizi vurdunuz? Hansı ayaqlarla bizə tərrəf gəldiniz? Heç bilirsinizmi ki, bizimlə necə döyüşə atıldınız? Allaha and olsun ki, qəlbləriniz rəhmsiz, ürəkləriniz daşdır. Allah qəlbinizə, qulaqlarınıza, gözlərinizə möhür vurmuş, şeytan sizin çirkin əməllərinizi gözünüzdə gözəl cilvələndirmiş, gözlərinizə pərdə çəkmişdir. Hidayət yolunu seçə bilmirsiniz. Ey Kufə əhli, əlləriniz kəsilsiin, görün risalət xanədanından nə qədər qanlar sizin boynunuzdadır! Siz Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in qardaşına-cəddim Əliyyibni Əbitalibə qarşı, onun övladlarına, pak ailəsinə qarşı nə cinayətlər !törətmədiniz

İmam Hüseyn (əleyhis-salam)-ın qızının sözləri elə bu minvalla davam etdi. Nəhayət camaat dedi:-Ey Peyğəmbər oğlunun qızı, daha bəsdir, qəlbimizi yandırdın, kökümüzü .odladın

Bu vaxt Ümmü-Gülsüm sözü xülasələşdirib dedi:-Üzünüz qara olsun, niyə İmam Hüseynə (əleyhis-salam) kömək etmədiniz? Niyə onu şəhid etdiniz? Niyə bizim mal-?dövlətimizi qarət, özümüzü isə əsir etdiniz? Niyə o pak qanları axıtdınız

## İMAM SƏCCAD (əleyhis-salam)-IN XÜTBƏSİ

Sonra İmam Zeynül Abidin (əleyhis-salam) camaata buyurdu ki, sakit olsunlar, hamı :dərhal sakitləşdi. Həzrət xütbəni başladı

Həmd olsun Allaha, salam olsun Peyğəmbər və onun Əhli-beytinə! Ey Kufə camaatı, hər kəs məni tanıyırsa heç, hər kəs tanımırsa, bilsin ki, mən Əliyyibni Hüseyn ibni Əliyyibni Əbitalibəm. Mən o kəsin oğluyam ki, Fəratın sahilində heç bir günahı olmadan, heç bir cinayət törətmədən başını kəsib mal-dövlətini qarət, əhl-əyalını əsir etdilər. Mən o kəsin oğluyam ki, işkəncələrlə şəhid edildi. Bu iftixar bizə bəsdir. Ey camaat, sizi Allaha and verirəm, deyin görüm siz atama məktub yazıb məkr və hiylə üzündən onunla peyman bağlayan, sonra isə onu qətlə yetirənlər deyilsinizmi? Ölüm olsun sizə ki, axirətinizin nameyi-əmalını pis hazırlamısınız. Əgər Peyğəmbər sizə desə ki, siz mənim oğlumu öldürdünüz, hörmətimi saxlamadınız və mənim ümmətim ?deyilsiniz, ona nə üzlə baxıb nə cavab verəcəksiniz

Həzrət Səccad (əleyhis-salam)-ın sözü bura çatanda, kufəlilər uca səslə ağlamağa başladılar, Həzrət buyurdu:–Allah rəhmət eləsin o kəsə ki, mənim Allah, Peyğəbər və Əhli-beyti barədə öyüd-nəsihətimi qəbul edir. Bizim getdiyimiz yol Peyğəmbərin .yoludur

Birdən kufəlilər hamılıqla haray çəkib dedilər ki, biz səninləyik Lakin Həzrət Səccad (əleyhis-salam) onlara cavab verdi:–Heyhat, heyhat, ey hiyləgərlər! Atamın başına gətirdiklərinizi mənim də başıma gətirmək istəyirsiniz? Heç vaxt! And olsun Allaha ki, bizim yaralarımız hələ sağalmamışdır. Atam dünən şəhid, əhli-əyalı isə bu gün əsir oldu. Bu, unudulası deyildir. Bütün varlığım yaralıdır. Xahişim budur ki, bizim nə .əleyhimizə, nə də xeyrimizə qiyam etməyəsiniz

## ƏHLİ–BEYT İBNİ ZİYADIN MƏCLİSİNDƏ

Əsirləri İbni Ziyadın məclisinə gətirdilər. O, fəthdən qürurlanıb sərməst halda, əlindəki çubuqla İmam Hüseyn (əleyhis-salam)-ın mübarək başına və dodaqlarına döyəcləyirdi. Zeyd ibni Ərqəm onun bu işinə kəskin etiraz edib, məclisdən çıxdı. Həzrət Zeynəbi Kübra tanınmaz halda məclisə daxil olub oradakı qadınlardan ayrıldı, kənizləri onu dövrəyə aldılar. Lakin nübüvvət cəlaləti, İmamət heybəti onun şərif vücudundan elə aşkar olurdu ki, İbni Ziyadı özünə cəlb etdi. O dedi:–Özünü bizdən gizlədib ?arvadlardan kənarda duran bu qadın kimdir

.Dedilər:–Əlinin qızıdır

O məlun qərara aldı ki, Zeynəbin (əleyha-salam) ürəyinə daha başqa bir yara vursun, .dedi:–Şükr olsun ki, Allah sizi rüsvay edib qılıncdan keçirərək həyatınızı bərbad etdi

Heydəri Kərrarın qızı burada o məlunla düşmüş kimi hərəkət etmədi; uşaqları qocaldan, başı fələklərə çatan, dağları qübarlı edən müsibətləri dilə gətirmədi; bundan böyük müsibət ola bilərdimi? –Qanına qəltan olmuş ailəsini, Kərbəla çölündə, bədən üzvləri tikə-tikə olmuş, kəfənsiz, qüslsüz bədənlərindən başqa bir şey gözə dəyməyən halda qoyub gəlmişdi. Öldürülənlərin başında əziz qardaşı, behişt cavanlarının sərvəri dururdu ki, öz qanı ilə qüsl olmuş, atların nalları bədənini doğram-doğram edərək özünə Kərbəlanın isti qumlarını kəfən biçmişdi. Ailəsinin, qardaşlarının ölümündən sonra qardaşının sınıq qəlbli övladını bir halda himayə etdi ki, arvadlar şivən qoparmış, uşaqlar əl-ətəş naləsini asimana ucaltmışdı. Amma Zeynəbin ümdə vəzifəsi İmam Səccad (əleyhis-salam)-ı himayə etmək idi. O Həzrət

xəstəliyin hərarətindən yanırdı, amma bu qızdırmaya baxmayaraq, kafirlər onun boynuna ağır zəncir vurmuşdular

Bu müsibətlərdən təkcə biri insanın qəlbini dağlayar, hətta qəzəblənmiş aslanı da belə acizliyə, süstlüyə düçar edərdi. Amma Əmr ibni Əbdüvəddi, Mərhəbi öldürən, Xeybər darvazasını yerindən qoparan Əli qızı xatircəmlik, yəqin dəryasının sahilinə yan aldı, ən nüfuzlu bəsirətdən bəhrələndi. O Həzrətin şənində təkcə bunu demək kifayətdir ki, elm və zəkası heç bir müəllim, alim tərəfindən almamış, əksinə, Allah tərəfindən ona .verilən ilahi bəxşişlərdən bəhrələnirdi

:İmam Səccad (əleyhis-salam) bu barədə buyurur

Ey əmmə, əlhəmdülillah sən təlim görməmiş bir alimə, dərrakəli bir insansan ki, bu .(dərrakəni bəşərin öyrəndiyi yolla öyrənməmisən (Yəni bunu Allah vermişdir

Məhz bu səbəbə körə də Zeynəbi Kübra bu ağır müsibətlərə baxmayaraq, atası Əmirəl-möminin (əleyhis-salam) kimi elə qüdrətli kəlamlar danışdı ki, qılıncdan iti olan bu kəlamlar ox kimi Übeydüllahın qəlbinə sancılırdı. Həzrət Zeynəb buyurdu:–Bunlar elə bir tayfa idilər ki, Allah şəhid olmağı onlar üçün yazmışdı. Onlar öz əbədi yerlərinə tələsdilər. Çox çəkməz ki, Allah onlarla səni bir yerə yığaraq, sizi (onların qarşısında) haqq-hesaba çəkər, onda görərsən qələbə kimin olacaqdır, ey Mərcanənin oğlu, anan !matəmində otursun

Bundan sonra İbni Ziyad İmam Səccad (əleyhis-salam)-ı məclisdə görüb soruşdu:–Bu ?cavan kimdir

.Dedilər:–Əliyyibni Hüseyndir

?İbni Ziyad dedi:–Məkər Allah Əliyyibni Hüseyni öldürmədimi

.İmam Səccad buyurdu:–Mənim Əli adlı böyük qardaşım var idi ki, camaat onu öldürdü

!İbni Ziyad dedi:–Yox, onu Allah öldürdü

İmam Səccad (əleyhis-salam) Zümər surəsinin ۴۲-cü ayəsini qiraət etdi: Allah əcəl .çatan vaxt canları alar

İbni Ziyad dedi:–Mənim hüzurumda hazırcavablıq edirsən? Əmr edərəm, boynunu !vurarlar

Zeynəb (əleyha-salam) bu sözü eşitcək dərhal buyurdu:–Ey ibni Ziyad, sən daha !bizdən heç kimi sağ qoymadın. Mənim də qətlimə hökm ver

İmam Səccad (əleyhis-salam) öz bibisini sakitləşdirib ibni Ziyada dedi:–Məni ölümlə hədələyirsən? Məgər bilmirsən ki, (Alah yolunda) öldürülmək bizim adətimizdir və (bizim əzəmətimiz şəhadətdədir?(۱)

**ÜBEYDULLAHIN KUFƏLİLƏR QARŞISINDAKI ÇIXIŞI**

Bu söhbətlərdən sonra ibni Ziyad əmr etdi ki, əsirləri məscidin yanındakı evə aparsınlar. Özü isə məscidə gedib camaata belə dedi:-Allaha şükür olsun ki, haqı aşkar etdi. Əmirəl-möminin Yezid və adamlarına kömək etdi, yalançını isə öz tərəfdarları ilə .birlikdə qətlə yetirdi

İbni Ziyadın sözü bura çatanda Əbdüllah Əfif adlı bir nəfər camaatın arasından qəzəblənib fəryad etdi:–Ey Mərcanənin oğlu, bu qədər həddi aşmısan ki, Rəsulullahın oğlunu şəhid edib ona nalayiq sözlər



---

Rovzətüs-səfa, ۳-cü cild, səh.۱۷۳[۱۳۶] -۱

deyirsən? Ey Allahın və Peyğəmbərin düşməni, yalan danışan sən və atandır. Səni əmr edənin özü və atası yalançıdır!

Əbdüllah elə həyəcanla fəryad çəkdi ki, ibni Ziyad naçar qalıb son dərəcə qorxu və iztirab içində minbərdən düşə-düşə bağırdı:–Ey məmurlar Əbdüllahı tutun! Ona aman verməyin, tez olun onu tutun!

Bir neçə nəfər muzdur ona tərəf yüyürdü, lakin onu tutmazdan əvvəl Əbdüllahın tayfası onu araya alaraq gizlətdilər.

### HƏZRƏT ZEYNƏBİN YÜKSƏK MƏQAMI

Əhməd ibni İbrahim deyir: İmam Cavad (əleyhis-salam)-ın qızı Həkimədən itaətləri vacib olan şəxslər barəsində soruşdum. O, İmamları bir-bir mənə saydı. Nəhayət Höccətibnil-Həsənə çatdı, onun da adını çəkdi. Ondan on ikinci İmamın harada olmasını xəbər aldım. Cavab verdi ki, qeyb aləmindədir.

Soruşdum:–Bəs onda şiələr kimə pənah aparsın?

Dedi:–Onun nənəsinə, İmam Həsən Əsgərinin anasına.

Dedim:–Mənə əmr edirsən ki, bir arvadı öz yerinə canişin qoyan bir adamı özümə İmam seçim?

Dedi:–Bu, İmam Hüseyn (əleyhis-salam) a iqtida etməkdir, zahirdə bacısı Zeynəbə vəsiyyət etdi. İmam Səccad (əleyhis-salam)-ın elmlərindən hasil olan hər şey Zeynəb (əleyha-salam)-ın dilindən idi, beləliklə İmamət işi gizli qaldı(١)



---

١- [١٣٧] Kəmalüd-din, səh.٢۵; Qeybət (Şeyx Tusi) səh.١۴٨

Elə bu dəqiq məsələyə görə də izzət və din yolunun şəhidi öz bacısını özü ilə yanaşı apardı, çünki, o Həzrət bilirdi ki, onun müqəddəs hədəfləri öz şəhadəti ilə, Bəni Üməyyənin səltənət hiyləsi ilə başqa cür olacaq; və əgər bacısının kəskin nitqləri olmasa, o şəhadətin həqiqəti məsx olunacaq (tərsinə yozulacaq), xüsusilə də Peyğəmbər ailəsi qılıncların, nizələrin mühasirəsində olan ağır vəziyyətdə Həzrət Zeynəb (əleyha-salam) qılıncdan da kəsərli olan bir nitq ilə İbn Ziyadın, Yezidin .cinayətləri üstündən pərdələri açdı, onları ifşa etdi

## ƏHLİ-BEYTİN DƏMƏŞQƏ GƏLMƏSİ

Əhli-beyt əsirləri Kufədə zindanda saxlanılırdı. Yezid ibni Ziyadın verdiyi xəbərin İmam Hüseyn (əleyhis-salam)-ın şəhadəti xəbərinin) cavabında yazdı ki, əsirləri Şama göndərin. İbni Ziyad başda Şimr ibni Zilcövşən olmaqla ۵ min nəfər hərbçini Dəməşqə göndərdi. O məlun İmam Səccad (əleyhis-salam)-ın boynuna zəncir vurub son dərdəcə qansızlıqla əsirləri Dəməşqə göndərdi. Axırda məlun Yezidin şadlıq, sevincləri altında şəhidlərin başlarını, ismət ailəsinin əsirlərini Dəməşqə daxil etdilər. Əhli-beytdən sağ qalanları və qadınları əl-ayaqları iplə bağlanmış halda Yezidin məclisinə gətirdilər. Həzrət Səccad (əleyhis-salam) üzünü Yezidə tutub buyurdu:-ey Yezid səni Allaha and verirəm, əgər Peyğəmbər bizi bu halda görsə, onda o Həzrətə nə cavab ?verərsən

.Yezid əmr etdi ki əsirlərin zənciləri və iplərini açsınlar

Sonra İmam Hüseyn (əleyhis-salam)-ın mübarək başını o məlunun qarşısına qoydular. Həzrət Zeynəbin gözü qardaşının kəsik başına sataşanda məclisdəkilərin hamısını (ağladan bir səslə(۱)

fəryad çəkdilər. Bundan sonra Yezid əlindəki çubuqla İmam Hüseyn (əleyhis-salam)-ın dodaqlarına, dişlərinə vururdu. Bu anda Əbu Bərzə Əsləmi onun bu işinə etiraz etdi. Yezid əsəbləşmiş halda əmr etdi ki, Rəsulullahın səhabələrindən olan o kişini çəkə-.çəkə məclisdən çıxarsınlar

Sonra isə Qüreyş kafirlərindən olan İbni Zəbəvinin Ücüd döyüşündə dediyi şerlərdən iki beyti oxudu, üç beyt də özündən artırdı, dedi:–Kaş Bədr döyüşündə qətlə yetişən tayfa başçılarım burda olub görəydilər ki Xəzrəc tayfası bizim qılınc zərbələrimizdən necə fəğana gəlmişlər. Yəqin ki, bu məzərəni gördükdə sevinclə qışqırıb deyərdilər ki ey Yezid, çox sağ ol! Biz Bəni Haşim böyüklərini öldürdük, onları Bədr döyüşünün hesabına yazdıq. Bu günkü gün elə o günün əvəzidir. Mən Xəndəf övladlarından !olmaram–əgər Əhmədin övladlarından onun işlərinin əvəzini çıxmasam



---

.Nasixüt-təvarix, ۳cü cild[۱۳۸] -۱

## (HƏZRƏT ZEYNƏB (ƏLEYHA SALAM)–IN XÜTBƏSİ (YEZİDİN MƏCLİSİ

Bu vaxt Bəni Haşimin zəkalı qadını Həzrət Zeynəb (əleyha salam) qəzəblənib yerindən qalxdı, atası Əli kimi yenidən sözə başladı: Həmd olsun aləmlərin Allahına, salam olsun Onun Peyğəmbəri və övlarlarına. Allah necə də gözəl buyurmuşdur: Pis iş görüb cinayətə mürtəkib olanların işlərinin aqibəti o yerə çatdı ki, Allahın ayələrini təkzib .edərək məsxərəyə qoydular

Ey Yezid elə fikirləşirsən ki, yeri-göyü bizə darısqal edərək bizi əsir kimi çəkib gətirdin, biz də Allahın yanında xar, sən isə əzəmətli oldun? Güman etdin ki, bu hadisələr sənin uca məqamının bəhrəsi idi? Elə buna görə də öyünüb sevinirsən ki, öz dünyanı abad !etmiş, işlərin də sənin istədiyin kimidir? Sus

Dayan! Məgər Allahın buyurduğunu küfr yoluna gedənlər güman etməsinlər ki, onlara verdiyimiz bir neçə günlük möhlət onların səadətləri üçün bir müqəddimədir! Yox, (verilən) bu fürsətlər onların günahlarının çoxalması, üçündür və xaredici əzab onlar ?üçün hazırdır. yaddan çıxarmısanmı

Ey azad olunmuşların oğlu! Bu insaf, ya ədalətdəndir ki, öz arvadlarını, kənizlərinə sığınacaq vermisən, Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) qızlarını isə açıq üzlə pərdəsiz, düşmənləri ilə birlikdə şəhərbəşəhər gəzdirirsən, ta ki camaat onların görüb hamı, eləcə də şərafətli-alçaq onlara baxsın, bir halda ki, onları himayə edən kişilərdən heç biri sağ qalmamışdır! Pak insanların ciyərini çeynəyib sonra

yerə atan insanlardan, əti-qanı şəhidlərin qanından göyərən adamlardan necə rəhm ?gözləmək olar

Ey Yezid, sən bacardığını et, öz hiylə və məkrlərini işə sal bu işdə son dərəcə səy göstər. Amma Allaha and olsun ki, heç vaxt bizim adımızı məhv edə bilməyəcək, bizim .vəhy nurumuzu söndürməyə nail olmayacaqsan

Ey Yezid, sənin ağlın nə qədər azdır, həyatın nə qədər çirkin, tifaqın necə də pərakəndədir! Bir gün gəlib çatacaq, nida edən səslənib deyəcək ki, Allah zülmkarlara .lənət etsin

Yezid şadlıq məclisində çubuqla İmam Hüseyn(əleyhis-salam)-ın mübarək dodaqlarına necə vururdu, halbuki, o həzrətin şərif simasından müqəddəs nurlar süzülür, mübarək başından behiştin iyi duyulurdu. O Həzrət kəsik başla belə özünün əsir olmuş əhli-beytindən nigaran idi, Roma səfirinin bu böyük cinayəti müşahidə edəndə bu çirkin əmələ etiraz etdiyi zaman Yezid onun qətlinə hökm verdi, bu vaxt (kəsik başdan səs gəldi.(١

## YEZİDİN MƏCLİSİNDƏ İMAM SƏCCAD (ƏLEYHİS-SALAM)-IN SÖYLƏDİYİ XİTABƏ

Yezidin əmri ilə Əhli-beyt əsirlərini zindana saldılar, Həzrət Səccadı isə özü ilə məscidə apardı. Cümə günü idi. Məscid camaatla dolmuşdu. Yezid minbərə xətib çıxardaraq onun istədiklərinin hamısını danışdı; İmam Hüseyn və Əli (əleyhiməs-salam)-a nalayiq sözlər söylədi, Yezidi və onun atasını isə təriflədi. Gözlənilmədən məclisdən uca bir səs



---

Məqtəlül-Hüseyn, səh.١٥[١٣٩] -١

eşidildi, bu səs camaatın sükutunu pozub xətibin səsini kəsdi. Bu səs İmam Səccad (əleyhissalam)-ın səsi idi. Ey xətib, vay olsun sənə! Məxluqun razılığını Allahın qəzəbi !müqabilində əldə etmək istəyirsən? Elə indi öz yerini cəhənnəmdə hazır gör

Xətib özünü itirdi, səsini kəsdi və bir daha danışmayıb minbərdən aşağı düşdü. Bu halda İmam Səccad (əleyhis-salam) Yezidə dedi:–İcazə verirsənmi bu çubuqların üstünə çıxıb bir az danışam? Elə söz danışacağam ki, Allahı razı salsın, camaat üçün .əcri olsun

Yezid icazə vermədi. O, imamı tanıyırdı və bilirdi ki, o Hüseynin oğlu, Əli balasıdır! Yezidin icazə verməməsi camaatda İmamı müdafiə etmək ruhiyyəsi yaratdı. Yeziə .dedilər ki, bu işə razılıq versin

Yezid dedi:–Əgər bu əsir minbərə çıxsa məni və nəslimi rüsvay etməyincə aşağı düşməz. Camaat bu sözləri qəbul etməyib Məgər bu cavan əsirin nə qədər danışıq .qüvvəsi var ki, bu işi görə bilsin? deyə Yəzidi məzəmmət etməyə başladılar

Yezid dedi:–Siz onu tanımırsınız. Mən onu gözəl tanıyıram; o, südəmər vaxtından elm-biliklə məşğuldur. Camaat bir daha israr etdikdə Yezid onların qarşısında davam gətirə bilmədi, nəhayət İmam Səccad (əleyhis-salam) minbərə çıxıb buyurdu:–Əzəli və əbədi olub başlanğıcı olmayan Allaha həmd olsun. O, hər şeydən əvvəl var idi, hər şeydən sonra da olacaq məxluq fani olandan sonra təkcə O qalacaqdır, Ey camaat, Allah bizə çoxlu nemət-helm və səbir, səxavət və alicənablıq, fəsahət və natiqlik, şücaət və igidlik əta etmiş, möminlərin qəlblərini bizim ailəmizin məhəbbət ocağı sanmışdır. Ey camaat! Rəsulullah (səlləllahu əleyhi və alihi və səlləm) bizim ailəmizdəndir, onun canişini bizim

ailəmizdəndir Seyyidüş-şühəda Həmzə, Cəfəri Təyyar bizim ailəmizdəndir. Behişt cavanlarının iki sərvəri bizim ailəmizdəndir. Bu ümmətin İmam Qaimi bizim ailəmizdəndir. Ey camaat! Məni tanıyanlar tanıyıb, tanımayanlara isə özümü tanıtdırıram. Mən Məkkə və Minanın oğluyam. Mən Zəmzəm və Səfanın oğluyam, mənim atam həcərül-əsvədi əba ilə götürüb Kəbəyə qoyub. Mən o kəsin oğluyam ki, indiyə kimi ehram paltarını geymiş, həccə getmiş, Səfa-Mərva əməllərini yerinə yetirmişdir. Mən o kəsin oluyam ki, gecə ikən Məkkədən Məscidül-əqsaya, oradan da Meraca gedib Sidrətül-müntəhaya çatdı, O, Allaha ən yaxın adam idi. Mən o kəsin oğluyam ki, Allah tərəfindin ona vəhy nazil olurdu. Mən Mühəmməd-Müstəfanın oluyam, mən Xədiceyi-Kübranın oğluyam, mən Əliyyi-Mürtəzanın oğluyam, mən Ftimeyi-Zəhranın oğluyam, mən Sidrətül-müntəhanın oğluyam mən Tuba ağacının ...!oğluyam, mən Kərbəla şəhidi Hüseynin oğluyam

İmam Səccadın sözləri buraya çatanda camaatın naləsi, ah-fəğanı yüksəldi, gözlərindən yaş axmağa başladı. Yezid çox narahat oldu, qorxuya düşdü. Müəzzinə əmr etdi ki, azan versin. Müəzzin azana başladı. Allahu Əkbər–İmam Səccad (əleyhis-.salam) buyurdu:-Allah hər şeydən böyük, hər şeydən əzəmətlidir

Müəzzin dedi: Əşhədü ənla ilahə illəllah

İmam Səccad (əleyhis-salam) buyurdu:-Şəhadət verirəm ki, Allahdan başqa heç bir .məbud yoxdur

.Müəzzin dedi:-Əşhədu ənnə Mühəmmədər-rəsulullah

İmam Səccad (əleyhis-salam) belə bir fürsəti gözləyirdi, başından əmmaməni götürüb –:fəryad etdi

Ey müəzzin, səni and verirəm Müəhmmədə, bir anlığa sakit ol. (sonra üzünü Yezidə tutub dedi:) Bu Mühəmməd, bu əziz Peyğəmbər sənin cəddindir, yoxsa mənim? Əgər desən ki, öz cəddindir, hamı bilər ki, yalan deyirsən. Yox əgər desən ki sənin cəddindir, ?onda bəs atamı niyə öldürdün? Niyə əmlakını qarət etdin? Niyə əhli-əyalını əsir etdin

Bu vaxt İmam Səccad (əleyhis-salam) sinəsini açdı. Camaata xitabən buyurdu:–Yer üzündə məndən başqa bir kəsi tanıyırsınızmı ki, cəddi Rəsulullah olsun? Bəs nə üçün Yezid atamı öldürdü? Nə üçün bizi kafirlər kimi əsir etmişdir? (Sonra Yezidə üzünü tutaraq buyurdu:) Sən deyirsən Mühəmməd Allahın Rəsuludur. və istəyirsən ki, üzü qibləyə durub cümə namazı qılasan? Vay olsun sənə, Qiyamətin günündə atam, !cəddim sənin düşmənin olacaqdır

!Yezid fəryad çəkib dedi:-Müəzzin, azanı de

Şamda bu böyük faciənin-Rəsulullahın nəvəsi Hüseyn (əleyhis-salam)-ın qətli xəbəri aşkar olanda camaat dəhşətə gəldi, öz azğınçılıqlarından heyrətə daldılar. Məclislərində, yığıncaqlarında söhbət yalnız, bu misli görünməmiş ürəkyandıran .müsibət barəsində gedirdi

## ƏHLİ–BEYTİN KƏRBƏLAYA GƏLMƏSİ

İmam Səccad (əleyhis-salam) və Həzrət Zeynəbin (əleyha salam)-ın şamlıların içində söylədikləri xütbələrin təsiri elə güclü idi ki, axırda Yezid aşkar şəkildə Kərbəlada baş vermiş hadisədən peşmançılığını izhar edərək xalq kütlələri qarşısında səy etdi ki, özinə bəraət qazandırıb bu işin təqsirini

ibni Ziyadın boynuna atsın. Buna görə də əsirlərə icazə verdi ki, şəhidlərə matəm məclisi qursunlar. O, söz verdi ki, İmam Səccad (əleyhis-salam)-ın üç istəyini yerinə .yetirsin

Qarət olunmuş şeyləri, o cümlədən Həzrət Fatimə (əleyha salam)-ın öz əli ilə toxuduğu şeyləri ona qaytarsın. Bəzi rəvayətlərə görə, İmam Hüseyn (əleyhis-salam)-ın mübarək başına da Yeziddən aldı, Kərbəlaya aparıb o Həzrətin pak cənazəsinin .yanında dəfn etdi

Yezid Əhli-beytin Mədinəyə getməsi üçün lazım olan səfər vəsaitini hazırladı. Əhli-beyt Kərbəla yolundan Mədinəyə sarı yola düşdü. Bəzi rəvayətlərə görə ərbəin günü Kərbəlaya yetişdilər. Əhli-beyt Kərbəlada ziyarətə gələn Cabir ibni Əbdüllah Ənsari və Bəni-haşimdən bir dəstə ilə qarşılaşdı. Bir neçə gün şəhidlərə matəm saxladılar. Bu əzadarlıqlar ətraf məntəqələrdə çadırlarda yaşayan qəbilələrə çatdı. Onlar da .məatəmə qoşuldular

## ƏHLİ–BEYTİN MƏDİNƏYƏ DAXİL OLMASI

Ərbəin mərasimindən sonra Əhli-beyt karvanı Mədinəyə tərəf yola düşdü. Mədinəyə çatdıqda Həzrət Səccad (əleyhissalam) fərman verdi ki, şəhərin kənarında köç salsınlar ki, mədinəlilər xəbərdar olsunlar. İmam Səccad (əleyhissalam) Bəşir ibni Cəzləmə buyurdu ki, İmam Hüseyn (əleyhissalam)-ın şəhadət xəbərini camaata .çatdırsın

O həzrət necə yaxşı bir insanı bu iş üçün seçdi! Bəşir ata minib sürətlə şəhərə daxil oldu, camaatı birbaşa Məscidün-nəbiyə çağırdı. Orada çoxlu adam

yığışmışdı. Bəşir ağlamağa başladı, uca səslə şer deməklə İmam Hüseyn (əleyhis-salam)-ın şəhadət xəbərini onlara çatdırdı. O, Mədinəlilərə dedi:

Ey əhli-Mədinə! Daha sizin üçün Mədinədə qalmağa yer yoxdur. Çünki İmam Hüseyn (əleyhis-salam) qətlə yetirildi, buna görə də ürəyim qan ağlayır. Onun bədəni Kərbəlada qana qəltan olmuşdur və müqəddəs başını nizədə şəhərbəşəhər gəzdirdilər.

Bəşirin sözləri bura çatdıqda, camaat başlarına-vurur, Vay Hüseyn, Vay Hüseyn, vay məzlum!–deyə ağlaşırdılar. Bir neçə nəfər Bəşirin ətrafına yığışıb soruşdular:–Bəs ismət və təharət Əhli-beyti indi haradadır?

Bəşir dedi:–Əhli-beytin sağ qalanları şəhərin kənarındadır. Ey Mədinə əhli, indi İmam Səccad (əleyhissalam) bibiləri, bacıları ilə birlikdə sizin yaxınlığınızda, şəhərin kənarında çadır qurmuş, məni sizin yanınıza göndərmişdir ki, şəhər əhalisini baş vermiş hadisədən agah edim. Gedək onları sizə göstərim.

Camaatın ah-nalə, şivən səsləri göylərə ucalırdı. Qadınlar başlarına, üzlərinə vurub deyirdilər: Ey müsibətlər anası! Ey Zeynəb! Ey Əlinin qızı, sənin üçün ciyərlər dağlandı. Ey səbir və müqavimət dağı, ey Zeynəbi Kübra! Sənin çəkdiyin müsibətlər nə qədər ağır, necə də böyükdür!

## İMAM SƏCCAD (əleyhis–salam)–IN MƏDİNƏ ƏHALİSİNƏ SÖYLƏDİYİ XÜTBƏ

Mədinə əhalisi Həzrət Zeynəbin, Həzrət Səccad (əleyhis-salam)-ın ətrafına yığışıb .şivənlə, ah-nalə ilə başsağlığı verməyə başladılar

İmam Səccad (əleyhis-salam) özünün (camaata) yolgöstərmə vəzifəsinə əməl edərək gələcək hərəkət tərzini təyin etmək üçün əli ilə işarə edib camaatı sakitləşdirdi. Hamı hörmət əlaməti olaraq sakit oldu. Həzrət Allaha həmd etdikdən sonra buyurdu: Allaha şükür edirik–həyatın çətinlik və giriftarlıqlarında, dərdli bəla, qəm-qüssəli hadisə, böyük və ağır, qəmli müsibətlərdə! Ey camaat, Allaha şükür olsun ki, bizi böyük müsibətlərlə imtahan etdi. İndi İslamda Əba Əbdillah Hüseyn (əleyhis-salam) və onun itrətinin öldürülməsi, o cənabın ailəsinin əsir edilməsi kimi ağır itki baş vermişdir. O Həzrətin müqəddəs başını nizə başında şəhərbəşəhər diyarbadiyar gəzdirdilər. Bu, misli görünməyən bir faciədir. Ey camaat, sizdən hansı birisi Hüseyn (əleyhis-salam)-ın şəhadətindən sonra şad olacaqdır? Hansı qəlb ona görə qəmgin olmaz? Hansı göz yaş axıtmadan çəkinər? Halbuki, atamın şəhadətində asimanlar ağladı, dəryalar öz dalğaları ilə ona matəm tutdular. Asimanların, yerin fəryadı ucaldı, ağacların şaxələri, dəryadakı balıqlar, müqərrəb mələklər və bütün səma əhli bu müsibətdən cuşa gəlib qəmgin oldu. Ey Mədinə əhli, hansı qəlb Hüseyn (əleyhis-salam)-ın qətlindən təsirlənmədi? Görəsən, hansı qulağın İslamdakı bu itkini eşitməyə taqəti vardır? Ey camaat, bizi pərakəndə edib şəhərbəşəhər dolandıraraq öz şəhər və diyarımızdan elə uzaqlaşdırdılar ki, guya biz Türküstan, yaxud Kabul əhli idik. Günah və təqsirimiz olmadan bu qədər zülmü bizə rəva gördülər; elə bir zülm ki, bunu heç öz əcdadlarımızdan belə eşitməmişdik. Allaha and olsun, əgər Peyğəmbər (səlləllahu (əleyhi və alihi və səlləm

bizi onlara sifariş etmək yerinə, öldürmələrini əmr etsəydi, bizim barəmizdə rəva gördükləri bu zülm və sitəmdən artıq bir iş görə bilməzdilər. Bu müsibət necə ürəkyandıran, acı və çətindir. Biz bu müsibətlə imtahan olunduq! Allah onların bizə qarşı etdikləri bu qədər zülmün hesabına yetişəcəkdir. Çünki intiqam alan və qüdrətli .yalnız Odur

Bu xütbədən sonra Əhli-beyt (əleyhimüs-salam) karvanı Mədinə camaatının nalə və şivən sədaları altında şəhərə daxil oldu. Əhli-beytin gözü Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm)-in qəbrinə sataşanda, nalələr daha da ucaldı. Va Cəddah! Va Mühəmməda! Ya Rəsuləllah, sənin gözlərinin nuru Hüseyni susuz öldürdülər, sənin Əhli-beytini romalı əsirlər kimi şəhərbəşəhər, şəhidlərin kəsik başları ilə birlikdə .dolandırdılar

Həzrət Zeynəb (əleyha-salam) Peyğəmbər (səlləllahu əleyhi və alihi və səlləm) :məscidinə çatıb qapının dəstəyindən tutdu və dedi

!Ey mənim əziz cəddim, Hüseyn (əleyhis-salam)-ın şəhadət xəbərini sənə gətirmişəm

## KİTABDA İSTİFADƏ OLUNMUŞ ƏDƏBİYYAT


١. İsbatül-vəsiyyət (Məsudi)

٢. Ehticac (təbərsi)

٣. Əxbarüt-tüvval, (Dinəvəri)

۴. İrşad (Şeyx Müfid)

۵. Əsrarüş-şəhadət

۶. Əl-isabət ibni Həcər

٧. Üsuli Kafi (Kuleyni)

٨. Əyanüş-şiə (٧-ci cild)

٩. Əğani (Əbülfərəc İsfəhani)

(Əl-imamətü vəs-siyasət (İbni Qüteybə Dinəvəri .١٠

(Əlbidayətü vən-nihayə ٩-cu cild (İbni Kəsir .١١

(Əmali (Şeyx Səduq .١٢

Ənvarün-nömaniyyə .١٣

(Biharul-ənvar, ١٠-cu cild, səh.٤٥-٥٢ (Əllamə Məclisi .١۴

Tarixi-ibnil-Fəda c ١ .١٥

Tarixi ibni Əsəm .١۶

Tarixi ibni Əsakir .١٧

.Tarixi Təbəri ۴-۶-cı cildlər .١٨

.Tarixi Yəqubi ٢-ci cild .١٩

Təzkirətül-əimmə .٢٠

(Təzkirətül-xəvas (Sibt ibni Cövzi .٢١

Təzəllümüz-Zəhra .٢٢

Təhzibül-Əsma vəl-lüğat .٢٣

(Cəlaül-üyun (Əllamə Məclisi .٢۴

(Xəraic (Ravəndi .٢٥

(Darüs-salam (Nuri .٢۶

Zəxirətüd-dareyn .٢٧

Ricali Kəşi .٢٨

Ricali-Nəcaşi .٢٩

.Rövzətüs-səfa ۳-cü cild .۳۰

Rövzətül vaizin .۳۱

Riyazül-məsaib .۳۲

Hücr ibni Ədinin həyatı .۳۳

Sirrüs-silsilətil-Ələviyyə .۳۴

Sərdari-Kərbəla .۳۵

Şərhi Şərişi .۳۶

(Nəhcül bəlağənin şərhi, ۳-cü cild (İbni Əbil Hədid .۳۷

Sülhül-Həsən .۳۸

(İləlüş-Şəraye (Şeyx Səduq .۳۹

İqdüd-dürər .۴۰

(Qeybət (Şeyx Tusi .۴۱

(Kamil (Şeyx Bəhai .۴۲

.Kamil (İbni Əsir) ۳-۴-cü cildlər .۴۳

(Kamilüz-zayarət (İbni Quləveyh .۴۴

Kibriti-Əhmər c ۱ .۴۵

Kəmalüd-din .۴۶

(Lühuf (Seyyid ibni Tavus .۴۷

(Məsirül-əhzan (İbni Nəma .۴۸

Mədinətül-məaciz .۴۹

(Mürucuz-zəhəb ۲-ci cild (Məsudi .۵۰

Müstədrəkül-vəsail, ۳-cü cild .۵۱

(Mişkatül-ənvar (Təbərsi .۵۲

Müstətrəf .۵۳

Miabilü-Kəfəmi .۵۴

(Məqtəl (Məhəmməd ibni Əbitalib .۵۶

Məqtəlül-Hüseyn .۵۷

Məqtəlül-əvalim .۵۸

(Məlahim və fitən (Seyyid ibni Tavus .۵۹

(Mənaqib ۲-ci cild (İbni Şəhraşub .۶۰

(Müntəxəb (İbni Cərir .۶۱

Nasixüt-təvarix ۳-cü cild .۶۲

(Müntəxəb (Tureyhi .۶۳

(Nəfəsül-məhmum (Şeyx Abbas Qumi .۶۴

.Nəhcül-bəlağə .۶۵

səh:۲۶۰

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər surəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik


:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

